**SALİK ORDUBADİ**

# «GÜLŞƏNİ - VƏHDƏT»
# DİVAN

2 cilddə

I cild

**Naxçıvan - 2010**

***Naxçıvan MR Ali Məclisinin***
***«____» ___________ 2010-cu il***
***tarixli  qərarı ilə çap olunur.***

Tərtibçi və çapa hazırlayanı, ön sözün müəllifi:
**Əsgər Qədimov,** filologiya elmləri doktoru.

Elmi redaktor: **Möhsün Nağısoylu,**
*filologiya elmləri doktoru.*

Rəyçilər: **İsa Həbibbəyli,**
*AMEA-nın həqiqi üzvü.*
**Hüseyn Həşimli,**
*filologiya elmləri namizədi,*
*dosent, əməkdar elm xadimi.*

**Salik Ordubadi.  «Gülşəni – vəhdət» . Divan.**
**Naxçıvan, «Əcəmi» nəşriyyatı, 2010. 248 səh.**

Naxçıvan Dövlət Universitetinin «Azərbaycan ədəbiyyatı» kafedrasının müdiri, filologiya elmləri doktoru Əsgər Nadir oğlu Qədimovun çapa hazırladığı Salik Ordubadinin «Gülşəni-vəhdət» divanı Azərbaycanda ilk dəfədir çap olunur. Əsgər Qədimov 2001-ci ildə Salik Ordubadinin külliyyatını əski əlifba ilə Təbrizdə nəşr etdirmişdir. «Divani - Salik Ordubadi» adlı həmin divanda Salikin Azərbaycan və fars dillərində olan bütöv ədəbi irsi çap olunmuşdur.

Oxuculara təqdim olunan bu divanda Salik  Ordubadinin yalnız Azərbaycan türkcəsində qələmə  aldığı  əsərləri verilmişdir.

4700000000
053-2010

# BƏLƏDÇİ

# XIX ƏSR ORDUBAD ƏDƏBİ MÜHİTİ VƏ MƏHƏMMƏDQULU SALİK ORDUBADİ

Ədəbi irsini oxucularımıza təqdim etdiyimiz Məhəmmədqulu Əbdülhüseyn oğlu Salik XIX əsr Ordubad ədəbi mühitinin yetişdirdiyi görkəmli simalardan biridir. Şairin yaradıcılıq yolu Ordubad ədəbi mühiti ilə bağlı olduğundan ilk öncə hörmətli oxucularımızı XIX əsr Ordubad ədəbi mühitinin ümumi mənzərəsi ilə tanış etməyimiz yerinə düşər.

XIX əsr Ordubad ədəbi mühiti o dövrdə Ordubad və Naxçıvanda yazıb yaradan Hacı Mirzə Ağarəhim Qüdsi Vənəndi, Hacağa Fəqir Ordubadi, Möhtərəm Ordubadi, Məhəmmədqulu Salik Ordubadi, Mirzə Əfsər Abdulla Ordubadi, Əhməd Ağa Şəmi, Məhəmməd Tağı Sidqi, Usta Zeynalabdin Nəqqaş, Məşədi Həsən Dəbbağ, Məşədi Möhsün Saətsaz, Ağarəsul Əttar, Kəblə Əliqulu Müznib, Hacı Molla Hüseyn Bikəs, Aslanxan Gövhər, Məhəmməd Təqi Culfayi, Mirzə Mehdi Naxçıvani və Hüseyn Nadim Naxçıvani kimi istedadlı sənətkarların adı ilə bağlıdır.

Məlumdur ki, XIX əsrdə Azərbaycanın bir sıra ərazilərində ədəbi məclislər fəaliyyət göstərirdilər. Qarabağda (Şuşada) «Məclisi-üns» (1864-1897), «Məclisi- fəramuşan» (1872-ci ildən XX əsrin əvvəllərinədək), Gəncədə və Tiflisdə «Divani-hikmət» (1820-1830-cu illərdən 1882-ci ilədək), Qubada «Gülüstan» (1835-cu ildən əsrin sonlarınadək), Lənkəranda «Fövcül-füsəha» (1850-1900), Şamaxıda «Beytüs-səfa» (1867 -1892), Bakıda «Məcməüş-şüəra» (XIX əsrin 80-cu illərindən 1915-cu ilədək) adları ilə tanınan ədəbi məclislər XIX əsrdə Azərbaycan ədəbi mühitinin təmsilçilərindən idilər. Belə məclislərdən biri də «Əncüməni-şüəra» adı ilə Ordubadda təşkil edilmişdi. Yuxarıda adları çəkilən şairlərin əksəriyyəti «Əncüməni-şüəra» ədəbi məclisinin fəal üzvləri idilər.

«Əncüməni-şüəra» ədəbi məclisi 1831-cu ildə Ordubadda Şeyxəli xan Kəngərli tərəfindən yaradılmışdır. Mərhum alimlərimizdən Feyzulla Qasımzadənin və Nəsrəddin Qarayevin elmi tədqiqatlarında Şeyxəli xan Kəngərlinin adı məclisin təşkilatçısı kimi Şıxəli Naib şəklində qeyd olunmuş, onun kimliyi haqqında məlumat verilməmişdir. Tədqiqatlar göstərir ki, həmin şəxs Naxçıvanın o zamankı hakimlərindən olan məşhur I Kalbalı xan Kəngərlinin ortancıl oğlu Şeyxəli xan Kəngərlidir. Naib isə onun adı yox, vəzifəsidir. Çünki XIX əsrin əvvəllərindən başlayaraq Şeyxəli xan İranın Qacar şahənşahlığı tərəfindən Ordubada naib (canişin) təyin olunmuş və şeirə-sənətə maraq göstərdiyi üçün Ordubadda «Əncüməni-şüəra» adlı ədəbi məclis yaradaraq Naib adı ilə tanınmışdır. Təsadüfi deyildir ki, XIX əsrin tanınmış şairlərindən olan Əndəlib Qaracadaği özünün «Ordubadın vəsfi» adlı müxəmməsində Ordubadın və onun Əylis kimi səfalı kəndlərinin tərənnümü ilə yanaşı, Şeyxəli xan Kəngərlini də oranın hakimi olaraq yad etmiş, onun səxavət və şücaətindən danışmışdır:

Ordubadın, nə deyim, vəsfi gülüstanə dəyər,
Bir əcəb guşədi ki, cənnətii-Rizvanə dəyər,
Hər dəm Əylis səfəri Hindu Sifahanə dəyər,
Eylə şahidləri var hüriyü qılmanə dəyər,
Müxtəsər, abü havası bütün İranə dəyər.

Hakimi Şeyxəli xan – kani - səxavət, nə deyim,
Yoxdu Kəngərli kimi mərdi-şücaət, nə deyim,
Görmədim bir belə sultani-ədalət, nə deyim,
Sahibi-təblü ələm, özgə qiyamət, nə deyim,
Çıxsa cəng eyləməyə, Nadiri-dövranə dəyər.[1]

Çox güman ki, Əndəlib Qaracadağinin Ordubada gəlişi vaxtlarında Şeyxəli xan Kəngərlinin təşkil etdiyi «Əncüməni-şüəra» ədəbi məclisi fəaliyyətdə olmuşdur.

Bu dövrdə məclisin fəal üzvlərindən və ilk rəhbərlərindən olan Qüdsi Vənəndi (1773/74-1861/62) də farsca yazdığı bir məsnəvisində Şeyxəli xana rəğbət əlaməti olaraq onun Ordubaddakı iqamətgahını nəzmə çəkmiş və tərif etmişdir. «Qitə dər tərife emarəte Şeyxəli xan Kəngərlu, xoda biyamorzəd, enşaəllah» («Şeyxəli xan Kəngərlinin imarətinin tərifində qitə, allah bağışlasın, inşaallah») başlığı altında qələmə aldığı bu əsərini Qüdsi qitə adlandırmış, lakin onu məsnəvi formasında yazmışdır. Əsərdən məlum olur ki, Şeyxəli xan Kəngərli bu imarətini Qacar şa-

---

[1] Жянуб улдузлары. «Йазычы» няшриййаты, Бакы, 1984, сящ.152

hənşahlığının zamanında tikdirmişdir. Qüdsinin Ordubehişt adlandırdığı Ordubadda, Araz çayının sahilində, Kəmkuh (indiki Kəmki) və Kamtal dağlarının ətəyində yerləşən bu dəbdəbəli imarəti şair gülüstan səhnəsi, aşiqlərin ürəyinin açıldığı yer adlandıraraq onun hovuzunu zəmzəm çeşməsinə, fəvvarəsini isə gəlinlərin pərişan zülfünə bənzədir, Firdovsi və Ənvəriyə bənzər şairlərin bu imarətə mədhlər yazıb təriflədiklərini bildirirdi:

Şənidəm dər əqsaye Ordibeheşt,
Yeki qəsr çon xolde ənbərsereşt.
Bərəfraşt xane Sekəndərneşan,
Be əhde şəhənşahe sahebqeran.
Ze bəs bud qəsri əcəb delqoşa,
Fərəhbəxş, nozhətfəza, basəfa.
Həme şaeran əz xəvaso əvam,
Ço Firdovsiyo Ənvəri xoşkəlam.
Be mədhəş komeyte səna taxtənd,
Həme rayəte nəzm əfraxtənd…
Nəzər kon be səhne qolestane ma,
Be eşrətgəhe Şeyxəli xane ma.
Ke səhni be nozhət dele aşeqan,
Nəsime səhər bər dərəş paseban.
Çe hovzi, ze Zəmzəm bovəd saftər,
Bovəd abe an saf əz əşke tər.
Ço fəvvareha ab əfşan şəvəd,
Ço zolfe ərusan pərişan şəvəd.

Tərc.: Eşitdim ki, Ordubehiştin kənarında,
Bir qəsr var, ətirli behişt qəsri kimi.
Şahənşahi-sahibqiranın[1] zamanında,
İsgəndər şöhrətli xan ucaldıb.
Çünki dilgüşa bir qəsr idi,
Ürəkaçan, fərəhgətirən və səfalı.
Seçilmişlərdən və qara jamaatdan olan bütün şairləri
Firdovsi və Ənvəri kimi xoşsözlüdürlər.
Onun şəninə mədhlər yazdılar,
Hamısı nəzm bayrağını ucaltdılar…
Bizim gülüstanın səhnəsinə nəzər et,
Bizim Şeyxəli xanın işrətgahını gör.
Elə bir səhnə ki, aşiqlərin ürəyinin açıldığı yerdir,
Səhər nəsimi onun qapısının gözətçisidir.
Necə bir hovuz ki, Zəmzəm çeşməsindən təmizdir,
Onun suyu göz yaşından da safdır.
Fəvvarələr suyu səpəndə,
Gəlinlərin pərişan zülfünə bənzər.

Qüdsi əsərdə Şeyxəli xanın imarətini Boqratın təsvir etdiyi Yunanıstana, Kəmkuh və Kamtal dağlarının əzəmət və vüqarını isə Elbrus dağına qarşı qoyaraq Ordubadın füsunkar təbiətinin bu imarətə xoş rayihə verdiyini xüsusi vurğulayırdı:

Koja rəft Boqrate sahebhonər?
Məgər bud zin boqe quyi xəbər?
Əgər didi eşrətgəhe xan ra,
Əz dəftər belisid Yunan ra.

[1] Шащяншащи-сащибгиран – Шяргдя бюйцк щюкмдарлара верилян аддыр. Мифолоъи тясяввцря эюря Зющря вя Мцштяри улдузларынын бир бцрждя эюрцшдцкляри заман дцнйайа эялмиш хюшбяхт адам мянасындадыр.

Həme ğorfehayəş be rude Ərəs,
Bəraye təmaşa həmin hosn bəs…
Gəhi seyre Kəmkuho gəh movje rud,
Bərəd zənge qəm əz delo can ço rud.
Əgər didi Əlborz[1] Kəmkuh ra,
Şikəsti be del zovrəqe Nuh ra.
Şəmimi ke ayəd ze zolfe botan,
Ze Kəmtal ayəd, nə əz qolsetan.
Səba buye u ra be qolşən bərəd,
Dele ğonçe ra ətr əz u pərvərəd.

Tərc.: Sahibhünər Boqrat hara getdi?
Məgər bu qəsrdən xəbərdar idimi?
Əgər xanın işrətgahını görsə idi,
Yunanın adını kitabdan silərdi.
Bütün otaqları Araza baxır,
Bu gözəllik tamaşa üçün yetər…
Gah Kəmkuhun seyri, gah da çayın dalğaları,
Ürəkdən rud[2] kimi qəm parsını təmizlər.
Əgər Elbrus Kəmkuhu görsə idi,
Ürəkdə Nuhun gəmisini parçalardı.
Gözəllərin zülfündən gələn ətir iyi
Gülüstandan deyil, Kamtaldan gəlir.
Səba onun qoxusunu gülşənə aparır,
Qönçənin qəlbini o ətir açır.

Əsərin sonunda Qüdsi, Şeyxəli xanın imarətinin və onun var-dövlətinin əbədi yadigar qalajağını söyləyərək ona həmişə işrətli günlər keçirməsini və zəmanənin cövrü qəmindən azad olmasını arzulayır, özünə isə Allahdan mərhəmət və rəhmət diləyirdi:

Bovəd dovləte xane zul-eqtedar,
Dər in qəsre ali ço Jəm paydar.
Be eyşo be eşrət deləş şad bad,
Ze jovro ğəme dəhr azad bad.
Elahi, toi dər jəhan binəzir,
Ze rəhmət məkon dur ozrəm pəzir.
Be Qodsi nəzər kon ze rahe kərəm,
Bebəxşa qonahəş be “Nun vəlqələm”.

Tərc.: Qüdrətli xanın dövləti bu ali qəsrdə
Cəmşidin dövləti kimi həmişə qalandır.
Eyş-işrətlə ürəyi həmişə şad olsun,
Zəmanənin cövrü qəmindən azad olsun.
İlahi, dünyada sənin bərabərin yoxdur,
Məni rəhmətdən uzaq etmə, üzürxahlığımı qəbul et.
Qüdsiyə kərəm yolu ilə nəzər qıl,
Günahını “Nun vəlqələm”ə[1] bağışla.

İstər Əndəlib Qaracadağinin, istərsə də Qüdsi Vənəndinin şeirləri təsdiq edir ki, o zaman Şeyxəli xan Kəngərlinin həm Ordubadın canişini, həm də “Əncüməni-şüəra”nın təşkilatçısı kimi şairlər arasında xüsusi

---

[1] Ялборз – Елбрус даьы демякдир
2.Rud – Simli musiqi alətidir
[1].«Нун вялгялям» – Гуранын 68-жи «Нун вя йа Гялям» сурясидир. Бах: Гуран (Яряб дилиндян тяржцмя едянляр: Зийа Бцнйадов вя Васим Мяммядлийев). Азярняшр, Бакы, 1992, сящ. 583.

nüfuzu olmuşdur. Qüdsinin isə Şeyxəli xan Kəngərlinin imarətini bu cür dəbdəbəli bir şəkildə mədh etməsi belə bir ehtimal irəli sürməyə əsas verir ki, "Əncüməni-şüəra" ədəbi məclisi təşkil olunduğu ilk vaxtlarda Şeyxəli xanın bu iqamətgahında yerləşmişdir. Məclisin rəhbəri isə Qüdsi Vənəndi olmuşdur. Çünki 1831-cu ildə "Əncüməni-şüəra"nın təşkil olunduğu vaxt Hacıağa Fəqir Ordubadi (1836-1889) və M.T. Sidqi (1854-1903) hələ anadan olmamışdılar. Qüdsi Vənəndi isə o zaman yaşının kamillik dövrlərini keçirirdi və 57 yaşı var idi. Şübhəsiz ki, bu yaşlarında o, məclisə rəhbərlik edə bilərdi. XIX əsrin 60 - 80-cu illərində məclisə rəhbərlik edən Fəqir Ordubadi də Qüdsi Vənəndini şairlər içərisində ustad hesab etmiş və onun «Əlinə» rədifli qəzəlinə yazdığı eyni rədifli bənzətmə qəzəlində öz ehtiramını aşağıdakı beytlərdə ifadə etmişdir:

Qılsın əmani-nəzər mürşidi-ustadi-əzim -
Hacı Mirzayi-Rəhim, yetsə bu əfrad əlinə.
Duta gər nəzmi-kəlamında Fəqirin bir eyb,
Əfv qılsın onu kim, düşmüyüb ustad əlinə…[1]

1889-cu ildə Fəqirin vəfatından sonra "Əncüməni-şüəra" ədəbi məclisi öz fəaliyyətini görkəmli maarifçi, şair, nasir və publisist M.T.Sidqinin başçılığı ilə davam etdirmişdir. O zaman M.T.Sidqinin 35 yaşı var idi və gənc yaşlarından Fəqir tərəfindən məclisə cəlb edilmişdi. 1894-cü ildə M.T.Sidqi Naxçıvanda özünün yeni üsulda yaratdığı "Tərbiyə məktəbi" ilə əlaqədar olaraq Ordubadı tərk edərək Naxçıvana köçmüş və "Əncüməni-şüəra" onun rəhbərliyi ilə bir neçə il Naxçıvanda da fəaliyyət göstərmiş və 1903-cü ildə M.T.Sidqinin vəfatından sonra qapanmışdır.[2] Bu illərdə Mirzə Mehdi Naxçıvani, Məhəmməd Tağı Culfayi və Hüseyn Nadim Naxçıvani kimi şairlər də məclisdə iştirak etmişlər.

XIX əsr Ordubad ədəbi mühitinin nümayəndələri yaradıcılığa dini şeirlərlə başlamış və islam ideologiyasını təbliğ etmişlər. "Əncüməni-şüəra"nın Qüdsi Vənəndi, Fəqir Ordubadi, Hacı Molla Hüseyn Bikəs kimi üzvləri dini şeirlərində daha çox şiə məzhəbindən yazır, Kərbəla müsibətlərini nəzmə çəkirdilər. Qüdsi Vənəndi Kərbəla müsibətini bütün müsəlman aləminin facuəsi kimi səcuyyələndirərək şiələrə xitabən yazırdı:

Oldu əyan mahi-əza, şiələr,
Geydi cahan cümlə qəra, şiələr,
Ah, nə matəmdi hüveyda olub?
Başə vurar şahü gəda, şiələr!

Çərx qılıb jaməsini nilgun,
Nərgiz edib didəsini pür ze xun,
Olmuya, Abbas ələmin sərnigun
Xakə salıb əhli-cəfa, şiələr!

Çərxi-fələk rəxtin edib nilgun,
Qüdsiyi-biçarə tökər əşki-xun,
Matəmi-ləbtəşnə Hüseyndi bu gün,
Novhə qılın sübhü məsa, şiələr!

Qüdsi Vənəndinin dini əsərləri içərisində Həzrət Əli (Ə)-ma yazılmış qəsidə və novhələri xüsusi yer tuturdu. Bu əsərlərdə Həzrət Əli (Ə) islam dinini küfrdən təmizləyən, müsəlman aləminə həqiqi şəriət yolunu göstərən xilaskar və müdrik şiə imamı kimi səcuyyələndirilirdi:

Ey Zülfüqar sahibi, Düldül minən Əli!
Ey zəngi-küfrü din qılıjından silən Əli!
Mövludun oldu Beytdə Məkkə şərafəti,
Şəmşirin oldu aləmə yol göstərən, Əli!

Şairin "Cənabi-Fatimeyi-Zəhranın vəfat edən zaman ağlayaraq təvazökarlıqla Əli Əleyhüssəlamla mükaliməsi" adlı novhəsində də həzrət Əli (Ə)-ın şücaəti mədh olunurdu:

Qoydun əyağini ta duşi-Əhmədə,
Baş qoydu cümlə xəlq cəddim Məhəmmədə.

---

[1] Бах: Фягир Ордубади. Аьлар гялям ялимдя. «Йазычы», няшриййаты, Вакы, 1989, сящ. 82
[2] Бах:Поетик мяжлисляр (Топлайаны вя тяртиб едяни Нясряддин Гарайев) Йазычы» няшриййаты, Бакы, 1987, сящ. 50.

Yoxsa min il bu ev qalmışdı bütkədə,
Ey bami-Kəbədən bütlər salan Əli!

Şeirdə həzrəti-Fatimeyi-Zəhranın dili ilə həzrət Əli (Ə)-ın təkcə müsəlman dünyasında deyil, Avropa ölkələrində də böyük nüfuz qazanması, fransızların da onu ağıllı və müdrik imam kimi tanıması xüsusi vurğulanırdı:

Vəsfi-kəmalinə şahiddi "Həlәta",
Bəsdir şücaətin şərhində "Lafəta",
Əlqab olub sənə bir tək nə Mürtəza,
Söylər firəngilər həm "şəntiyan"[1] Əli!

Dini poeziyada Qüdsi Vənəndi də daxil olmaqla Ordubad ədəbi mühitinin Salik, Fəqir, Bikəs və Nəqqaş kimi nümayəndələri Kərbəla şəhidlərinin facuəsinin təsvirində lirik-sentimental üsluba üstünlük verir, imam Hüseynin, imam Həsənin, Əliəkbərin, Qasımın müsibətini qəmli səhnələrin fonunda təsvir edirdilər. Dərin kədər və qüssə ifadə edən bu cür dini şeirlər Fəqir Ordubadinin yaradıcılığında da üstünlük təşkil edirdi. Şairin həzrəti-imam Hüseynin dili ilə verilən bir novhəsində bədii ümumiləşdirmə yolu ilə Kərbəla şəhidlərinin qəmli aqibəti təsvir olunurdu:

Yəsribü Bətha sizinki, ey güruhi-əşqiya,
Yol verin getsin diyari-Rum ara Ali-Əba,
Əkbərin qanın sizə əfv eylərəm ruzi-cəza,
Qaziyi-divani-məşhər, şafeyi-üqba mənəm.
Doğranıbdı xəncər ilə cümlə yarü yavərim,
Qasimü Əbbasım öldü, getdi nakam Əkbərim,
Əsğərim oxlandı, qaldı qoltuğumda əllərim,
Bir qəribi-dərbədər, bir bikəsü tənha mənəm.
İçmişəm qalu bəladə mən şəhadət camını,
Lütf edəm ümmətlərə bəlkə şəfaət camını,
Nuş edib hər kəs Fəqirasa vilayət camını,
Şəkki yoxdur kim, ona məşhər günü mövla mənəm.

XIX əsr Ordubad şairlərinin dini poeziyasında Kərbəla müsibətinin acı səhnələri şəhid analarının və bacılarının dili ilə də nəzmə çəkilirdi. Hacı Molla Hüseyn Bikəsin dini şeirlərində həzrəti-Fatimeyi-Zəhra oğlu imam Hüseynə ağlayan dərdli ana kimi təsvir olunurdu:

Bikəs, açma bu sözün şərhin, əgər olsa tamam,
Od tutar aləm, yanar, qalmaz dəxi bir xasü am,
Kərbəla əhvalına Zəhra qan ağlar sübhü şam,
Neylədin oğlum Hüseyni, ey kərbəlayi Kərbəla?!

İlk yaradıcılığa dini şeirlərlə başlayan Ordubad şairləri sonrakı yaradıcılıq mərhələlərində klassik Şərq fəlsəfi lirikasına meyl etmiş, lirik şeirlərində Sədi, Hafiz, Xəyyam, Nəvai, Nizami və Füzuli kimi klassik şairlərin ədəbi mövqeyində dayanmışlar. "Əncüməni-şüəra"nın Fəqir, Qüdsi, Nəqqaş, Sidqi, Şəmi, Salik, Cani kimi üzvləri həm türk, həm də fars dilində yazırdılar. Məclisin farsca yazan üzvlərinin yaradıcılığında Sədinin, Hafiz və Xəyyamın güclü təsiri var idi. Fəqir Ordubadi irfani qəzəllərində Xəyyamanə üsluba söykənir, saqini, meyi, meyxanəni lirik şeirin əsas qayəsinə çevirirdi:

Saqi, canım sənə qurban, gətü peymanələri,
Rövşən et şəmi-şərab ilə bu kaşanələri.
Dəmbədəm lütf elə mey dəsti-nigarinündə,
Məst qıl çeşmi-xumarın kimi divanələri…

Lakin Fəqirin yaradıcılığı təkcə irfani qəzəllərlə məhdudlaşmırdı. Onun aşiqanə məzmunlu qəzəl və müxəmməslərində həyati eşqin təsvir və tərənnümünə də üstünlük verilirdi.

Allah, Allah, genə hardan belə mahparə gəlib?
Bənd olub zülfünə yüz min dili-biçarə, gəlib.

---

[1] Qentie homme (ъантийом) – франсызжа «аьыллы», «мцдрик адам» демякдир. Гцдси бу сюзц «шянтийан» шяклиндя ишлятмишдир.

Tuti göftarı edib bağdə bülbülləri lal,
Hansı sərvindü bu qumru ki, bu gülzarə gəlib?
Naxçıvan mülkünü ol şux urub bir-birinə,
Can alıb, içməyə qan bu büti-xunxarə gəlib…

"Əncüməni-şüəra"nın bir sıra üzvləri farsca şeirlərinin müəyyən bir qismini də Sədi və Hafiz kimi şairlərə nəzirə, bənzətmə və təzmin şəklində qələmə alırdılar. Məhəmməd Tağı Sidqi bəzən müasir mövzularda qələmə aldığı farsca əsərlərində Hafizin və Sədinin yaradıcılığına söykənir, onlara təxmislər yazırdı. Dövri mətbuata mədəni tərəqqinin əsas hərəkətvericu qüvvəsi kimi baxan Sidqi "Əxtər" qəzetinə yazdığı mənzum təbriknaməsini Sədi Şirazinin:

Əz hər çe boqzəri soxəne dust xoştər əst,
Peyğame aşina nəfəse ruhpərvər əst.

-beyti ilə başlayan qəzəlinə təxmis şəklində qələmə almışdır. Təxmisin üç misrası Sidqinin, son beyti isə Sədinindir. Lakin Sidqi bu klassik formaya istinad etsə də, özünün "Əxtər" qəzetinə olan təbrik fikirlərini Sədiyə təxmis şəklində demişdir:

Çizi ke dər jəhan ze həme çiz behtər əst,
Delbəndo delpəsəndo delavizo delbər əst.
An nosxeye geramiye mətbu «Əxtər» əst,
«Əz hər çe boqzəri soxəne dust xoştər əst,
Peyğame aşina nəfəse ruhpərvər əst».

M.T.Sidqi kimi şairlərin klassik poeziya ənənələrinə, xüsusən Sədi və Hafiz lirikasına istinad edərək mədəni tərəqqiyə xidmət edən yeni ictimai mətləbləri sənətə gətirmələri «Əncüməni-şüəra» ədəbi məclisinin nəzirəçilik məramında X1X əsr Ordubad ədəbi mühitinin təşəkkülünü realizmə istiqamətləndirən amillərdən idi. Məclisin fəal üzvlərindən olan Qüdsi Vənəndi irfani üslubda qələmə aldığı nəzirə və bənzətmələrində də bəzən Hafizin qəzəllərinə söykənirdi. O, Hafizin:

Ğolame nərgese məste to tajdaranənd,
Xərabe badeye ləle to huşyaranənd.[1]

-beyti ilə başlayan qəzəlinə bənzətmə yazmışdır. Lakin Qüdsi bu bənzətməsində klassik ənənədən kənara çıxaraq onu qəzəl formasında deyil, klassik fars poeziyasının «təzmin» şeir növlərindən olan mürəbbe-təxmis formasında qələmə almışdır. Belə ki, mürəbbe-təxmisin əvvəlki üç misrası Qüdsinin, dördüncü misra isə Hafizindir:

Əsire zolfe siyahe to qolezaranənd,
Qətile tiğe to məhzuno delfəkaranənd,
Fədaye çəşme xomare to ğəmqosaranənd,
"Xərabe badeye ləle to huşyaranənd".

XIX əsr Azərbaycan ədəbiyyatında bu yolla yaranan mürəbbe-təxmis forması, əsasən, yeni idi və farsca yazan Azərbaycan şairləri bu poetik formaya çox az müracuət etmişlər. Bu isə təsdiq edir ki, XIX əsr Ordubad ədəbi mühitinin Qüdsi və Sidqi kimi nümayəndələri poetik forma axtarışlarında yeniliyə meyl etmişlər. Təsadüfi deyildir ki, M.T.Sidqi yaradıcılığının yetkin çağlarında Hafizlə həmdəm olduğu vaxtları xatırlayaraq özünün qəzəlxanlıq dövrlərini keçmiş günlərin xatirəsi kimi yad edirdi:

Edib təfaül oxurdum qəzəl hüzurunda,
Lisani-Hafizi-Şiraz olduğum günlər.

Ordubad ədəbi mühitinin Əhməd Ağa Şəmi, Cani Ordubadi və Ağarəsul Əttar kimi nümayəndələri də öz yaradıcılıqlarında daha çox klassik lirika ənənələrinə söykənir, lirik şeirin kamil nümunələrini yaradırdılar. Əhməd Ağa Şəminin qəzəllərində ilahi eşqin tərənnümü ilə real həyati eşqin tərənnümü bədii vəhdətdə verilirdi:

Yar naz ilə ala canımı, minnətdi mana,
Dərgəhi-həqdə qəbul olsa, ibadətdi mana.
O qara zülf tutub könlümü zəncurə çəkib,

[1] Бах:Диване Щафез (Тяртиб вя тядгиг едяни Ябдцррящман Хялхали). Тещран, «Интишарате Щафезе новин», 4-жц чап, 1371 (милади –1992-жи ил), сящ.114, гязял № 131

Asa Mənsur kimi darə, səadətdi mana.
Qoysa zahid, edərəm Kəbeyi-kuyini təvaf,
Xaki-payin öpərəm, çünki səadətdi mana.
Nə işim vardı gedim Məşhədə, ya ki Nəjəfə,
Yarımın vəslini görjək o ziyarətdi mana.
İmtahan etmə məni, həzrəti-Musa deyiləm,
Başına mən dolanım, bu nə nəzakətdi mana?
Turi-Sinadı bura, nur təjəlla eləyib,
Gözlərim xiyrələnib, ruzi-qiyamətdi mana.
Şəmiyəm, şamü səhər ahilə suzandı işim,
Yazılıb ruzi-əzəldən o ki, qismətdi mana.

Ağarəsul Əttarın qəzəllərində isə didaktika və əxlaqi-nəsihətamiz fikirlər üstünlük təşkil edirdi. Şair müasirlərindən fərqli olaraq öz lirik qəhrəmanını zülfə, əbruyə, mücgana məftun olub yar yolunda ah-nalə etməməyə, həyatda ayıq və huşyar olmağa, mərdanə ömür keçirməyə çağırırdı.

Şairin ictimai-estetik məramına görə hər bir insan həyatda yüksək mənəvi idealla yaşamalı, öz qüvvəsi ilə qürrələnməməli, hünərini xeyirxahlığa sərf edib mərdanə ömür sürməlidir:

Bəsdir, könül, əbru sözü, şəmşir ilə oyna,
Mücgan nədir, ey qəddi kəman, tir ilə oyna.
Fəttan gözə ahu kimi heyran nə baxarsan,
Səyyad kimi daimi nəxcur ilə oyna.
Tutma səri-zülfün o xətadidə pərinin,
Məcnun kimi az həlqeyi-zəncur ilə oyna.
Qarqu atı at bir yana, ətfalə qoşulma,
Məşq isə qərəz, bəxti-jəvan pir ilə oyna.
Rubəhsifət ədayə qəvi pənjən uzatma,
Ey mərd, dilavər arayıb şir ilə oyna.
Bu şərtlə çox olmayasan zoruna məğrur,
Gər yüz hünərin olsa da, tədbir ilə oyna.
Əttar sözün guşinə al, huş ilə dinlə,
Dərk et əsərin, sonra o təsir ilə oyna.[1]

Şübhəsiz ki, Əttarın lirikasında olan bu didaktika orta əsr islam maarifçiliyindən irəli gəlir və XIX əsr Ordubad ədəbi mühitində lirikada ədəbi və ictimai tənqidin başlanğıjının ilkin mərhələsinin xüsusiyyətlərini özündə əks etdirirdi. Lirikada olan bu didaktika sonralar ədəbi mühitdə ictimai tənqidin və satiranın yaranması ilə nətijələndi.

Qüdsi Vənəndinin aşiqanə qəzəllərində lirik qəhrəman kimi yaratdığı aşiq surəti özünün məşuqəyə olan estetik münasibəti ilə Fəqir, Salik, Nəqqaş, Sidqi, Şəmi və Cani Ordubadi kimi şairlərin aşiq obrazlarından fərqlənirdi[2]. Belə ki, Qüdsinin lirik qəhrəmanı digər aşiq obrazları kimi estetik gözəllik anlayışına münasibətdə ətalətpərəst olub sevgilisinin sitəmkarlığı qarşısında mütilik mövqeyində dayanmır. O, ağıl və idrak sahibi olduğu üçün məşuqəsinin ona olan etinasızlığını qəbul etmir, ondan qarşılıqlı sevgi tələb edir. Bu lirik qəhrəmana görə həqiqi gözəl öz vədinə xilaf çıxmamalı, o da aşiq yandığı kimi eşq oduna yanmağı bajarmalıdır. Qüdsinin lirik qəhrəmanının gəldiyi bu nətijə onu klassik aşiq obrazlarından fərqləndirir və estetik gözəllik anlayışına, qarşılıqlı sevgiyə münasibətdə real həyati mövqe seçməyə sövq edir:

Mən haçan şəkkərə bənzər ləbini nuş elədim?
Qəhr üzilə demisən: "Aşiqi mədhuş elədim".
Yeri get, mən sənə bundan sora talib degüləm,

---

[1] АМЕА-нын М.Фцзули адына Ялйазмалар Институту, фонд 24, с.в. 202
2.Ятрафлы бах: Ясэяр Гядимов. ХЫХ яср Ордубад ядяби мцщити. Гцдси Вянянди. «Елм» няшриййаты, Бакы, 2003.

Özümü mən əbəsə eşq oxuna tuş elədim.
Atəşi-eşq sərapa mənə olmuşdu mühit,
O qədər ağladım, axır onu xamuş elədim.
Ey cəfapişə, keçən günləri bir-bir yada sal,
Könlümü gizli olan sirrinə sərpuş elədim.
Bilmədin qədrimi, ey vədəxilaf hərjayi,
Nə qədər bari-qəmin həmli-sərü duş elədim.
Sənin hüsnün Necə hüsn oldu ki, eşqində sənin
Məzhəbi, dinü dili, əqli fəramuş elədim.
Qəmu möhnətlərini bağrıma basdım şəbü ruz,
Özümü fikrü xəyalinlə həmağuş elədim.
Bəlkə insafə gəlib mehrü-məhəbbət eləsən,
Ey, səd əfsus, zəri-eşqimi məğşuş elədim.
Bu günəh səndə degül, tanrı bilir, məndədi kim,
Niyə hər sən kimini sərvlə həmduş elədim?
Deməyin səhldi, Qüdsi, şərəri-atəşi-eşq,
Zərrəcə aldı məni, digsifət cuş elədim.

XIX əsr Ordubad şairlərinin əksəriyyəti realist lirikada estetik gözəllik anlayışına müsəlman məişəti və müsəlman dünyagörüşü prizmasından baxırdılar. Bu şairlərin yaradıcılığında müsəlman zövqü lirikanın mərkəzində dayanırdı. Odur ki, lirik mövzularda qələmə alınan məşuqə obrazları müsəlman milli koloritinə, məişətinə, davranış və əxlaqına, adət və ənənəsinə uyğun şəkildə sənətə gətirilirdi. Lakin lirikada əsas yer tutan müsəlman zövqü dini mistikadan uzaq olub real həyati mahiyyət və məzmun daşıyırdı. Lirik qəhrəmanların daxili hiss və həyəcanlarının emosional intim təsviri də mistik deyil, həyati və dünyəvi səcuyyə kəsb edirdi. Bu cəhətdən Qüdsi Vənəndinin aşiqanə məzmunlu bir qəzəli daha tutarlı fakt təsiri bağışlayır. Bu qəzəlində Qüdsinin sevgilisinə olan estetik münasibəti tam şəkildə müsəlman zövqü baxımından şərh olunur.

Yeri gəlmişkən qeyd edək ki, Qüdsi Vənəndi şiə seyidlərindən olduğu üçün şeirlərində dəfələrlə buna işarə etmiş, özünün Ali- Peyğəmbər və övladi-Rəsul olduğunu bildirmişdir. Bu qəzəlində də şair özünü bir lirik qəhrəman və sevən aşiq olaraq övladi-Rəsul kimi təqdim edir. Məşuqənin aşiqə vurduğu mücgan oxu, "tiği-əbruyi-kəcunin" vurduğu yara, aşiqə verdiyi mənəvi iztirablar, acı göz yaşları, sinəsindəki "atəşi-suzan" müsəlman dünyagörüşü və zövqü baxımından səcuyyələndirilir və bütün bunlar kafərin müsəlmana etdiyi zülm və sitəmkarlıq kimi qiymətləndirilir. Lakin qəzəlin realizminə və həyati məzmun daşımasına söz yoxdur. Çünki sevən aşiq həyat adamıdır və bilavasitə şairin özüdür:

Dustlər, birjə məni-valehü heyranə baxın,
Nə bəlalər gətürüb başıma, dövranə baxın.
Mən ki, övladi-Rəsuləm, məni möhtaj eləyib,
Bir üzüqarə çəpəl zülfi-pərişanə, baxın.
Bu qara zülfün əlindən kimə mən dad eləyim?
Bağlayıb hər telə yüz məkr ilə min danə, baxın.
Deyiləm Ali-Peyəmbər, dutum, ey əhli-nəzər,
Bu qədər kafər edər zülm müsəlmanə? Baxın!
Çox həvəs eyləməyin siz də mənim tək bu gözə,
Tiği-əbruyi-kəcundən tökülən qanə baxın.
Buna bimar demün, səxtkəman hindudur,
Düzülüb çevrəsinə, ləşkəri-şeytanə baxın.
Bu çəpəndazın əlindən yetişib canə könül,
Gündə min kərrə tikir sinəmi mücganə, baxın.
Gözün əfsun eləyibdir, o siyəhtar, nigun
Şəmi-rüxsarına yanmaz niyə pərvanə? Baxın!
Məni mən' eyləməyin, eşq bükübdür qədimi,

Bir gəlin sinədəki atəşi-suzanə baxın.
Yoxdu Sənanda məzəmmət yeri çox, tanrı bilir,
Hərəmi-Kəbədəki küfrilə imanə baxın!
Dedilər Qüdsiyə mehmandı bu gün yari-əziz,
Yardən bir belə söz, küfrdü, böhtanə baxın!

"Xalını sandım Həcərdir, öpdüm səvab üçün" - deyən Fəqir Ordubadi də lirik qəzəllərinin müəyyən qismində müsəlman dünyagörüşünə söykənir, məşuqəsinin zahiri gözəlliyinin səcuyyəsində müqəddəs Quranın ayə və surələrinə istinad edirdi:

Ey qafil, Ordubadə gəlib bax bu mahivəşə,
Billah, əzizi-Misrdü, Kənan içindədir…
Gördüm düşübdü səfheyi-rüxsarə zülfi-tar,
"Vəlleyl" yadə düşdü ki, Qur'an içindədir.[1]

Şairin başqa bir qəzəlində də müsəlman zövqü ilə qarşılaşırıq:

Edib nişanə məni ol kəman əbruyə,
Cahanda yoxdu yəqin belə türki-tirəndaz.
Məlahət ilə ərəbdir, vəjahət ilə əjəm,
Fəda nigahinə mülki-Əjəm, diyari-Hijaz.
Xalın Həcərdir, yüzün qiblə, ğəbğəbin Zəmzəm,
Edəllə qaşuva bu əhli-ruzigar nəmaz!…

XIX əsr Ordubad ədəbi mühitinin nümayəndələri ədəbi yaradıcılıq əlaqələrində də fəal iştirak edirdilər. Bu şairlər Azərbaycanın Bakı, Gəncə, Qarabağ, Şamaxı, Lənkəran kimi ərazilərində fəaliyyət göstərən ədəbi məclislərin üzvləri ilə əlaqə saxlayır, bir-birlərinə mənzum məktublar, nəzirə və bənzətmələr yazırdılar. Fəqir, Qüdsi, Sidqi kimi şairlərin öz müasirlərinə yazdıqları mənzum məktublarında şeir və sənət adamlarının acı taleyindən, iqtisadi güzəranın ağırlığından, zəmanə qəmindən, şəxsi və ictimai vətəndaşlıq kədərindən söz açılırdı. Fəqir Ordubadinin Şamaxıya öz qələm dostu Seyid Əzim Şirvaniyə yazdığı «Seyyida» rədifli mənzum məktubu ədəbi yaradıcılıq əlaqələri baxımından olduqja qiymətli idi. Fəqir məktubunda dərdlərini Seyid Əzimlə bölüşərək xeyli vaxtdan bəri ondan məktub almadığını, dərd-qəmdən qəddinin əyildiyini bildirir və rəhbərlik etdiyi «Əncüməni-şüəra» ədəbi məclisini öz şeirləri ilə rövnəqləndirən Hacı Molla Hüseyn Bikəs, Məşədi Həsən Dəbbağ, Usta Zeynalabdin Nəqqaş, Hacı Mirzə Ağarəhim Qüdsi Vənəndi, Əhməd Ağa Şəmi, Nadim, Cani Ordubadi, Möhtərəm Ordubadi və Salik Ordubadi kimi istedadlı qələm dostlarının da iqtisadi güzəranının ağırlığından və mənəvi sarsıntılara məruz qalmalarından acı-acı şikayətlənirdi. Fəqir öz məktubunda Ordubadda jahil, nadan və kəzzabların hakim mövqe tutmalarını, xalqı zülm içində yaşatmalarını da xüsusi vurğulayırdı:

Gəlməyibdir naməniz xeyli zamandır, Seyyida!
Bu səbəbdən şüğlümüz ahü fəğandır, Seyyida!
Rahi-eşq ilə rəvan olmaq gözəl işdir, vəli,
Leyk mən qan ağlaram, qəddim kamandır, Seyyida!
"Məjlis"ə rövnəq verən kəslər olub xarü zəlil,
Çün ötüb fəsli-bahar, fəsli-xəzandır, Seyyida!
Bikəsü Dəbbağü Nəqqaş, Qüdsiyü Şəmi, Cani,
Möhtərəm, Salikü Nadim qəlbi qandır, Seyyida!
Kövkəbi-bəxtim mənim batmış fəzayi-zülmətə,
Yar yox, əğyar çox, dərdim nihandır, Seyyida!
Jahilü nadanü kəzzab cümləsi hakimdürür,
Filhəqiqə çərx dönüb, axır zamandır, Seyyida!
Bir Fəqirü bikəsü biçarəyəm, imdadə gəl,
Çün sənə fikrim əyan, dərdim bəyandır, Seyyida!

---

[1]. Фягир Ордубади. Аьлар гялям ялимдя. «Йазычы» няшриййаты, Бакы, 1989, сящ. 50

Bu mənzum məktub təsdiq edir ki, “Əncüməni-şüəra”nın üzvləri ədəbi yaradıcılıq əlaqələrində daha çox realist üsluba söykənir, zəmanənin dərdlərindən yazırdılar. Çünki Fəqirin mənzum məktubu X1X əsrdə Ordubadın İjtimai-sosial vəziyyətinin ağırlığı haqqında ümumi təsəvvür verməklə yanaşı, o dövrdə şeir və sənət adamlarına, ziyalı-şair şəxsiyyətinə qədir-qiymət qoyulmadığını da nümayiş etdirirdi.

Ədəbi yaradıcılıq əlaqələrində iştirak edən Ordubad şairləri sırasında Qüdsi Vənəndi də xüsusi yer tuturdu. O, Qarabağ, Şirvan, Təbriz, Dərbənd, Gəncə, Üştibin, Sərab şairləri ilə yaxından əlaqə saxlayır, onlarla məktublaşırdı. Qarabağın məşhur satirik şairlərindən olan Baba bəy Şakir Qüdsi Vənəndinin rəğbət bəslədiyi sənətkarlardan idi. “Baba bəy” rədifli mənzum məktubunda Qüdsi şairlər içərisində böyük şan-şöhrətə malik olan Baba bəyi Qarabağın xoştəb şairi kimi qiymətləndirərək onu Əbdi bəy Şirazi və Məhəmməd Füzuli kimi klassik Şərq şairləri ilə müqayisə edirdi. Qüdsi mənzum məktubunda Baba bəyə ajlıq qorxusu çəkməməsini, cahanın eyş-işrətindən nikbinliklə istifadə etməsini tövsiyə edərək yazırdı:

Ey şairi-xoştəbi-Qarabağ, Baba bəy,
Ey əhli-məzaq içrə xoşəxlaq, Baba bəy.
Əbdimi deyim mən sənə, yaxüt də Füzuli?
Sən kimi gərəkməz ola zəri-çağ, Baba bəy.
Mülki-Qarabağ içrə əcəb şövkəti-təbin
Salmış şüəra didəsinə ağ, Baba bəy.
Bu mülkdə çox dürr çəkib rişteyi-nəzmə
Nəzm əhli, dutubsan vəli sən tağ, Baba bəy.
Ovsafını qayətdə eşitdim, vəli könlüm
Olmuş yüzünü görməyə müştaq, Baba bəy.
Bir xüşkə əyaq ilə bizi yad edəsən gər,
Əlbəttə olur qayəti-əzvaq, Baba bəy.
Əzbəs içirib dəhr mənə zəhri-həvadis,
Şayəd ola mehrin mənə tiryaq, Baba bəy.
Gəl fürsət edək bir neçə gün eyşi-cahanı,
Aqilmi çəkər “xəşyəti-imlaq”, Baba bəy?
“Kusi-liminil-mulk” vurarsan səni, Qüdsi,
Şayəd qıla bir hərf ilə qəllaq, Baba bəy.

Qüdsinin və Fəqirin Jənubi Azərbaycan şairlərindən Seyid Əbülqasim Nəbati və sərablı şair Məhəmməd Xəlifə Acuzlə də ədəbi yaradıcılıq əlaqələri olmuşdur. O zaman ədəbi məclislər arasında hər hansı bir şairin qəzəlinə nəzirə və bənzətmələr yazmaq dəbdə idi. Belə hallarda ya klassik, ya da müasir şairlərdən birinin qəzəli ortaya qoyulur və ədəbi məclislərin üzvləri həmin qəzələ nəzirə yazıb öz aralarında müsabiqə keçirirdilər. Bu müsabiqədə xüsusi sənətkarlıq nümayiş etdirən şair qalib hesab olunurdu. Belə müsabiqələrdən birində Qüdsi Vənəndi şairə qadın Heyran xanım Dümbülinin:

Könlün diləsə bu dili-viranə dağılsın,
Çək naz ilə ol zülfünə bir şanə, dağılsın.

- beyti ilə başlayan qəzəlinə özünün:

Sənsiz mənə yeydir ki, bu kaşanə dağılsın,
Gənc olmasa hər yerdə, o viranə dağılsın.

- beytli nəzirəsini yazmış, Məhəmməd Xəlifə Acuz isə buna javab olaraq müsabiqənin iştirakçısı kimi özünün:

Mənzur budur bu dili-viranə dağılsın,
Bir şanə çək ol zülfi-pərişanə, dağılsın.

- beytli nəzirəsini yazmışdır.

Qüdsi Vənəndinin:

O səmənsa telə hər vəxt ki, bir şanə dəyər,
Ürəyim tel-tel olur, şanəsifət canə dəyər.

- beytli qəzəlinə isə Gəncədəki “Divani-hikmət” ədəbi məclisinin üzvü Mirzə Mehdi Nacu özünün:

Şanə hər dəmdə ki, ol zülfi-pərişanə dəyər,

Tari-mulər dağılıb hər biri bir yanə dəyər.
- beytli nəzirəsini, Məhəməd Xəlifə Acuz isə:

Hər zaman zülfi-pərişanivə kim, şanə dəyər,
Şanə yüz min dili-məjruhü pərişanə dəyər.

- beyti ilə başlayan nəzirəsini yazmışdır.

Qüdsi Vənəndinin Nəbatinin şeirlərinə yazdığı nəzirə və bənzətmələri də ədəbi yaradıcılıq əlaqələrində əhəmiyyətli rol oynayırdı. Qüdsi bəzən Nəbatinin gəraylılarından istifadə yolu ilə özünün aşiqanə qəzəllərində daxili qafiyələr yaradırdı. Nəbatinin:

Maşəallah, qadir allah
Gör Necə dilbər yaradıb!
Gül üzündə əfşan-əfşan
Zülfi-müənbər yaradıb.

-gəraylısından istifadə edən Qüdsi öz qəzəlində eyni üslubdan istifadə yolu ilə daxili qafiyələr yaratmışdır. Əgər şairin qəzəlindəki beytləri yarım misralar şəklində bölsək, o zaman Nəbatinin gəraylısına bənzəyişi görə bilərik:

Götür zülfi-müşkbarın,
Dola boynuma şahmarın,
Qüdsi boynuna qolların,
Tanrı bir heykəl yaradıb.

Nəbatinin qəzəllərinə Qüdsi ilə yanaşı, Fəqir Ordubadi də nəzirə və bənzətmələr yazmış və onunla mütəmadi olaraq məktublaşmışdır. Şairin ədəbi irsi içərisində Nəbatiyə yazılmış bir mənzum məktubu vardır. Bu məktubunda Fəqir bir il əvvəl Nəbatidən məktub aldığını bildirir və yazırdı:

İl olur kim, eyləmişdüz bizi tuğra ilə yad,
Oxuyub, şövqi-vüsalüz dilimi eylədi lal.

Fəqir məktubunda Nəbatini «şərəf bürcünün ayı, jəlal eyvanının günəşi» adlandıraraq onsuz qəddinin büküldüyünü və onunla görüşməyə tələsdiyini bildirirdi. Şair şeirin sonunda özünün şeir və sənət haqqındakı fikirlərini də ifadə edərək qəzəlini şirin nabata bənzədir, Əbülqasim Nəbatini isə bu şirin nabatı alan və qəzələ qiymət verməyi bajaran bir sənət əhli kimi səcuyyələndirirdi:

Ey süruri-dili-xun, fərəhi-qəlbi-məlal,
Ey məhi-bürcu-şərəf, şəmsi-eyvani-jəlal.
Buteyi-gülbüni-tovhid, güli-baği-Nəbi,
Gülşəni-səbzi-səyadətdə, əya, tazə nəhal.
Yetirir müxlüsi-diyrinə jənabuza salam,
Bəd öz halını eylər sizə təqrirü məqal
Ki, bu hicran oduna aşiqi-dilsuxtəni,
Nola bir dəm edəsiz lütflə mehmani-vüsal…
İstəyib ki, biləsiz halimi hər aydə bir,
Çərx əyib qəddimi sənsiz, eləyib misli-hilal…
Şəbi-hicran qəmini bəsdi, Fəqira, elə bəs,
Tap şəbi-qədri, elə ruzi-vüsal onda sual…
Yox vəli eyb, Nəbati alır aləmdə nəbat,
Bilir əlbəttə qəzəl əhli, bəli, qədri-qəzal.[1]

---

1 Фягир Ордубади. Аьлар гялям ялимдя (тяртиб, мцгяддимя, шярщ вя лцьят досент Ясэяр Гядимовундур). «Йазычы» няшриййаты, Бакы, 1989, сящ.138
2.Эювщяр щаггында бах: Ясэяр Гядимов. Асланхан Эювщяр. Нах.ДУ-нун «Елми ясярляр»и, хцсуси бурахылыш, 1999, № 4, сящ.113

Nəbatinin «Ey gözüm, yatma dəxi, gəl dəxi bidar ol-ol» və «Mənim bu təbi-Məcnunim genə bəzmi-şərab istər» misraları ilə başlayan qəzəllərinə də Fəqirin «Getmə çox xabə, gözüm, bir dəfə bidar ol-ol» və «Dikən o ləblərə göz, bağrını kabab istər» misraları ilə başlayan bənzətmələri də vardır.

XIX əsr Ordubad şairlərinin yaradıcılığında ictimai ziddiyyətlərin tənqidinə də geniş yer verilirdi. Bu baxımdan Qüdsi Vənəndinin, Fəqir Ordubadinin, Usta Zeynalabdin Nəqqaşın (1839-1904) Məhəmmədqulu Salikin və Aslanxan Gövhərin[2] yaradıcılığı daha səcuyyəvi idi. Aslanxan Gövhərin (1847-1906) şifahi xalq şeiri tərzində qələmə aldığı əsərlərində yoxsul ictimai təbəqələrə zülm edən harınlamış var-dövlət sahibləri, zəhmət adamlarının hesabına yaşayan tüfeylilər tənqid olunurdu:

Gövhər qələm tutub yazhayazdadır,
Onun da xəyalı vəsfi-nazdadır,
Zəhmət çəkmək, alın təri bizdədir,
Dövlətlilər füqəranı dağıtdı.

Usta Zeynalabdin Nəqqaş[1] islam dininin müqəddəs qanunlarından öz şəxsi məqsədləri üçün istifadə edən və xalqı əsarətdə saxlayan jəhalətpərəstləri tənqid edirdi:

Ali- Süfyan dövlətindən geydiyiz narincudir,
Bəs ki, siz nar əhlisiz, axır sizi nar incudir.

Nəqqaşın «Qara pul» rədifli şeirində də haram yolla qazanılan pulun sinifli jəmiyyətdəki pozucu rolu tənqid olunurdu:

Ey olan ənfəsi-afaqidə sultan, qara pul,
Ey olan həşrə kimi raziqi-dövran, qara pul.
Nə nəbatat, nə jəmadata səni oxşadıram,
Sənsən aləmdə yəqin saniyi-şeytan, qara pul.
Nüjəba kimsələri qəhvənişin eyləmisən,
Qılmısan dəhrdə hər əbləhi insan, qara pul.
Fasiqi, fəzihü kəzabı əziz eyləmisən,
Mərifət əhli olub xak ilə yeksan, qara pul.
Heç gəlir yadivə bir xeyr işə iqdam edəsən?
Çalışırsan edəsən zülmüvü tüğyan, qara pul…

XIX əsr Ordubad ədəbi müitində şairlərin müxtəlif məmləkətlərə səfərləri zmanı qələmə aldıqları mənzum səfərnamələrində də ictimai ziddiyyətlərin tənqidinə üstünlük verilirdi. Fəqir Ordubadinin və Qüdsi Vənəndinin yaradıcılığında ictimai satiranın dəyərli nümunələri sənətə gətirilir, hakim dairələrin özbaşınalığından və iqtisadi güzəranın ağırlığından söz açılırdı. Qüdsi Vənəndinin Naxçıvana gəlişi zamanı qələmə aldığı «Qəside dər tərife əşxase Nəxçivan» sərlövhəli mənzum səfərnaməsində Naxçıvanın ictimai mühitinin, əhalinin müxtəlif tüfeyli təbəqələrinin, şəhər qazısının, darğanın və ayrı-ayrı şəxslərin tənqidi verilirdi. Əsər başdan-başa Qüdsinin şəxsi müşahidələrinə əsaslandığı üçün tam realist mahiyyət daşıyır:

Naxçıvan mülkünə seyr etmək üçün əzm elədim,
Dərü divarını küfr ilə münəvvər gördüm.
Qoydum üz o tərəfə şövqlə seyr etmək üçün,
Kimsəni məst, kimi məhz müxəmmər gördüm.
Əhli-bazarını çəkdim məhəki-təjrübəyə,
Jümlə əsnafını mən maili-çox şər gördüm.
Könlümün ayinəsin zəngi-zəlam eylədi tar,
Nə qədər baxdım isə aləmə, yeksər gördüm.
Canibi-məscudə düşdü güzərim br neçə gün,
Etikafında onun jəmi-mükəssər gördüm.
Kimi soltan, kimi bəyzadə, kimi xanzadə,
Kimi seyyid, kimi molla, kimi əfsər gördüm…

---

[1] Бах: Ясэяр Гядимов. Шаир Уста Зейналабдин Няггаш. Тябриз, «Мящди-азади» гязети, 30-31 ийул, 1, 2 август, 2000-жи ил, №2159, 2160, 2161, 2162

Babi-ifalə çəkib cümləsini sərf elədim,
Görmədim bir kişi mən, cümlə müsəğğər gördum…
Qaziyi-şəhrə deyin fisqini ibraz edərəm,
Deməsin bilmədi kim, halını digər gördüm.
Şəhnə bazarə gəlib, möhtəsib olmuş vaqif,
Diyərəm, alsa xəbər, mən onu kafər gördüm.

Qüdsi Vənəndinin Tehranda qələmə aldığı mənzum səfərnaməsində də tənqidi-realist motivlərlə qarşılaşırıq. Bu realist səfərnaməsində Qüdsi İran məmləkətində rast gəldiyi müxtəlif adamların aqibətindən söz açır, Baba bəy, Süleyman bəy, Əliəsgər bəy, Paşa bəy, Əli xan, Hacı Məmməd xan kimi İran əhlinin mənəvi-əxlaqi keyfiyyətlərini səcuyyələndirərək onların hər birinə ayrılıqda qiymət verirdi. Qüdsi İranın Rey məmləkətində rast gəldiyi Əli xanın mənzilini guşeyi-zindan adlandırır, Hacı Məmməd xanı isə zəmanə qəmi çəkən və yoxsulluq içərisində güzəran keçirən qaraqabaq xan kimi səcuyyələndirirdi:

O güni ki, güzərim düşdü mənim mülki-Reyə,
Əli xan mənzilini guşeyi-zindan tapdım.
Hacı Məmməd xan ilə bir gün oturdum-durdum,
Ah çəkməkdə onu külbeyi-əhzan tapdım.
Yengi dərviş kimi qarəqabaq, məhz əbus,
Toxm ilə başdan ayağə dolu ənban tapdım.

Sonrakı misralarda Qüdsi İran əhalisinin acınajaqlı həyat tərzindən söz açır, yoxsulluq içərisində ömür sürən insanların oduna, samana, acı qəlyana, hətta adi suya belə möhtaj olduqlarını bildirirdi. Quru həsir üzərində oturan jamaatın mal-qara saxlamaq üçün adi tövləsi belə yoxdur. Hətta yerli xanlar da müflis vəziyyətdə güzəran keçirirlər:

Nə saman var, nə arpa, nə təvilə, nə odun,
Quru bir xüşkə həsiri əvəzi-nan tapdım.

Qudsi İran məmləkətində rast gəldiyi xanların iqtisadi güzəranını müqayisə edərək onların ehtiyaj içərisində yaşadıqlarını və bəzilərinin xan olsa da, süfrəsində yeməyə bir şey tapılmadığını bildirirdi:

Mənzili-xani ki, gördüm, ona çox şükr elədim,
Onu cənnəti, bunu mən qəteyi-niyran tapdım.
Tapılırdı o dağılmışda genə nanü penir,
Bu yıxılmışda nə su, nə acı qəlyan tapdım.
Süfreyi-xan döşənibdir dedilər, çox baxdım,
Aşı yox, pilovu yox, bir quruja xan tapdım.

Qüdsi Vənəndi ilə yanaşı, Fəqir Ordubadi də yaradıcılığının yetkin çağlarında tənqidi-realist mövzulara müracuət edir, satirik mənzumələr qələmə alırdı. Onun «Naxçıvanın abü havasını məzəmmət» adlı satirik-tənqidi mənzuməsində Naxçıvanın isti iqlimi məzəmmət olunmaqla yanaşı, öz elminə əməl etməyən alimlər, zahidlər, dərviş və əsnaflar da tənqid edilirdi:

Dad, əzizan, bu fələkdən, özü tək yoxdu dəğa,
Gətirib başıma nə həddidə gör dərdü bəla.
Vurdu möhnət daşını sineyi-suzanimizə,
Ordubaddan elədi bizləri bir vəqt cüda.
Yayın orta ayı saldım yolumu Nəxçivana,
İsti çəkdirdi mənə, eylədi min cövrü cəfa…
Yox o şəhr içrə xərid etməli bir türfə məta,
Ğeyri-titrətməvü qızdırmavü taunü vəba.
Leyk tərif eləyim sizlərə mən adəmini,
Mini asivü günahkar, biri mərdi-xuda.
Xanları sahibi-ehsani-mürüvvətdi, hünər,
Bəyləri sahibi-izzətdi, səxavətdi, əta.
O ki, alimləridir, etməz öz elminə əməl,

O ki, zahidləridir, sahibi-dəstarü əsa.
Seyyidi pürtəməvü dərvişi də şorba tökən,
Əsnafı püstəni istər iki hoqqayə sata.

Fəqirin «Dünya əhlini məzəmmət» adlı satirasında da şəhər qazıları, tüfeyli dövlət məmurları, xalqa zülm edən kəndxudalar və müxtəlif istismarçı təbəqələr tənqid olunurdu.

Şairin «Hekayəti-javanmərdi-kürd» adlı satirik mənzuməsində isə birbaşa çar üsuli-idarəsi və onun rüşvətxor qubernatorları satira hədəfinə çevrilirdi. Bu əsərində Fəqir sadə kəndli qadını olan Fatının simasında öz hüququnu tələb edən üsyankar qadın obrazı yaratmışdır. Bu cür realist əsərləri ilə XIX əsr Ordubad şairləri öz müasiri olan S.Ə. Şirvani, M.M.Xalxali, Q.Zakir, B.Şakir kimi satirik sənətkarlarla birləşir və tənqidi realistlərin ədəbi mövqeyində dayanırdılar.

XIX əsr Ordubad ədəbi mühitində maarifçi-realist ədəbiyyat da təşəkkül tapıb inkişaf edirdi. Maarifçi poeziyanın və nəsrin inkişafında «Əncüməni-şüəra» ədəbi məclisinin rəhbərlərindən olan Məhəmməd Tağı Sidqi[1] xüsusi fəallıq göstərirdi. Sidqi özünün Ordubadda və Naxçıvanda açdığı «Əxtər» və «Məktəbi-tərbiyə» adlı təhsil ojaqlarında, şəxsən özünün yazıb tərtib etdiyi dərsliklərində elmi və maarifi təbliğ edirdi. Maarifçi-şairin öz şagirdləri üçün qələmə aldığı şeirlərində elmə və maarifə çağırış ideyaları əsas yer tuturdu: «Əz Sidqi» sərlövhəli şeirlərində şair öz şagirdlərini elm təhsil etməyə, inkişaf etmiş xalqların və millətlərin səviyyəsinə yüksəlməyə səsləyirdi:

Ay uşaqlar, edək biz də qeyrət,
Ta ki, təhsil edək adəmiyyət.
Bəlkə bizdən gedə bu jəhalət,
Çəkməyək xəlqdən bari minnət.
Keçməmiş, keçməmiş vəqti-fürsət,
Eyləyək, eyləyək dərsə diqqət.
Jümlə aləm edib elmə rəğbət,
Tapdılar hər biri şanü şövkət.
Bu nə insafdır, nə mürüvvət?
Qonşulardan çəkək biz xəcalət?
Keçməmiş, keçməmiş vəqti-fürsət,
Eyləyək, eyləyək dərsə diqqət.

M.T.Sidqi öz oğlu Məhəmmədəliyə yazdığı mənzum nəsihətnamələrində də maarifçilik mövqeyindən çıxış edir, oğlunu dünya dillərini öyrənməyə, elmə və maarifə yiyələnməyə çağırırdı:

Gözümün nuri, ey Məhəmmədəli,
Kömək olsun sənə Əliyyi-Vəli.
Ey mənim sərvi-bağü bustanım,
Ey mənim bülbüli-gülüstanım.
Sən mənim cusmim içrə canımsan,
Sən mənim tifli-xanbəyanımsan.
Nə qədər ki, var əlində fürsət,
Dərsinə eylə hər zaman diqqət.
Yetişibdi zamani-elmü ədəb,
Mənzilin eylə guşeyi-məktəb…

İnsan şəxsiyyətinin formalaşmasında əqli tərbiyəyə üstünlük verən Sidqi bu qənaətə gəlirdi ki, uşaqlarda əqli kamillik yaratmadan şəxsiyyətin kamilliyinə nail olmaq olmaz. Odur ki, böyük tərbiyə nəzəriyyəçisi olan Sidqi oğluna xitabən yazırdı:

Bütün dünyanı elm edər abad,

[1] Бах:Ясяяр Гядимов. Мящяммяд Таьы Сидгинин щяйаты вя йарадыжылыьы. «Чашыоьлу» няшриййаты, Бакы, 2003-жц ил; Ясяяр Гядимов. М.Т.Сидгинин маарифчи шеирляри. Тещран, «Варлыг» ъурналы, 1378 (милади 1999), № 112-113, бащар-йай, сящ.130; НДУ-нун «Елми ясярляр»и. 2000-жи ил, № 6, сящ. 32

Özünü eylə jəhldən azad.
Rüzgarın keçirtmə qəflət ilə,
Elm təhsil eylə diqqət ilə.
Ömrünü məsrəf eylə bir neçə il,
Ta ki, təhsil eylə bir neçə dil.
Rusi, farsi, türki, həm ərəbi,
Bunları bilmək artırar ədəbi.

M.T.Sidqinin bu nəsihətnaməsi S.Ə.Şirvaninin oğluna nəsihətləri ilə yaxından səsləşir. Bu isə təsdiq edir ki, Sidqi də öz müasiri olan S.Ə. Şirvani kimi maarifçi realizm mövqeyində dayanmış və XIX əsr Ordubad ədəbi mühitinin formalaşmasında əhəmiyyətli rol oynamışdır.

M.T. Sidqi «Heykəli-insanə bir nəzər», «Məsnəviyati-mədəniyyə», «Puşkin», «Kəblə Nəsir» və s. əsərlərində də görkəmli maarifçi kimi çıxış edirdi. O, Baxçasarayda, Misirdə, Kəlküttədə, İranda, Türkiyədə çıxan bir sıra qəzet və curnallarda da maarifçi-publisist məqalələr dərj etdirirdi. «Sürəyya», «Pərvəriş», «Həblül-mətin», «Əxtər», «Ədəb», «Çöhrənüma», «Nasiri», «Tərcüman» Sidqinin daha çox mütaliə və iştirak etdiyi orqanlardan idi.

XIX əsr Ordubad ədəbi mühitinin formalaşmasında şifahi xalq-aşıq şeiri üslubu da müstəsna əhəmiyyət kəsb etmişdir. Bu ədəbi mühitin Qüdsi Vənəndi, Fəqir Ordubadi, Hacı Molla Hüseyn Bikəs və Salik Ordubadi kimi nümayəndələri öz yaradıcılıqlarında şifahi xalq şeirinin kamil nümunələrini yaradır, poeziyada M.P.Vaqifin və Q.Zakirin realist ənənələrini yaşadırdılar. Qüdsi Vənəndinin qələmə aldığı aşiqanə məzmunlu gəraylı və qoşmalarında dərin xəlqi məzmun və xəlqi ruh var idi. Onun «Qaşların», «Gözlərin», «Tellərin», və «Üstündən» rədifli qoşmaları təmiz eşqin tərənnümünə həsr olunmuş dəyərli sənət nümunələri idi:

Şəmi-rüxsarinə misl səməndər,
Görünjək od tutdum, ey mahi-ənvər.
Dövri- ruxsarində, allahu əkbər,
Yanmaz səbəb nədir narə tellərin?!

Qüdsi kimi qoyma məni bu gündə,
Həsrət qalım, ey sevdiyim, kuyində,
İtirmişəm can quşumu muyində,
Şanə tutub bir-bir ara tellərin.

Şairin «Üstündən» rədifli aşiqanə məzmunlu qoşması özünün sadəliyi, təbiiliyi və milli ruhu ilə seçilirdi. Bu qoşmasında Qüdsi daha çox xalq-aşıq şeiri ənənələrinə və M.P.Vaqifin lirik üslubuna söykənərək təsvir etdiyi gözəli Azərbaycan qızlarının milli xüsusiyyətlərinə və milli ənənə və geyiminə uyğun bir qiyafədə təqdim edir:

Əfi kimi həlqələnib sərməşmiş,
Zülfi-siyəh al yanağın üstündən.
Mur tək səbzeyi-xəttin baş verib,
Yol salıbdır tər buxağın üstündən.

Pilək, düz çarqət, nimtənə, zərtar,
Ətrafı zəncurə, qələmkar astar,
Bəndi gülabətin, susəni şalvar,
Müstəhsəndir simü saqın üstündən.

Gözəl neynür zinət üçün zivəri,
Başdan ayaq gül tək olsa peykəri,
Zərəfşan türrənin piçü xəmləri,
Çıxmış ola gər dodağın üstündən.

Gözəl gərək gözdə şuxü şəng ola,
Ğazəsiz, vəsməsiz, çox qəşəng ola,
Göftarı dilfərib, ağzı təng ola,
Saç tökülə hər əyağın üstündən.

Qüdsinin «Məni» rədifli gəraylısında xalq poeziyasına yaxınlıq daha çox nəzərə çarpır. Bu gəraylıda Azərbaycan xalq bayatılarının və «Koroğlu» dastanının da güclü təsiri vardır:

Məcnun tək düşdüm çöllərə,
Yasandım qürbət ellərə,
Bağlayıb qarə tellərə,
Bir ala gözlü yar məni.

Gəlmişəm quş tək səmənə,
Getmənəm dəxi vətənə,
Qəribəm, rəhm eylə mənə,
Öldür, qəmdən qurtar məni.

Göz götürməm intizardan,
Qurtulmaram ahü zardan,
Sən kimi bivəfa yardan,
Yeydir sata tatar məni.

Rəhm eylə, zülfi-tərrarın,
Bu can alan sitəmkarın,
Çoxdandır çeşmi-bimarın,
Qüdsi, edib şikar məni.

XIX əsr Ordubad ədəbi mühitində şifahi aşıq şeiri üslubunda yazan şairlər sırasında Hacı Molla Hüseyn Bikəsin də xüsusi dəsti-xətti var idi. Daha çox klassik üslubda və dini mövzularda yazan Bikəs xalq şeiri sahəsində də qələmini sınamış, zərif və şux qoşmalar yazmışdır. Bikəsin qoşmalarının dili daha sadə, anlaşıqlı və xalq dilinə yaxındır. Bu qoşmalarda real həyati eşqin təsviri ön plana çəkilir:

Bir gülüzlü yarın cövrün çəkərəm,
Üzülübdür, candan bənə can olmaz.
Qəm deyildir rəqib görmək yar ilən,
Hansı güldür çevrəsində xar olmaz?

Hicran mənim əlif qəddim dal etdi,
Səg rəqiblər ruzigarım tar etdi,
Dostu qoymuş, əğyarını yar etdi,
Onun təki bir vəfasız yar olmaz.

Nə zülm ilən, zalım, aldın o yarı,
Üzdün ixtiyarım, səbrü qərarı,
Qorxmadınmı tuta ahım şərarı?
Bidin rəqib, məgər səndə ar olmaz?

Bikəsin aşiqanə qoşmalarında klassik yazılı poeziyadan gələn ərəb və fars tərkibli izafət birləşmələrinə rast gəlmirik. Onun qoşmaları müasirlərindən fərqli olaraq daha çox aşıq şeirinə bənzəyir. Aşıq qoşmalarında olduğu kimi, Bikəsin də aşiqanə-lirik qoşmalarında gözəllərin zahiri görkəminin təsvir və tərənnümü öz axıcılığı və estetik duyumu ilə seçilir:

Seyrə çıxmış, zülflər tökmüş bir yanə,
Gül utanmış, lalə dönmüş bir yanə,
Rəqibi öldürrəm, var get bir yanə,
Fitvası var, rəqib ölsə qan olmaz.

Mən sevdiyim cümlə cahan şahıdır,
Bədirlənmiş doqquz fələk mahıdır,
Bikəs aşiqlərin qibləgahıdır,
Heç onun tək bir ədalət xan olmaz.

Bikəsin qoşmaları sənətkarlıq cəhətdən bir qədər ziddiyyətli olsa da, axıcıdır. Bu qoşmalarda təsvir olunan dərdli aşiq klassik aşiqanə məhəbbət dastanlarımızın qəhrəmanları kimi öz sevgililərinin ardınja

diyarbədiyar dolaşan və sevdikləri gözəli təbiətdən, badi-səbadan soraq edən haqq aşıqlarına bənzəyir. Bikəsin lirik qəhrəmanı da Aşıq Qərib və Kərəm kimi öz sevgilisini təbiət qüvvələrindən, badi-səbadan xəbər alır:

Badi-səba, ol allahı sevərsən,
Söylə görüm, nazlı yarı gördünmü?
Canan deyib göz dikibən yollara,
Didə yaşlı intizarı gördünmü?

Şeyda bülbül hər dəm oxur dillərdə,
Xar həsrəti baqi qalsın güllərdə,
Yüz qəm ilə gözü qalıb yollarda,
Könlü qəmli diləzbəri gördünmü?

Kim görübdür ol qamətdə, biçində,
Tər buxaqlar peyvənd olub saçında,

Gözəllər şahıdır xublar içində,
Kuyi cənnəti gülüzarı gördünmü?

Onu sevdim, düşdüm eldən avarə,
Günbəgün dərd artdı varə-varə,
Bikəs tapşırmış o nazlı yarə
Qoynundakı qoşa narı, gördünmü?

Qoşmaların yazılış tərzi və bədii üslubu təsdiq edir ki, Bikəs klassik aşiqanə məhəbbət dastanlarımızdan və xalq şeiri ənənələrindən bəhrələnmiş və poeziyanın lirik qolunda xəlqi üsluba söykənmişdir.

XIX əsr Ordubad şairləri içərisində Hacıağa Fəqir Ordubadinin və M.T.Sidqinin yaradıcılığında da aşıq şeiri üslubuna rast gəlirik. Lakin Ordubad ədəbi mühitinin digər nümayəndələri ilə müqayisədə Fəqirin və Sidqinin aşıq şeiri tərzində qələmə alınmış əsərləri azdır. Fəqirin ədəbi irsi içərisində «Nisbətdir» rədifli bir gəraylısı, «Arasında», «Ey gözəl» və «Qara göz» rədifli üç müxəmməsi və «Görünməz» rədifli bir qoşması vardır.

Şairin «Görünməz» rədifli aşiqanə qoşması özünün xəlqi lirizmi və emosional poetik üslübü ilə daha xoş təsir bağışlayır:

Gejə-gündüz həsrətində qalmışam,
Ol büti-növjavan hanı, görünməz!
Yandurubdur məni eşqin atəşi,
Ala gözlü xuban hanı, görünməz?!

Xəlq içində məni Məcnun eyləyən,
Dəmbədəm çeşmimi pürxun eyləyən,
Səhralərdə məni gülgun eyləyən,
Ol gözləri fəttan hanı, görünməz?!

Lakin xalq-aşıq şeirinin poetik üslubunu özündə birləşdirən bu qoşmada xəlqi məzmunla dil sadəliyi klassik lirikamızdakı əruz üslubu ilə bədii vəhdətdə verilir. Şair daha çox klassik lirika ənənələrinə bağlı olduğundan qoşmada «mələkmənzər», «pəripeykər», «hurivəş», «mahi-mehriban», «büti-növjəvan» kimi söz və izafət birləşmələrindən də istifadə edir. Lakin klassik Şərq lirikasından irəli gələn bu ifadələr qoşmanın ümumi məzmununa və xəlqi üslubuna xələl gətirmir:

Ol mələkmənzərim, pəripeykərim,
Ol günəş şöləlüm, qönçə dilbərim,
Qolları şahmarım, qəddi ərərim,
Ol sərvi-xuraman hanı, görünməz?

Cismim hicr oduna büryan olubdur,
Xəstəhal gözlərim al qan olubdur,
Xublara can-başım qurban olubdur,
Ol can alan canan hanı, görünməz?!

Əqlimi başımdan edən sərsəri,

O tavus nişanlu, hurivəş pəri,
Kim Fəqir tək sevdi gözəl dilbəri,
Ol mahi-mehriban hanı, görünməz?![1]

Şairin «Nisbətdir» rədifli gəraylısında da dərdli aşiqin dili ilə məşuqənin zahiri gözəlliyi tərənnüm olunur, onun vəsfi aşıq gəraylılarının bədii üslubuna uyğun bir tərzdə verilir:

Gül kimi şəmi-rüxsarın
Məhi-tabanə nisbətdir.
Günəş hüsnün təjəllisi
Dəxi rizvanə nisbətdir.

Saçı sünbül, al buxaqlı,
Lalə tək əhmər dodaqlı,
Nəsri gül, nərgiz yanaqlı,
Huri, qılmanə nisbətdir.

Laləzardır ağ sinəsi,
Novbahar olmuş meyvəsi,
Yeni baş vermiş məməsi,
Sün'i-rəhmanə nisbətdir.

Qoynunda bitmiş narınjı,
Ağzı qönçə, dişi incu,
Fəqiri qoydu zarınjı,
Yanar, pərvanə nisbətdir.

Eyni təsvir və tərənnüm üsuluna şairin müxəmməslərində də rast gəlirik. Aşıq müxəmməslərində olduğu kimi, bu müxəmməslərdə də şairin təsvir etdiyi gözəllər «türrələri çin-çin sağü soluna tökülən», «incə belinə zərrin kəmər qurşayıb», «dəsmali-Firəngini gül tək əlinə alan» sadə və təbii biçimli el qızlarıdır:

Çin-çin tökülüb türrələri sağü solunda,
Zərrin kəməri qurşuyub ol incə belində,
Dəsmali-Firəngini alıb gül tək əlində,
Çini gəzəsən, yox belə ahusu çölündə,
Yox böylə maral Bəlxü Buxara arasında.

«Qara göz» rədifli müxəmməsində Fəqirin lirik qəhrəmanı olan dərdli aşiqin sevgilisinə etdiyi məzəmmət və giley-güzar məşuqənin zahiri gözəlliyinin bədii təsviri ilə vəhdətdə verilir. Bu müxəmməsdə sevən aşiq həm sevgilisinin gözəlliyi qarşısında məftun olub hicran və ayrılıq sitəmindən qəm çəkən, həm də rəhmsiz və daşqəlbli məşuqəsini öz eşqinə inandırmağa çalışan məzəmmətçi lirik qəhrəman kimi təqdim olunur:

Rəhmə gəl, eyləmə bu könlümü viran, qara göz,
Qorx xudadən, bu qədər eyləmə tüğyan, qara göz,
Qüdrətin xaliq edib səndə nümayan, qara göz,
Dəxi sən hüsndə xəlq olmuyub insan, qara göz,
Elə şükri-əhədi-qadiri-sübhan, qara göz!

Bir zaman sərsəri-piri bu gülüstanə əsər,
Dəxi qalmaz bu qədi-sərv belə tazəvü tər,
Nə kənarinə onun mən kimi bir qumri gəzər,
Ondan əqdəm ki, görünməz bu vəjahətdən əsər,
Vəslin et aşiqi-nalanuva ehsan, qara göz!

Qoyaram dərgahinə sübhü məsa ruyi-niyaz,
Qılaram olmasa gər zümm, o rüxsarə namaz,

---

[1] АМЕА-нын М. Фцзули адына Ялйазмалар Институту, жцнэ № 96, Б-1761, вяр. $28_а$
3386

Aldı hicran canımı, eyləmə bu həddidə naz,
Gül yüzündən bu Fəqir iylədi bir zərrəcə, az,
Onu yəni edəsən busəyə mehman, qara göz!

Fəqirin müxəmməslərindən verdiyimiz bu nümunələr təsdiq edir ki, şair öz müasirləri ilə müqayisədə daha çox klassik üsluba söykənmişdir. Çünki yuxarıdakı nümunələr müxəmməs formasında qələmə alınsa da, onların dilində klassik üslubdan irəli gələn ərəb və fars tərkibli izafət birləşmələri işlənir. Bu müxəmməslərdə sufi eşqin, «vəhdəti-vücud» təriqətinin də təsiri özünü göstərir:

Qoy dolanım dəmbədəm başuva pərvanə tək,
Kakiliva əl çəkim teldə gəzən şanə tək,
Qoyma Fəqirin sənin tərk ola biganə tək,
Öpsə əgər ləblərin sağərü peymanə tək,
Daxil olur cusminə ruhi-rəvan, ey gözəl!

Məhəmməd Tağı Sidqi də Fəqir Ordubadi kimi müxəmməslərini sadə xalq dilində deyil, klassik üslubda qələmə almışdır. Lakin Fəqirin müxəmməsləri ilə müqayisədə Sidqinin müxəmməslərinin dili bir qədər sadə və anlaşıqlıdır. Onun müxəmməslərində də «vəhdəti-vücud» təriqətinin təsiri duyulmaqdadır:

Dilbəra, nuri-ruxun mehri-müjəlladən gözəl,
Pərtövi-hüsnün sənin nuri-təjəlladən gözəl,
Qamətin bağ içrə ol sərvi-diladən gözəl,
Ləfzi- göftarın mənə nitqi-Məsihadən gözəl,
Aləmi-süfladə sənsən ərşi-əladən gözəl.

Əksi-ruyindən xəcalət afitabü mahdır,
Şöleyi-ahım qəmində mahilə həmrahdır,
Qaşların dibaçeyi-hüsnündə bismillahdır,
Vəh, nə bismillah ki, hərfi-sini-sirrüllahdır,
Heç katib yazmayıb tuğra bu tuğradən gözəl.

Lakin bununla yanaşı, Sidqi lirik qəhrəmanı olan aşiqin dili ilə məşuqənin jəmalını Kəbəyə, xalını Həcərə, dəhanını çeşmeyi-Zəmzəmə bənzədir:

Qamətin sərvi-sənubər, arizin şəmsü qəmər,
Gərdənin mina, jəmalın Kəbədir, xalın Həcər,
Çeşmeyi-Zəmzəm dəhanındır, ləbin yaquti-tər,
Hoqqeyi-ləli-ləbindir məxzəni-dürrü gövhər,
Dişlərin hər danəsi dürri-müsəffadən gözəl.

Sevgilisinin hüsnünə məftun olan bu aşiq klassik lirikada olduğu kimi, Məcnunsayağı qəhrəmandır.Onun sevgilisi Şirindən də, Leyladan da gözəldir. Bu gözəl öz dərdli aşiqini Fərhad kimi rüsvayi-cahan etmiş, Məcnun kimi onu çöllərə salmışdır:

Gül jəmalın eylədi bir bülbüli-şeyda məni,
Şəmi-hüsnün qıldı çün pərvanə, bipərva məni,
Kuhkən tək etmisən afaqidə rüsva məni,
Eylədin Məcnunsifət sərgəşteyi-səhra məni,
Yəni sənsən, dilbəra, Şirinü Leyladən gözəl.

pÜlfəti var gördü gülzar içrə xar ilə gülün,
Ondan ötrü naləsi tutmuş cahanı bülbülün,
Türreyi-yarı görüb getdi səfası sünbülün,
Nitqdən düşsün görüm, ey Sidqi, lal olsun dilin,
Gər desən sünbüldür ol zülfi-mütərradən gözəl.

XIX əsr Ordubad şairləri sırasında şifahi xalq-aşıq şeiri tərzində yazanlardan biri də Aslanxan Gövhər olmuşdur. Onun yaradıcılığında klassik şeir formalarına rast gəlmirik. Əldə olan şeirləri qoşma, gəraylı və bayatılardan ibarətdir. Bu şeirlərdə xalq ədəbiyyatının, aşıq şeirinin güclü təsiri duyulur. Azərbaycan aşıq poeziyasında olduğu kimi, Gövhərin də şeirlərində təsvir və tərənnüm olunan gözəllər mücərrəd, xəyali və əlçatmaz

gözəllər deyildir. Bu gözəllər şairin şəxsən tanıdığı, hətta adlarını bildiyi el qızlarıdır. Nərgiz adlı bir gözələ həsr etdiyi aşağıdakı qoşması bu cəhətdən fikrimizi təsdiq edir:

Mehri-zərəfşandır Nərgizin üzü,
Qaradır qaşları, aladır gözü.
Ceyran tək dolanır səhranı, düzü,
Dağıtma tellərin aralı, Nərgiz,
Sənsən bu dağların maralı, Nərgiz.

Gözəllər içində sən idin maya,
Bədəxşan dürrünü düzüb sinəyə,
Tərlan kimi pərvaz eylər havaya,
Yanı qırqovullu, balalı Nərgiz,
Sənsən bu dağların maralı, Nərgiz.

Şeirdə işlənən söz və ifadələr sadə xalq dilindən gələn ifadələrdir ki, bu da Gövhərin xalq həyatına yaxından bağlı olduğunu təsdiq edir.

Aslanxan Gövhərin bir qrup şeirlərində məhəbbət mövzusu ilə ictimai tənqid üsulu birləşir. Bu ruhlu şeirlərində şair bir tərəfdən özünün vətən, el gözəlləri haqqındakı lirik duyğularını tərənnüm edir, digər tərəfdən də yaşadığı dövrün ictimai ziddiyyətlərinə və yoxsulların ağır güzəranına münasibətini bildirir:

Əlində görmüşəm əlvan hənanı,
Yandırdın odlara mən binəvanı,
Zalım dövran əldən alır cananı,
Yoxsulu tərk edir var ilə yatan.

Gövhərin yaradıcılığında zəmanədən şikayət, hüzn və kədər motivləri də güclüdür. Bu ruhlu şeirlərindən müəyyən etmək olur ki, şair həmişə azadlığa can atmış, haqq-ədalət axtarmış, lakin yaşadığı mühitdə həmişə qara günlər əlindən fəryad etmişdir ki, bu da onun şeirlərinə ictimai məzmun vermişdir:

Gözüm qaldı mənim haqda,
Düçar oldum qara baxta,
Viran qalmış belə vaxtda,
Dərdlərimi bilən gəlsin.

Könlümün qalası uçub,
Qan ağlaram, günüm keçib,
Bahardır, lalələr açıb,
Lalələri görən gəlsin.

Gəraylının ikincu bəndində şair bahar vaxtı qəm-qüssədən bağrı qaralan lalənin təbii xüsusiyyətlərinə ictimai məzmun verərək həmin əlamətləri öz kədərli qəlbinin üzərinə köçürmüş və mənalı bənzətmə yaratmışdır.

Deyilənlər təsdiq edir ki, XIX əsr Ordubad ədəbi mühitində yazıb yaradan şairlər öz yaradıcılıqlarında həm xalq ədəbiyyatından gələn mövzuları sənətə gətirmiş, həm də klassik üslubda və dini mövzularda yazmışlar. Bu şairlərin yaradıcılığında aşıq şeiri üslubu, dini üslub, maarifçi-realist və tənqidi-realist üslub paralel şəkildə inkişaf etmiş və formalaşmışdır.

Məhəmmədqulu Əbdülhüseyn oğlu Salik Ordubadi də belə bir ədəbi mühitdə yetişmiş və bu şairlərin əhatəsində yazıb yaratmışdır.

Salik Ordubadi haqqında ilk məlumata Məhəmmədəli Tərbiyətin «Danişməndani-Azərbaycan» adlı təzkirəsində rast gəlirik. Məhəmmədəli Tərbiyət bu əsərində «Salik» təxəllüslü şairlər sırasında Salik Ordubadinin də adını çəkmiş və haqqında çox bəsit məlumat verərək yazmışdır: «Salik Ordubadi – hicri-qəməri XIII əsr (miladi XIX) söz ustalarındandır. Onun şeirləri türk dilindədir».[1]

[1] Бах: Мящяммядяли Тярбийят. Данишмяндани-Азярбайжан. «Азярняшр», Бакы, 1987, сящ. 292

M.Tərbiyət çox güman ki, Salikin əlyazma divanından xəbərsiz olduğundan onun əsərlərinin yalnız türk dilində olduğunu söyləmişdir. Halbuki şairin əlimizdə olan divanı həcmcə çox geniş olub, həm türk, həm cığatay, həm də fars və ərəb dillərindədir. Bu divanı ilk dəfə Ordubadın tanınmış maarif xadimlərindən olan mərhum Əli Qənbərli tapmışdır. 25-30 il bundan öncə Ordubadın Xanəgah (indiki Xanağa) kəndindəki qədim müqəddəs pir uçmuş və oradan xeyli kitablar çıxmışdır. Əli Qənbərli ərəb əlifbasını bildiyi üçün həmin kəndə dəvət olunmuş və pirdəki kitabların içərisindən Salikin də divanını tapıb öz arxivində saxlamışdır. Bu divanın fotosurətini mən sonralar doktorluq mövzumla («XIX əsr Ordubad ədəbi mühiti») əlaqədar olaraq çox çətinliklə əldə etmiş və çapa hazırlayıb Təbrizdə əski əlifba ilə nəşr etdirmişəm.[1] Divanın fotosurətini mənə hörmətli alimlərimizdən olan mərhum Yolçu Piriyev vermişdir. Bu lütfkarlığına və xeyirxahlığına görə allahdan ona rəhmət diləyirəm. Məzarı nurla dolsun.

Məhəmmədqulu Salik öz divanını «Gülşəni-vəhdət» adlandırmışdır. Şair özü divanının yazılma tarixi haqqında «Qiteyi-lətifə» adlı bir şerində məlumat verərək yazırdı:

«Gülşəni-vəhdət»i yazmaqdan ötrü
Gülşəni seyr etməyə çıxdım.
Peyğəmbərin hicrətindən 1200 il keçirdi,
Bunu dörd fəsldə nəzmə çəkdim.
Yeddini yetmişə əlavə elə,
Ta haqqın kamalı yerinə yetişsin.
Sevinc gətirən, ürək açan bağ,
Dolandıqja hamıya sevinc bağışlasın.
Bu, kəmtər, mühəqqirin ərmağanı,
Salikin səfərdən sonra töhfəsidir.
O dostlara ki, sədaqətli olalar,
Onlara yox ki, sədaqətsiz və zalım olalar.

Bu məlumatdan aydın olur ki, Salik öz divanını hicri-qəməri tarixinin 1277-cu ilində tərtib etməyə başlamışdır. Divanın ərəbjə yazılmış «Xatimə» hissəsindən isə əsərin hicri-qəməri tarixinin 1280-cu ilində tərtib edilib tamamlandığı aydın olur. Salik özü bu haqda məlumat verərək yazır: «Mən fərağat hasil elədim bu kitabın təlifindən və yazılmasından ki, bu nüsxeyi-şərifənin adı «Gülşəni-vəhdət»dir. Bu kitab çox günahkar, çox düşkün, çox həqir və fəqir olan, Allahın yolunu gedən və Allahın ipindən tutan Məhəmmədqulunun yazdıqlarındandır ki, təxəllüsü «Salik»dir. Bu Salik həqiqət yolunun salikidir. Ona görə də rəbbül aləminin rəhmətinə möhtajdır ki, Allah rəhmət eləsin, Allah bağışlasın. Kərbəlayi Əbdülhüseyn Xaturinin oğludur ki, Allah ona da rəhmət eləsin. Və bu kitabı da rəcəbül mərjəb ayında Allahın köməyi ilə peyğəmbərin hicrətinin 1280-cu ilində yazdım ki, Allah ona və onun xanədanına minlər səlamu səlavat göndərsin».

Bu məlumatlar təsdiq edir ki, Salik öz divanını hicri-qəməri tarixinin 1277-1280-cu illərində tərtib edib tamamlamışdır.

Salikin həyatı haqqında əlimizdə əsaslı məlumat yoxdur. Lakin şairin Xanəgah kəndində yaşayan varisləri, yaxın qohumları və kəndin qojaman sakinləri onun ilk təhsilini ata babasının yanında aldığını, sonra Ordubaddakı mədrəsədə oxuduğunu, daha sonra isə İranda ali ruhani təhsili aldığını söyləyirlər. Salikin anadan olma və vəfat tarixləri də dəqiq məlum deyildir. Lakin şair divanına daxil etdiyi «Qiteyi-lətifə» adlı şeirində özünün qojalıq çağlarında əsərini Necə qələmə almasından bəhs edərkən yaşının 55-dən yuxarı olduğunu qeyd edir. Bu isə təsdiq edir ki, Salik 1277-cu ildə divanını tərtib etməyə başlayan zaman onun yaşı 55-dən yuxarı, yəni 56-ya yaxın imiş. Belə olduqda 1277-cu il tarixindən, Salikin özünün dediyi kimi, yaşının 55-56 olması rəqəmini çıxsaq, o zaman onun anadan olduğu vaxt hicri-qəməri tarixinin 1221-1222-cu illərinə təsadüf edir ki, bunu da miladi tarixinə çevirdikdə Salikin anadan olduğu tarix 1806-jı ilə düşür. Lakin şairin neçəncu ildə vəfat etməsi naməlumdur.

---

[1] Бах: Дивани-Салик Ордубади (Tərtibçi və çapa hazırlayanı f.e.d. Ə.N.Qədimov). «Мцяссейи-чап вя няшри-Щади, Тябриз, 2001-жи ил.

Salikin farsca qələmə aldığı şeirlərindən də onun həyatı haqqında müəyyən məlumat əldə etmək olur. Şair farsca qəzəllərində Səlma adlı bir gözəlin adını çəkir və ona olan eşqini tərənnüm edir:

Oftad nəzəre ma ra bər areze Səlma duş,
Xal xətte roxsarəş be ribud ze xater huş.

Tərc.: Dün gejə gözüm Səlmanın arizinə düşdü,
Onun xəttü xalı mənim huşumu oğurladı.

Başqa bir qəzəlində də şair həsrətində olduğu Səlmanın adını çəkir və onu sevdiyini bildirir:

Deləm hobbe rəhe Səlma gereftəst,
Movəddət dər dərunəm ja gereftəst.

Tərc.: Ürəyim Səlmanı sevmə yolunu tutub,
Onun sevgisi ürəyimdə yer tutub.

Bu nümunələr təsdiq edir ki, Salik gənclik yaşlarında Səlma adlı bir qızı sevmiş və onun eşqi ilə aşiqanə qəzəllər yazmışdır.

Salik şeirlərində özünün yaşadığı məkan haqqında da məlumat vermişdir. O, farsca yazdığı bir şeirində özünün doğulduğu Xanəgah kəndinin adını çəkməsə də, Araz qırağında (Ordubad ərazisində) yaşamasına işarə edərək yazırdı:

Şükrəlilləh şod moqime sahele rude Ərəs,
Kəz ələstəm in təmənna əzme xater budo bəs.

Tərc.: Allaha şükr olsun ki, mən Araz qırağında yaşayıram,
Əzəl gündən də istəyim anjaq bu idi.

Şair «Vənəndin tərifində qəsidə» adlı əsərində də Ordubadın Vənənd kəndinin təbiət gözəlliklərini nəzmə çəkmiş, öz vətəni olan Xanəgahı da digər qonşu kəndlərlə birlikdə tərənnüm etmişdir.

Salikin yaradıcılığı zəngin və əhatəlidir. Şairin «Gülşəni-vəhdət» adlı divanı təsdiq edir ki, o, zəmanəsinin yetkin qələm sahiblərindən olmuş, ali ruhani təhsili aldığı üçün fars, ərəb və cığatay dillərini mükəmməl bilmişdir. Salik klassik Şərq şairlərini dərindən mütaliə etmiş, Sədi, Hafiz, Xəyyam, Jami, Nizami və Füzuli kimi sənətkarların ədəbi irsini, o cümlədən klassik Şərq fəlsəfəsini dərindən mənimsəmişdir. Məhz bunun nətijəsidir ki, şairin ədəbi irsini mövzu və ideyasına görə iki istiqamətdə qruplaşdırmaq olar. Birincu qrup şeirləri klassik üslubda yazılmış qəzəl, qəsidə, məsnəvi, tərcu-bənd, tərkibbənd, rübai, müxəmməs, təxmis, müləmmə, təzmin, qitə, lətifə, saqinamə və ibrətnamələrdən ibarətdir. Bu qrupa şairin dini şeirləri də daxildir ki, bu şeirlərinin çox qismi Həzrət Əli (Ə)-ın və imam Mehdi Axirəzzəmanın mədhinə həsr olunmuşdur. İkincu qrup şeirlərinə şairin aşıq şeiri üslubunda yazılmış bayatıları daxildir.

Salik dini şeirlərində daha çox irfani mövqedə dayanmış, Həzrət Əli (Ə)-ın şiə təriqətinə söykənmişdir. Şair ilahi varlığı, «Hüsni-mütləq»i dərk etmək yolunu Həzrət Əli (Ə)-da görürdü. Onun farsca qəsidələrində Həzrət Əli (Ə) «vilayət əsmasının ən işıqlı günəşi, həqiqət sirrinin məhrəmi, təriqətin yol göstərəni və şəriətin rəhbəri» kimi səcuyyələndirilir:

Baise ijade aləm xelqəte movla Əlist
İlləte mövcude adəm tinəte əla Əlist…
Anke vəjhollah minaménd erfanol meləl,
Şəmse əsmaye velayət nəyyere əla Əlist…
Dər təriqət rəhnomavo dər şəriət moqtəda,
Məhrəme serre həqiqət, fərde bihəmta Əlist.

Tərc: Aləmin ijadına mövla Əlinin xilqəti vasitədir,
Adəmin vücuda gəlməsinin torpağına vasitə Əlidir.
O kəs ki, dinlərin irfanında vəjhullah deyərlər,
Allahın məhəbbət adlarının ən işıqlı günəşi Əlidir.
Təriqətdə yol göstərən, şəriətdə rəhbər,
Həqiqət sirrinin məhrəmi, tayı-bərabəri olmayan Əlidir.

Həzrət Əli (Ə)-ın müqəddəs dini məzhəbinə söykənən Salik farsca və türkcə qələmə aldığı irfani qəzəllərində də «hüsni-mütləq»i və onun ilahi eşqini tərənnüm etmiş,öz lirik şerlərində «vəhdəti-vücud»

fəlsəfəsini əsas götürmüşdür. Salik bir irfan şairi kimi həyata hərisliyi, dünya nemətlərinə həddindən artıq aludə olmağı rədd edir, mənəvi və əxlaqi kamilliyi hər şeydən üstün tuturdu. Onun əksər şeirlərində ilahi varlığa, Allaha sevgi təbliğ və tərənnüm olunur.

Salikin irfani görüşlərinə görə bütün mövcudat ilahi varlığın, tanrının gözəlliyinin, onun «hüsni-mütləq»liyinin ifadəsidir. Bunu anjaq Allahın müqəddəs yolunu gedən kamil və aqil insan dərk edə bilər. Salikin irfani-lirik qəzəllərində yaratdığı məftun və dərdli aşiq də əslində ilahi gözələ və gözəlliyə qovuşmağa can atan və bu yolda tanrı eşqinə mübtəla olan həqiqət yolunun salikidir. Bu fəlsəfi-lirik ideya Salikin irfani qəzəllərinin əsas istiqamətini təşkil edir:

Əzəldən mərdümi valeh qılub ol qaməti-rəna,
Qərarü səbri xatirdən alub bəs arizi-ziba.
Səhi sərvi-güləndamın gəlüb çün nazi-rəftarə.
Xürami haləti-xatir alub, qəlbi qılub şeyda.
Təjəlli eyləyən saət yüzün nuri, şəhənşahim,
Hamı mərdüm olur mail, gəlür imanə hər tərsa.
Günəş rüxsarına heyran olub bəs mərdümi-çeşmim,
Nə mərdümdür yüzün görgəj məftun olmuya lala.
Jəbinin aləmə tabi salub çün mehri-ənvər tək,
Ziya bulmuş füruğindən nə kim, aləmdə dil bulsa…

Salikin irfani-lirik qəzəllərinin müəyyən bir qismi də M.Füzulinin qəzəllərinə nəzirə şəklində qələmə alınmışdır. Bu istiqamətdə yazdığı qəzəllərində Salik təsəvvüf yolu ilə gedərək Füzulinin ədəbi-estetik və irfani mövqeyində dayanmış, XIX əsr Azərbaycan ədəbiyyatında Füzuli ədəbi məktəbinin davamçısı kimi çıxış etmişdir:

Ey səbili-eşqə talib, yetdi hatifdən nida,
Saliki-rahi-həqiqət eşqdən olmaz cüda.
Nəşəyi-kamildürür aləmdə kim, sevdayi-eşq,
Aşiqi-sadiqdür ol kim, eşqə eylər iqtida.
Bəhri-vəhdətdür məqami-eşq, aşiq ğutəvər,
Dürri-şəhvari qılub ğəvvas çox şahü gəda.
Naseha, eşq əhlini qılma məlamət, etmə tən,
Necə mümkündür ola təğyiri-təqdiri- xuda?
Kilki-qüdrət səfheyi-üşşaqə nəqş etmiş əzəl
Kim, vücudi-yar ilə olmaz vücudi-maədə.
Eşq rahi vasili-canan qılar Saliklərin,
Beylədür ol iş ki, həqq adilə olmuş ibtida.

M.Füzulinin «Yar qılmazsa mənə cövrü cəfadən ğeyri» qəzəlinə yazdığı nəzirəsində də Salik irfani yolu əsas tutaraq «hüsni-mütləq»in «rüxi-pakinin saflığını», xərabatı, meyi və saqini məscudə və sovməədə ibadət edən təzvir və riya əhlinə qarşı qoyur:

Görməyib əhli-cəfa bəndə vəfadən ğeyri,
Yetmədi xatirə anlərdə cəfadən ğeyri.
Əhli-təzvirü riya sakin olur sovməədə,
Görmədim sovməə məscuddə riyadən ğeyri.
Bir xərabatə güzər qıl, mey ilə saqiyə bax,
Rüxi-pakində görülmübdü səfadən ğeyri.
Şeş cəhət möhnəti-qəmlə doludur mülki-vücud,
Bir fərağət yeri yoq şəhri-fənadən ğeyri.
Oldu əğyar bənə yar yolunda qəmu xəlq,
Qalmadı kimsə mədədkar xudadən ğeyri.
Əzmi-kuyində könül talibi-imdaddürür,
Nidüm, əldə mədədim yoxdu duadən ğeyri.

Salika, əhli-vücudun şərəfi fəqrdü, bəs,
Kimsəyə görmə rəva ol füqəradən ğeyri.

Salikin «Söz» rədifli qəzəli də M.Füzuliyə bənzətmədir. Lakin Salik Füzulidən təsirlənsə də, özünün söz sənəti haqqındakı fikirlərini sərbəst şəkildə ifadə etməyə çalışmış, Füzulini təkrar etməmişdir. Füzulinin qəzəlində olduğu kimi, Salikin qəzəlində də sözə yüksək qiymət verilir, sözə qədir-qiymət qoymayanlar məzəmmət olunur:

Aləmə sirri-nihani faş edər izhar söz,
Gəh səmər derlər ona, gəh ləfzi-gövhərbar söz.
Bilməyən söz qədrini, bilməz nişati-javidan,
Bir göhərdür dürcüdə gər olmiyə təkrar söz.
Xabi-qəflət gər duta göftardə söz sahibin,
Hər nəfəs mümkündür ani eyləyə bidar söz.
Dilrübalıq rəsmdə bir məhvəşi-gülçöhrədür,
Göstərər ol pərdeyi-əsrardən rüxsar söz.
Xazini-gəncuneyi-fəhmi-kəyasətdür, düzər
Rişteyi-göftarə dürri-lölöi-şəhvar söz.
Bəhri- sözdə olmiyən ğəvvas təhsil eyləməz
Mərifət lövhündə yeksər gövhəri-rəftar söz.
İzzət istərkən, sözdən az eylə, Salik, dəhr ara
Kim, çox olmaqla qılıbdur sahibini xar söz.
Söyləmə əfsanə çoq də, bilgilən söz qədrini,
Ləğləği dirlər kişi gər eyliyə təkrar söz.

Salikin «Ey həkim», «Olubam», «Nədir?», «Bənim», «Sana», «Bu gejə» və sair rədifli qəzəlləri də Füzuliyə bənzətmə şəklində yazılmışdır.

Şairin qitə və qəsidələrində də Füzuli lirikasının güclü təsiri duyulur. Məsnəvi üslubunda qələmə aldığı sücetli qitəsində Salik M. Füzulinin «Leyli və Məcnun» əsərindən təsirlənmiş və Ərmənzəmin məmləkətində aşiq olduğu bir gözələ bəslədiyi məhəbbətini nəzmə çəkmişdir. Klassik Azərbaycan poemalarında olduğu kimi, Salik də bu məsnəvisində aşiqin səba yeli vasitəsilə məşuqəsinə namə göndəməsi sücetindən istifadə etmişdir. Əsərin ümumi üslubu və aşiqin Şimal küləyi vasitəsilə sevgilisinə namə göndərməsi süceti təsdiq edir ki, Salik həm Füzulinin «Leyli və Məcnun», hə də Şah İsmayıl Xətainin «Dəhnamə» poemalarından bəhrələnmişdir. Ərmənzəmin məmləkətini nazənilər diyarı hesab edən şair hicran və ayrılıq sitəmindən çəkdiyi qüssə və kədərini sevgilisinə bildirmək üçün Şimal küləyini elçi göndərir:

Ey badi-Şimali-ənbərindəm,
Vey peyki-şəhənşəhi-müəzzəm.
Qıl bir güzər Ərmənin zəminə,
Seyr eylə diyari-nazəninə
Kim, andədür ol bənim pənahim,
Şahim, şərəfim, ümidgahim.

Sonrakı beytlərdə Füzuli üslubuna yaxınlıq daha da qüvvətlənir. Biqərar aşiq məşuqəsini sultana, özünü isə «fəqiri-binəvaya» bənzədərək «keyfiyyəti-hali yarə söyləməyi» Şimal küləyindən iltimas edir:

Eyşi-dilü cani-biqərarım,
Sərmayeyi-izzü iftixarım.
Soltanə səna yetür gədadən,
Qıl ərzə fəqirü binəvadən.
Razi-dili ol nigarə söylə,
Keyfiyyəti-hali yarə söylə.
Ərz eyləgilən ki, ey vəfadar,
Key xosrovi-adilü nikukar.
Əxlaqına etimad edərdüm,

Bu əzmlə könlü şad edərdüm.
Şayəd olasən bənimlə həmraz,
Pünhan ola aşikar olan raz.
Netdüm sana, qəsdi-canım etdin?
Zari-dili-natəvanım etdin.
Hicrində dilim kəbab olubdur,
Göz kəştisi qərqi-ab olubdur.

M.Füzulinin «Leyli və Məcnun» əsərində Leylinin Ay ilə söhbəti səhnəsində də eyni mənzərə ilə qarşılaşırıq. Məcnundan xəbər tutmağa çalışan Leyli də eynilə Aya xitab edir və onun «hər diyara seyr edib» Məcnundan xəbər gətirməsini istəyir:

Qıl şöleyi-ahimə nəzarə!
Gər var isə rəhmin, eylə çarə!
Seyr eylə fəzayi-hər diyari!
Gəz cümleyi-dəştü kuhisari!
Gör qandadır ol mənim pənahim,
Şahim, mahim, ümidgahim!
Hali-dilim ona ərz eylə,
Billah, Necə gördün isə söylə!

Lakin Salikin qitəsində sücet xətti çox bəsitdir. Sevgilisinə Şimal küləyini elçi göndərən aşiq-şair öz iztirablarının bədii təsvirini verdikdən sonra özünü Şimal küləyinin vasitəsilə səhra və biyabana düşüb eşq əlindən fəzanı seyr edən Məcnunsayağı dərdli aşiq kimi təqdim edir və məsnəvi üslubu aşiqin dilindən deyilən:

Can zardu, dil nizar sənsiz,
Canü dil olub fikar sənsiz.

- beytli qəzəl ilə tamamlanır.

Salikin Füzuli mövzularına pərəstiş etməsi təsdiq edir ki, o da özünün sələfləri olan Saib Təbrizi və Qövsi Təbrizi kimi şairlərin yolu ilə getmiş və poeziyada Füzuli ənənələrini yaşatmışdır.

Salikin lirikasında real həyati eşqin təsvir və tərənnümü də mühüm yer tutur. Həyati gözəllərin tərənnümünə həsr olunmuş qəzəllərində Salikin irfani və təsəvvüf görüşlərinə rast gəlmirik. Bu ruhlu realist qəzəllərində aşiqin ictimai və şəxsi kədərinin, həmçinin aşiqinə naz-qəmzə satan sitəmkar məşuqənin daxili və zahiri aləminin təsvir və tərənnümü verilir:

Ey gözüm, bu gözəlin işvəsinə, nazinə bax,
O səhi qamətinə, peykəri-tənnazinə bax.
Tutiyi-nitqini gör, ləblərinin şəkkərini,
Ləli-meyguni ilə püsteyi-dəmsazinə bax.
Sədəfi-gövhər ara dürri-xoşabinə göz et,
Günəş üzlü gülünün qönçeyi-həmrazinə bax.
Həbəşi-zülfünü gör, Rumə şəbixun gətürüb,
Tiği-xunrizi ilə navəki-pürtabinə bax.
Ənbərin türrəsinün gör girehi-piçü xəmin,
Qərəquş çəngi kibi yırtıjı tırnaqinə bax.
Kəbki-dil qəsdinə qəynaqin edüb tiz üqab,
Cangəza ərsədə bir çərxiyi-şəhbazinə bax.
Salika, nazini çək, təlxiyi-göftarun unut,
Sən onun ləhjəsinə, sövti-xoş avazinə bax.

Salikin aşiqanə məzmunlu dördlüklərində də dərdli aşiq sevgilisinin «məhi-rüxsarinə» məftun olan və hər zaman onun naz-qəmzəsini çəkən lirik qəhrəman kimi təqdim olunur. Bu lirik qəhrəmanın nəzərində onun məftun olduğu gözəl adi gözəllərdən deyildir. Bu gözəl «şəq-qül-qəmər» olub yerə düşmüş ay parçasıdır. Odur ki, qəmli aşiq hər zaman bu məhliqanın nazını çəkməyə hazırdır. O, hətta öz məşuqəsini onu rəsm edən rəssama da qısqanır:

Atəşi-həsrəti-ruyin dili-əfkarə düşüb,
Ol zəman kim, nəzərim ol məhi-rüxsarə düşüb.
Görgəj ol mahliqanı nəzər etdüm qəmərə,
Gui şəqqül-qəmər olmuş, yerə məhparə düşüb.

Müsəvvir, yar təsvirin çəkərsən, çəkmə sən nazin,
Məhəlli-ğəmzü nazində xəbər ver, mən çəkim nazin.
Müradi-hali-aşiqdir, çəkər nazini məşuqin,
Neşün biganələr çəksün nigari-nazənin nazin?

Salikin ədəbi irsi içərisində şifahi xalq şeiri üslubunda qələmə alınmış bayatıları da vardır. Lakin şairin bayatıları özünün poetik üslubu və yazılış tərzinə görə xalq bayatılarından seçilir. Belə ki, xalq bayatılarından fərqli olaraq Salikin bayatılarının ilk iki misrası sonrakı misralar üçün hazırlıq vəzifəsi daşımır və dörd misranın hamısı bütövlükdə bir fikrin ifadəsinə xidmət edir. Bütün bayatılar isə ənənəvi xitabla başlanır:

Aşiqəm gül rüxsarə,
Salma bürqə üzarə,
Hicrin məni öldürər,
Qılmasan dərdə çarə.

Fidyəsidür dilü can,
Gər qəbul edə canan,
Çəkərəm rəhgüzarə,
Kəsərəm canı qurban.

Bu isə təsdiq edir ki, Salik bayatılarını xalq şeiri şəklində qələmə alsa da, klassik yazılı ədəbi üsluba söykənmiş və poetik vəhdət prinsipini gözləmişdir. Şairin bayatılarında işlənən ərəb və fars tərkibli izafət birləşmələri də sənətkarlıq baxımından klassik əruz üslubuna yaxınlığı təsdiq edir:

Aşiqəm mahi-ruyə,
O zülfi-mişkbuyə,
Neşün, bağlıdı könlüm
Təsəlsüli-giysuyə.

Lakin buna baxmayaraq Salikin bayatılarında dil sadəliyi və xəlqi məzmun da qüvvətlidir. Şairin bir çox bayatıları dilinin sadəliyi və xəlqi ruhu etibarı ilə xalq bayatılarını xatırladır:

İtirmişəm cananı,
Jismimdə olan canı,
Yaralı ahu kimi,
Gəzərəm biyabanı.

Aşiqəm gül yüzünə,
Səmən sünbül yüzünə,
Salma türrə ənbəri
Bürqə o gül yüzünə.

Salik öz yaradıcılığında bu cür xəlqi məzmunlu bayatılara müracuət etməklə şifahi xalq şeiri üslubunu yazılı poeziyaya gətirmiş və XIX əsr Ordubad ədəbi mühitində klassik lirika ənənələri ilə şifahi xalq şeiri üslubunu qovuşdurmuşdur.

Deyilənlər təsdiq edir ki, XIX əsr Ordubad ədəbi mühitinin nümayəndələri Azərbaycan ədəbiyyatının inkişafında mütərəqqi xidmət göstərmiş, Salik Ordubadi də bu ədəbi mühitdə xüsusi yer tutmuşdur.

**Əsgər QƏDİMOV**
***Filologiya elmləri doktoru, professor***

Mahi-çöhrən maili-xurşidi-rəxşandır sana.
Ey mələkmənzər, camalun didəmi heyran edib,
Maili-hüsni-bədiün həm dilü candır sana.
Kim ,mətai-ömri sərfi-rəhi-canan eyləmək,
Vəh, nə layiq fidyə, hər dəm cövhəri-candır sana.
Zindeyi-cavid görəmməz qıymiyən canın sana,
Can mətai-cavidandır,ol ki, qurbandır sana.
Aləmə şəm'i-camalun atəşi-suzan urub,
Nari-eşqində dili-pərvanə suzandır sana.
Rahi-eşqində nə müşkül aşiqin can versə gər,
Ruhbəxşi-mürdəsən, can vermək asandır sana.
Mahi-ruyin türreyi-mişkinlə bir məhcub qıl
Kim, yəman gözdən həzər qıl, dəgsə, nöqsandir sana.
Padşahi-hüsnsən,hüsnün yaşur biganədən,
Dideyi-məftunə göstər, bəs ki heyrandır sana.
Key şəhi-xuban, di gəl təhvildarə tabşurum
Nəqdi-cani, bil ki, can bir bəndə fərmandır sana.
Salika, cananə vermək can mədari-eşqdir,
Sərfi-canan eyləmək cani nə nöqsandır sana.

□□□

Ey pərivəş, xublər yeksər ola qurban sana,
Tələtün görgəc göz oldu valehü heyran sana.
Pərtövi-mehri-rüxün dil kişvərin dutqalı,
Bəndə fərmandur rəhində həm dilü həm can sana.
Qılma pünhan mah rüxsarun gözümdən, ey sənəm,
Bəs ki məftundur əzəldən mərdümi-insan sana.
Məhi-üzarun türreyi- ənbərlə gəh məstur qıl,
Bəd nəzərdən qıl həzər kim, gəlməsün nöqsan sana.
Qamətin rəftarı heyran eylədi məftun dili,
Bənzəməz şümşadi-qəddü sərvi-nəxlistan sana.
Mehri-rüxsarun füruz etdi çü bəzmi-aləmi,
Aşiqi-ruyindürür çeşmi-məhi-rəxşan sana.
Şöhrəti-hüsnün cahan bazarını pürşur edüb[1],
Hər görən aşiqdürür çün Yusifi-Kən'an sana.
Salika,bu dilbərin eşqi-rəhin mərdanə dut,
İltifat ilə nəzər qılmış bu gün canan sana.

□□□

Ey səbili-eşqə talib, yetdi hatifdən nida,
Saliki-rahi-həqiqət eşqdən olmaz cüda.
Nəşeyi-kamildürür aləmdə kim, sevdayi-eşq,

Aşiqi-sadiqdür ol kim, eşqə eylər iqtida.
Bəhri-vəhdətdür məqami-eşq, aşiq qutəvər,
Dürri-şəhvari qılıb qəvvas çoq şahü gəda.
Naseha, eşq əhlini qılma məlamət, etmə tə'n,
Necə mümkündür ola təğyiri- təqdiri- Xuda.
Kilki-qüdrət səfheyi-üşşaqə nəqş etmiş əzəl
Kim, vücudi-yar ilə olmaz vücudi-maəda.
Eşq rahi vasili-canan qılar Saliklərin,
Böylədür ol iş ki, həqq adilə olmuş ibtida.

□□□

Əzəldən mərdümü valeh qılıbdur qaməti-rəna,
Qərarü səbri xatirdən alub bəs arizi-ziba.
Səhi-sərvi-güləndamın gəlüb çün nazi-rəftarə,
Xurami haləti-xatir alub, qəlbi qılub şeyda.
Təcəlli eyləyən saət yüzün nuri, şəhənşahim,
Hamı mərdüm olur mail, gəlür imanə hər tərsa[2].
Günəş rüxsarinə heyran olub bəs mərdümi-çeşmim,
Nə mərdümdür yüzün görgəc məftun olmiyə lala.
Cəbinin aləmə tabin salub çün mehri-ənvər tək,
Ziya bulmuş füruğindən nə kim, aləmdə dil bulsa.
Bəsani-bədr olub kamil camalun hüsni-surətdə,
Nə nəqşi-surətü məna yüzündə cəmdür guya.
Nə cadudur rəhi-məkri-füsuni kim, dutar hər dəm,
Sükunü səbri xatirdən alur qəmzilə ol şəhla.
Xəti-mişkini-ruyindən nişati-dil olur hasil,
O xali-ənbərinindən cəlayi-basirə peyda.
Nə türrə dami gör qurmuş genə türki-cəfapişə,
Salub hər dəm dili damə kəməndi-zülfi-ənbərsa.
Alur arami-dil, Salik, şüküftə qönçeyi-ləli,
Təbəssümlə qılır hər dəm bu məftun xatiri şeyda.

□□□

Maili-hüsnün olub dideyi-xatir, sənəma,
Etmə pünhan yüzünü, qılma dəxi qəlbə cəfa.
Nisbət etməm yüzünü şahidi-xur çöhrəsinə,
Bənzəməz arizinə bəs ki rüxi-mehri-səma.
Afitabi-rüxünə valeh olub dideyi-dil,
Gün yüzünə nəzəri-mərdümi-çeşmim nə rəva.
Məhi-üzarin çü münəvvər eylədi bəzmi-dili,
Xürrəmi-xatir edüb bəs ki gözə verdi cəla.
Məhfili-xatiri rövşən elədi mahi-rüxün,
Sinəyə tab yetüb kişvəri-can buldu ziya.
Qədəhi-nərgisi-məxmuri gətür əncümənə,
Şuxi-məstin sitəmindən dilimi eylə rəha.
Gözü məftun eləyüb badeyi-meyguni-ləbün,
Feyzi-səhba ilə ver xatirə bir zövqü səfa
Sağəri-lə'li-ləbin zövqi ilə məsti-diləm,
Cürəbəxşi-ləbi-təşnə çü olub cami-ziya.

Saliki cövri-meyi-lə’lin edib xəstəcigər,
Nolur ol saf zülal ilə yetə qəlbə şəfa.

□□□

Mərdümi-çeşmim müfəttəndür güli-gülzarına,
Təşnədür xatir zülali-lə’li-şəkkərbarına.
Gülşəni-hüsnün alubdur bəs şəkibayi-dili,
Dideyi-dildür müfəttən arizi-gülnarına.
Səbrü aramü sükuni aldı gülbərgi-lətif,
Ol zaman kim, göz sataşdı gülbüni-rüxsarına.
Zülfi-mişkinün şəkibasında dil məskən dutub,
Çün giriftar oldu xatir türreyi-tərrarına.
Qaməti-rəna xurami aldı arami-dili,
Mail etdi mərdümi çün sərvi-cuyibarına.
Ol rüxi-zibanı görgəc huş başdan çıxdı kim,
Bəs ki, nuri-basirə yetdi rüxi-gülzarına.
Cilvəgər oldu səhər gülşəndə bəs sərvi-səhi,
Valeh oldu göz genə tərzi-çəmi-rəftarına.
Nitqlə şəhdi-ləbin şəkkərfüruş olmuş dilə,
Mail etmiş Saliki şəhdi-şəkkər göftarına.

□□□

Dil əsiründür, kəməndi-türrə qurmuş dam ona,
Bir qədəhdür nərgisin, məxmur dutmuş çam ona.
Sağəri-ləli-ləbindür zövqi-dil peymanəsi,
Gör nə meygun ləldür, müştaq olubdur kam ona.
Zülfi-mişkin sayəsini aşiyan qılmış xəyal,
Xali-mişkini ğəza eylər səbahü şam ona.
Qaməti-xəm mö’təkifdür dərgəhində salü qərn,
Taqi-mehrab eyləmiş əbruyi-qövsi fam ona.
Navəki-qəmzəndürür qəsdi-dili-aşiq edüb,
Tiri-xunriz ilə çəkmişdür yenə səmsam ona.
Gülşəni-rüxsardən dil kişvəri pürtab olub,
Gör necə gülzardür, atəş qoyulmuş nam ona.
Silki-əhli-halə çəkmiş zahidi əşki-riya,
Məzhəbi-üşşaqdə derlər zəhi, bədnam ona.
Zöhd rəsmin tərk edübdür, saqiya, Salik bu dəm,
Kol meyi-gülrəngdən tanrı üçün dut cam ona.

□□□

Ya rəb, hidayət eylə təriqi-hüda bana,
Kol şivədə muraddur ol müqtəda bana.
Şəmsi-hüdavü hadiyi-rəh, xatəmi-rüsül,
Şol rəhbəri-yəqinim ola pişva bana.
Biganədən əlaqəmi kəs, qəti-üns qıl,
Yekrəng əsdiqalərin et aşina bana.
Bu dəlvi-xövfdə ki, xətərdür kənarəsi,
Xızri dəlil qıl ki, ola rəhnüma bana[3].
Vər hüsni-xülq yoxdur, vəli hüsni-zənn var,

Əhsən sana ,bu zənnilə versən cəza bana.
Bən bilməzəm bu çareyi-dərdi-dili, təbib,
Qıl çarə dərdimə, o ki, olsa dəva bana.
Sənsən təbibi-haziqü dərdə dəva verən,
Ya zəhr ola və ya şəkər, olur dəva bana.
Rahi-həvadə Saliki qoyma əsiri-nəfs,
Bu rahdə inayətün eylə əta bana.

□□□

Hüsnünü görməgə gün aşiqi-səyyarə düşüb,
Dideyi-şövqi rəhi-eşqinə nəzzarə düşüb.
Təl'ətün görməklə zövin edüb sərfi-rəhün,
Gör nə sərgəştədü kim,hər dərü divarə düşüb.
Arizin həsrəti məh köksünü pürtab qılub,
Rəhi-eşqində müfəttən dili səd parə düşüb.
Tələbində həme şəb çərxilə heyran gəzüşür,
Şövqi-didarilə çün didə o rüxsarə düşüb.
Kim, neçə qərndü sərgəştə gəzər bədri-münir,
Maili-hüsndü bəs müztərü biçarə düşüb.
Gəh məhaqə yetişür, lağər olur, gah hilal,
Necə şuridədü gör kim, belə rəftarə düşüb.
Sübhgəh Zöhreyi-çəngi çü görüb arizini,
Xatiri rəqsə gəlüb, gör nə əcəb karə düşüb[4].
Səfheyi-çərxə yazub vəsfini küttabi-qədər,
Oldürür kilki-Ütarid xəti-zəngarə düşüb[5].
Gör nə məftundur o gülçöhrəyə Keyvani-fələk,
Kuyi-eşqə girəli çərxdə avarə düşüb.
Kişvəri-hüsnünü fəth etməgə Bəhrami-səma,
Tiği-zərrin ilə gör kim, nə zəfərkarə düşüb[6].
Peykərün nəqşini Bərcis çəküb lövhi-dilə,
Əksi-rüxsarinə gör kim, necə nəzzarə düşüb[7].
Xameyi-Salik açub mədhətinə vəsfi-dilin,
Səbəb oldur ki, sözü dəhrdə göftarə düşüb.

□□□

Saqiya, sağəri-lə'lün gözü məftun eyləyüb,
Qəmi-səhbayi-rüxün xatiri məhzun eyləyüb.
Qədəhi-nərgisi-məxmurun alub səbri-dili,
Cami-meyguni-ləbin könlümü pürxun eyləyüb.
Pərtövi-mahi-rüxün mərdümi heyran qılalı,
Sağəri-arizi-gül qəlbi digərgun eyləyüb.
Fərəhəfzayi-könül oldi o gülbərgi-lətif,
Dili-şuridə zülali-ləbi meygun eyləyüb.
Zülfi-mişkinün olub silsileyi-xəti-raz,
Qüllü zəncirə çəküb könlümü, məscun eyləyüb.
Şövqi-didari-səbuhi alub arami-dili,
Zövqi-peymaneyi-ləb qəlbi çü məşhun eyləyüb.
Cürəbəxşi-ləbi-rindan olalı badeyi-nab,
Möhnəti-hicrlə məftun dili məğbun eyləyüb.

Salika, şövqi-rüxi-badeyi-məhvəş necə gör,
Dili pürtab qılub, bəs ki cigərxun eyləyüb.

□□□

Mehri-rüxsarın çü saldı çöhrədən zərrin niqab,
Çəkdi rüxsarin hicabi-əbrə qürsi-afitab.
Vəh, nə surət, mərhəba, ey sün'i-kamil məzhəri,
Kol məhi-rüxsardən bir zərrə nuri-afitab.
Mahi-ruyin pərtovündən şərm edüb cirmi-hilal,
Çöhreyi-namusinə zivər qılub gülgun səhab.
Əksi-ruyundur zücaci-əxzəridə cilvəgər,
Sübhgəh xavərzəmindən göstərən yüz afitab.
Eylədi əfruğ çün ləli-ləbin aləmləri,
Ləli-rüxsarinə şərmindən çəküb səngin niqab.
Rişteyi-mənzumi-dəndanın göhərtək müntəzəm,
Guya lövhi-sədəf düzmüş telə dürri-xoşab.
Yəxşi saətdə qədər kilki çəkübdür peykərün ,
Eliyüb məcmueyi-məhbublərdən intixab.
Rahi-eşqə bir qədəm qoy ,Salik, eylə ciddü cəhd,
Meyli-vəsli-dilbər etsən, qıl təkapu, et şitab.

□□□

Möhnəti-hicri-rüxün cani-dili zar eliyüb,
Təl'ətün cövrü qəmi çeşmimi xunbar eliyüb.
Çün nihan oldu gözümdən güli-gülzari-ruxun,
Xəstəxatir könülü möhnəti-gülzar eliyüb.
Sayə başdan çü kənar etdi səhi-sərvi-qədin,
Tabi-dil xatiri gör kim, nə şərərbar eliyüb.
Şikəni-zülfi-təsəlsül dili zəncirə çəküb,
Ənbərin türrəni çün qeydi-dili-zar eliyüb.
Qədəhi-nərgisi-məstin çü verüb zövq dilə,
Sağəri-lə'li-ləbi gör nə giriftar eliyüb.
Şur saldükdə başə badeyi-meyguni-ləbün,
Ləbi müştaqi-meyi-lə'li-şəkkərbar eliyüb.
Çeşmeyi-nuşirəvan bəs eliyüb abi-Xızır,
Ləbi-məftuni zülalə nə xəridar eliyüb.
Saqiya, kamrəva qıl ləbimi sağər ilə,
Şövqi-səhbayi-ləbin Saliki əfgar eliyüb.

□□□

Məhi-rüxdən məhvəş alub çün niqab,
Dəhri dutub şəşəeyi-afitab.
Arizə bəs türreyi-şəb rəngini,
İsmətü zib içrə salubdur niqab.
Qət qılub rişteyi-ömrüm bu gün,
Bəs ki salub zülfi-səmənsayə tab.
Gör necə məstanə çıxub qənşərə,
Əzm eliyüb aləmi qılsun xərab.
Qəti-nəzər eyliyüb üşşaqdən,

Ahi-səhərdən eyləməz ictinab.
Atəşi-ahım fələki yandurur,
Hicri-şəbində sənün,ey mahtab.
Taqətimi əldən alubdur qəmin,
Ver bana qəm dəfinə, saqi, şərab.
Saliki-sərgəştəyə bir rəhm qıl,
Hiç gərəkməzmi sana bir səvab?

□□□

Bir kuyi-eşqə gəl, könül, rəsmi-rəhi-fərzanə dut,
Gir xublər sevdasinə, leykin rəhi-cananə dut.
Ol bir səməndər eşqdə, yax atəşə canü dili,
Şəm'i-rüxi-cananı gör, tərzi-rəhi-pərvanə dut.
Leyla yolunda Qeystək məcnun olub səhrayə çıx,
Hamuni məskən eliyüb, eşq rəhin mərdanə dut.
Kuyi-vəfayə qoy qədəm, sal başə şuri-dilbəri,
Nari-həva tök bir dilə, atəşdə bir qəmxanə dut.
Deyri-muğandə nəqşi-büt aldı qərarü səbri-dil,
Təcrid rahin al ələ, bütxanəni kaşanə dut.
Qoy bir xərabatə qədəm, keç nənglə namusdən,
Tərk eylə kişi-zahidi, gəl bir rəhi-rindanə dut.
Saqi, dilim pürtabdür, məh badəsin tez ver ələ,
Sağər, ləbi-meygundən bir də ləbi-peymanə dut.
Səhbayi-lələ saf mey tök tüngdən, ləbriz qıl,
Xümi-ələstdən xatirə bir badeyi- məstanə dut.
Mütrüb, götür çəngi ələ, bir rəqsə gəl, yox hali-dil,
Sazü sürudi saz elə, bir künci-işrətxanə dut.
Guşi-dilə yetdi nəva mizmardən vəqti-səhər,
Salik, sürahi al ələ, bir də rəhi-meyxanə dut.

□□□

Tanrı içün bu füsürdə cismimə qıl iltifat,
Sən Məsihi-vəqtsən, ver ləbləründən bir həyat[8].
Mümkün olmaz ləblərün vəsfini təhrir etməgə,
Abi-heyvan kilki-zülmatilə qılsa münşəat.
Taqi-əbruyin dili-məftunə mehrabi-dua,
Layiqi-səcdə bulunmaz qeyri-mehrabi-səlat.
Xatiri-miskindən kəsmə cəmalın sədqəsin,

Şər'i-ayinində bəs fərzi-məsakindür zəkat.
Aşiqin imanə gəlməz dərki-mə'şuq etməsə,
Gər ola məb'us Musa, göstərə yüz möcüzat[9].
Sün'i-qüdrətdə vücudun məzhəri-kamildürür,
Zati-pakin illəti-fitrətdür, əsli-kainat.
Cövhəri-zatində bəs ki cəmdür cümlə sifat,
Qanda var aləmdə sən tək birlə bir kamil sifat?
Eşq sevdasinə düşdün, Salika, qatlan bu dəm,
Bəs ki qeydi-eşqdür dami-təəllüqdən nicat.

□□□

Xublər içrə görülmübdü sənüntək həsənat,
Dilrübaliqdə qanı sən kimi şirinhərəkat.
Bənzəməz neyşəkərə qamətün, ey sərvi-səhi,
Bəs ki lə’lün yetirüb xəstə ləbə abi-nəbat.
Çünki əbruyin olub qibleyi-ərbabi-vəfa,
Oldürür taqi-cəbindür dilə mehrabi-səlat.
Hüsnün avazəsi çün yetdi könül kişvərinə,
Dili məbhut elədi şövqi-rüxün, xatiri mat.
Zövqi-dil badəsi oldu çü ləbün səhbasi,
Meyi-nabindən anındır ləbimə abi-həyat.
Lövhi-dildə görünür surəti-ruyin, sənəma,
Çün zücaci-dilimi məzhər edüb əksi-sifat.
Xəstə xatirlərə şərbət çü olub safi-zülal,
Axtarar abi-Xızır şərmilə rahi-zülümat[10].
Çü sənaxani-rüxün Salik olub, bəhri-dili
Düri-şəhvar tökər, təbi qılar mənzumat.

□□□

Məhi-üzarun eyləsə ol məhi-taban ilə bəhs,
Afitabə nə rəva kövkəbi-rəxşan ilə bəhs.
Qədi-mövzunin ilə laf ura gər sərvi-səhi,
Necə mümkündür edə sərvi-xuraman ilə bəhs.
Çəməni-hüsndə xəti-rüxün, ey tazəbəhar,
Nə rəva eliyə kim, səbzeyi-bustanilə bəhs.
Ənbərin türrələrün seydi-Xütən nafəsidir,
Nə səza gər eliyə sünbülü reyhan ilə bəhs[11].
Mədəni-aləm əgər lə’li-Yəməndən üra dəm,
Ola bilməz eləsün lə’li-Bədəxşan ilə bəhs[12].
Sədəfi-bəhri-Yəmən dürri-xuşab ilə gələ,
Nə rəva laf ura kim, gövhəri-rəxşan ilə bəhs.
Çahi-Kən’an əgər müftəxiri-Yusif ola,
Necə mümkündü qıla çahi-zənəxdan ilə bəhs[13].
Salika, şahidi-məhvəş sifətin nəzmə yetür,
Yemə qəm gər edəsən cümlə qəzəlxan ilə bəhs.

□□□

Necə rəna gözəlsən, gün yüzündən arturub zinət,
Neçün ol mahi-rüxsarun olub mahi-səmatinət?
Camalun nisbətin xurşidə vermək heç degül mümkün,
Neçün yox xublər içrə üzaruntək gözəl tələt?
Çü nəqqaşi-əzəl lövhə çəkibdür peykərün nəqşin,
Nigarinxaniyə çəkmüb qədər kilki belə surət.
Bədii-sününə əhsən ki, yoqdur nəqs dərkində,
Görülmüb bir belə surət, zəhi-sənət, zəhi-qüdrət.
Bu nə gülçöhrədür mehri dutubdur qəlbi-üşşaqi,
Nişatəngiz üzarün gör salub xatirlərə bəhcət.
Təmaşayi-cəmalundan süruri-dil olur əfzun,
Nə ziba hüsndür sün’i salub afaqə nik şöhrət,

Gülüstani-İrəm görmüb pəripeykər, şəmail qəd[14],
Cinan içrə belə huri ki, görmüb xazini-cənnət.
Bu qəd, sərvi-güləndamın sərapa şəkli-mətbui,
Salubdur Saliki rəncə, şüarin eliyüb möhnət.

□□□

Mürdeyi-cismimə feyzi-nəzərün verdi həyat,
Şəkkəri-lə'li-ləbün baisi-ehyayi-məvat.
Əlifi hərfi-hecadə qədi-mövzununa bən
Bənzədərdüm, əgər etsəydi qəbuli-hərəkat.
Nəqş olub səfheyi-ruyində bu məzmunilə xət
Ki, giriftari-kəməndimdə yoq ümidi-nicat.
Dili-sərgəştəni zəncirə çəküb türrələrün,
Ta siyəhçal zənəxdandə verüb cayi-səbat.
Sehri-batil görünür qəmzeyi-nərgisdə, füsun,
Necə gör qəlbi müfəttən eliyüb, xatiri mat.
Mərhəba, sün'i-əzəl yəxşi çəküb peykərini,
Səfheyi-aləm ara yoq bir üzüntək həsənat.
Səni Tanrı, rəhi-eşqində dönüb Salikə baq,
Tabi-dildən əriyib peykəri, qalmubdu həyat.

□□□

Könül nişatə gəlür lə'li-ləblərün görgəc,
Təəyyüşi-dil olur şəhdi-şəkkərün görgəc.
Kəməndi-türrəşikən xatiri qılır məftun,
Xəmi-təsəlsüli-geysuyi-ənbərün görgəc.
Bəsani-zairi-Kəbə xəyal möhrümdür,
Təvaf əzmi qılır taqi-dilbərün görgəc.
Zəmir ayinəsi göstərür yüzün nəqşin,
Olur çü məzhəri-məh bədri-ənvərün görgəc.
Verür seylabi-sirişkə cəhan səfinəsini,
Bu didə mərdümi ol əşki-gövhərün görgəc.
Süruri-dil gətürər mürdə cismə ruhi-rəvan,
Səhi qədü səmənü sərvi-peykərün görgəc.
Ziyad edər gözümə bəs ki nuri-basirəni,
Xumari-nərgisi-caduyi-əbhərün görgəc.
Məzaqi-Salikə gülzari-hüsndən bəhcət,
Nişat hasil olur qönçə ləblərün görgəc.

□□□

Qıldı bazari-cahanı rövşən ol ənvari-sübh,
Pərdədən bəs ki çıxub dişrə bu gün dildari-sübh.
Şahidi-xurşidi qıldı ğazəru bəzmi-üfüq,
Çəkdi bürqə gün yüzündən bəs ki pərdədari-sübh.
Məhfili-suri-fələk arayişi-zivər bulub,
Məşəli-suzan ilə gəlmiş çü atəşbari-sübh.
Kim, fələk bazarın ayin bağlıyub dəsti-qəza,
Bəzmi-eyşi bəs çirağan eliyüb rüxsari-sübh.
Kilki-zərrinilə çəkmişdür müsəvvir də bu gün,

Səfheyi-xəzradə nəqşi-arizi-dildari-sübh.
Şahidi-xur müjdəsindən dəm urub peyki-səhər
Kim, nisar eylər ona yüz min düri-şəhvari-sübh.
Aşiqi-sadiqdür, izhari-qəm eylər səba,
Ahi-sərd ilə edər xəlqi yenə bidari-sübh.
Salika, bu qəmlu şam əncaminə yoqdur ümid,
Bir təsəlli ver ki, derlər oləcəq izhari-sübh.

□□□

Ey gözüm, bu gözəlin işvəsinə, nazinə bax,
O səhi qamətinə, peykəri-tənnazinə bax.
Tutiyi-nitqini gör, ləblərinün şəkkərini,
Ləli-meyguni ilə püsteyi-dəmsazinə bax.
Sədəfi-gövhər ara dürri-xuşabinə göz et,
Günəş üzlü gülünün qönçeyi-həmrazinə bax.
Həbəşi zülfünü gör, Rumə şəbxun gətürüb,

Tiği-xunrizi ilə navəki-pürtabinə bax[15].
Ənbərin türrəsinün gör girehi- piçü xəmin,
Qərəquş çəngi kibi yırtıcı tırnaqinə bax.
Kəbki-dil qəsdinə qəynaqin edüb tiz üqab,
Cangəza ərsədə bir çərxiyi-şəhbazinə bax.
Salika, nazini çək, təlxiyi-göftarun unut,
Sən onun ləhcəsinə, sövti-xoşavazinə bax.
Məhfili-surinə var, nayü neyi-çəngini gör,
Bərbətü rudü surud ilə o mizmarinə bax.
Xosrovani nəğəmatini yetür guşi-dilə,
Şuri-sər arturan ol nəğməsinə, sazinə bax.

□□□

Səri-kuyində gəzən qəlbi-giriftarimə bax,
Möhnəti-hicrilə bir çeşmi-göhərbarimə bax.
Vadiyi-eşqdə sərgəştədürür qəlbi-nəzar,
İltifat eylə, nəzər qıl, dili-əfgarimə bax.
Eşq odu canə düşüb, şəhri-dilə urdu şərər,
Atəşi-şövqilə bir suzi-dili-zarimə bax.
Mövceyi-seyli-sirişk etdi tənim qərqə müdam,
Bircə insaf qılub dideyi-xunbarimə bax.
Taqətü səbrim alub cövri-fəraqun həmə dəm,
Qalmub arami-dilim, qəlbi-şərərbarimə bax.
Qamətim xəm eyliyüb sərvi-qədin rəftari,
Həqq rizası, göz edüb zərdiyi-rüxsarimə bax.
Dami-geysudə qılub həbs xəyalım quşunu,
Daneyi-xalə uyan mürği-dili-zarimə bax.
Şəkkəri-lə'li-ləbün həsrəti zar etdi dilim,
O zülali-ləb ilə təşnələbi-zarimə bax.
Şəm'i-ruxsarinə pərvanədürür Saliki-zar,
Həsrəti-şəm' ilə bir hali-təbəhkarimə bax.

□□□

Dutmaz eşqün rahini bir dəm xirədməndanə mərd,
Kim ki, aşiqdür, qılar canın fəda cananə mərd.
Naseha, əhli-dili mən’ etmə rahi-eşqdən,
Kuyi-eşqə kim yürür, gər olmiyə rindanə mərd?
Rəsmi-eşqi yad dut, ol aşiqi-cansuzdən,
Atəşi-şəm’ə yaxır canın nöşün pərvanə mərd?
Silki-əhli-halə çəkmiş zahidi rəsmi-riya,
Sovməə küncün dutub cənnət üçün kaşanə mərd.
Başə salmış huriyü firdövsün şövqü liqa,
Şuri-rizq ilə dutub cənnətdə işrətxanə mərd.
Masəvadən ruyi-hacət döndərüb bəs əhli-dil ,
Vəsli-dildari qılub sərmayə ol fərzanə mərd.
Eşq divanində təhrir eyliyüb kilki-əzəl,
Yeksərə üşşaq adın dəftərə, divanə, mərd.
Eşq rahin dutalı Salik kəsüb candən təmə’,
Bir rüxi-gülnardən tökmüş şərarə canə mərd.

□□□

Zəhi cəvahiri-ehsani-Xacətaş Səid[16],
Mədari-şəfqətdən hiç kəs degül növmid.
Yetüb hüzuruna ruhaniyan təfaxür ilə
Ki, payi-busun olub rövşənayi-çeşmi-ümid.
Zəhi məratibi-ali kimə müyəssərdür
Ki, Ruhi-Qüdslə razü bəyan qıla təmhid.
Verəndə zib səmavat mülkünə ol şəh,
Qəmər hüsuli-məasir edə, ziya xurşid.
Cəlali-qədrini gör kim, nə şanü şövkətdür,
Qəza əlilə qoyub başə əfsəri-təmcid.
Ridayi-izzət ilə qamətin müzəyyən edüb,
Neşün, ətiyyədür ol sərvərə ətayi-məzid.
Bu sərvərin rəhi-şər’ini dutginən, Salik,
Həvayi-mərhəmətinə həmişə bağla ümid.

□□□

Aşiqi-sadiqdür ol fərzanə mərd,
Eşq kuyində ola hamunnəvərd.
Meyli-dilbər, həvəsi-şahidi-şux,
Rəngini al edə, rüxsarini zərd.
Cəzbeyi-şövq ola başində müdam,
Atəşi-eşqdə suzan ola fərd.
Daməni-kuhdə aram bula,
Gətürə tabişi-dildən dəmi-sərd.
Cismü canı yana həsrət odinə,
Nöh rəvaqi eliyə guneyi-zərd.
Vəhş ilə üns duta Qeyssifət,
Əşki-tər eyliyə rüxsarini zərd.
Həmçü Salik tökə xunabi-sirişk,
Eşq kuyində ola rahnəvərd.

□□□

Həvayi-deyri-muğan qıldı şuri-sər çü məzid,
Açıldı dərki- xiyalə o dəm rəhi-təcrid.
Şəkibü səbri-dili aldı zibi-nəqşi-bütan,
Olanda baz şüurə dəri-rəhi-tövhid.
Nigar peykərini göz görüb, olub mail,
Füruği-təl'əti bəs rövşən etdi çeşmi-ümid.
Çü cilvə qıldı dilə nəqşi-surəti-ruxi-yar,
Müfəttən etdi gözü pərtövi-rüxi-xurşid.
Sataşdı mehri-cəmali-nigarə mərdümi-çeşm,
O hüsni-surətdən bəhcəti-dil oldu məzid.
Fəraqi-arizi-ziba apardı səbrü sükun,
Vüsalə hatifdən yetdi kim, nəvayi-nəvid.
Verildi bargəhi-dilbərə bəşarəti-bar
Ki, qılma xatirüvi lütfi-yardən növmid.
Sənayi-tələti-yarə dil açdı kilki-bəyan,
Çü təbi-Salikə yetdi inayəti-təmcid.

□□□

Sölə qəmimi nigarə, kağəz,
Razi-dili məhüzarə, kağəz.
Şərh eylə dili-figardən sən,
Bir şəmmə o gülüzarə, kağəz.
Hicrün qədimi kəman edübdür,
Vəslilə dur eylə çarə, kağəz.
Yandırdı bəni qəmi-fəraqın,
Yetmədi sənə şərarə, kağəz.
Ahi-səhərimdən et həzər bir,
Od düşə bu ruzigarə, kağəz.
Odlaşa cəhan yüzi sərasər,
Bir zərrə yetə nigarə, kağəz.
Qəm arturə bu qəmi-nihanə,
Razi qıla aşikarə, kağəz.
Mən rəngi-məlamətə boyandım,
Sən çək özünü kənarə, kağəz.
Suzi-dilü şöleyi-cigərdən,
Ver bir xəbər intizarə, kağəz.
Yandi bu oda məzaqi-Salik,
Sən yanma dəxi dübarə, kağəz.

□□□

Eylə məstəm, bilmənəm kim, sağərü səhba nədür,
Kimdü saqi, mey nədür, başda olan sevda nədür?
Xatiri-sərgəştə dutmuşdur səbili-meykədə,
Leyk bilmən kimdü cəm, bəs cami-dilara nədür?
Rahi-təcridə girüb, bütxanəyə qoydum qədəm,
Bilməzəm zünnarü deyrü müğbeçə, tərsa nədür?

Bəs əqanimi-səlasə oldu rəhbər vəhdətə,
Dərk qılməm Ruhü İbnü Əb nədür, İsa nədür?[17]
Bustan seyrin şüari-xatiri məftun edüb,
Bilmənəm gülşən nədür, tərzi-güli-həmra nədür?
Atəşi-gül bülbülə cilvəfüruş olmuş səhər,
Naleyi-dəstan, dəxi şuri-dili-şeyda nədür?
Gül təmənnasında baş qovğayə salmış əndəlib,
Gül şüküft etdükdə qılmaz naləvü qovğa nədür?
Ol ki, Məcnun eyliyüb saldı məni səhralərə,
Hali-dıl qoymub biləm Leyli nədür, səhra nədür?
Salika, şövqi-rüxi-canan alub səbri-dili
Kim, vücudi-yar ilə dünyavü mafiha nədür?

□□□

Oldu tale fələki-bəhcətdən şəmsi-sürur,
Dutdu əqtari-cəhan damənini pərtövi-nur.
Ənbiyadur qəmu bu dəhrdə gün zərrələri,
Göstərüblər bu cəhani-bəzmdə asari-zühur.
Zibi-bazari-cəhandur düri-yekta səbəbi,
Əvəz olmaz bu dürə cinsi-zəmandari-sürur.
Nə rəvadur cədəlü bəhs onun rütbəsinə,
Hükəma fəlsəfədə yoqdu bu qayətdə şüur.
Mərifət babdə kamildürür ol mənhiyi-hal,
Qılur əhli-həqə əsrari-həqiqətlə zühur.
O şəhin vəsfi-kəmalində olub künd dilim,
“Qəlbi-Quran”də bəs ki, sifəti zikr olunur[18].
Salika, dut rəhi-şər’ini sən ol rahbərin,
Qürbi-həqqə yetürən hadi rəhbər yoludur.

□□□

O gülruxun sitəmi xatiri çü qıldı figar,
Həzar möhnətə etdi dili-figari düçar.
Çü şur saldı başə gülüzarın, ey məhvəş,
Qərarü səbri könüldən apardı gülruxsar.
Çü saldı dövrəmə türrə ənbərin halə,
Qəsəm o mahi-rüxə, halə etdi halini zar.
Olub kəməndi-dilim giysuvani-ənbərfam,
Nedüm ki, qəsdi-dil eylər o əfiyi-şəhmar.
Kəmani-əbruyi-qövs ilə yoq xilafi-murad
Ki, sinəmün sipərin rövzənə qılub oxlar.
O sərvi-qamətə heyran olubdur mərdümi-çeşm,
Xüramə gəl, səni Tanrı, bu tərfə eylə güzar.
Dolubdu dürci-dilə çün məvəddətin göhəri,
Mətai-nəqdi-dilə bircə gərm qıl bazar.
Sabahü şam tökər didə gövhəri-sənənin,
Bu rahi-eşqə səpər dəmbədəm düri-şəhvar.
Bu dadi-eşq məni öldürər, yəqin bilürəm,
Yetişməsə əcəlim, bəsdü cövri-mahüzar.
Niqabi bir götür ol gül yüzündən, ey məhvəş,

Fəraqi-tələtün eyləyüb bu gündə Saliki zar.

□□□

O türfə qamətinə sərvi-dilrüba derlər,
Bu növnihalə hamı qəlbi mübtəla derlər.
Qədini kim ki, görüb, eyləmüb nəzər səmənə,
Nöşün, qədi-səməni qəddinə fəda derlər.
Qılıbdu xirə hamı mərdümi yüzün nuri,
Odur bu tələtə xurşidi-pürziya derlər.
Füruği-mahi-üzarun dutubdur afaqi,
O mahi-mənzərə nuri-rüxi-Süha derlər[19].
Yüzün məlahət ilə kişvəri-cəhani dutub,
Ziyabəxşdü bəs, nuri-"Vəzzüha" derlər[20].
Bu hüsni-surətə əhsən, görülmüyüb misli,
Bu mahpeykərə çün məzhəri-xuda derlər.
O mahi-badəfüruği qılubdu Saliki zar,
Zülali-sağəri-lə'li ona şəfa derlər.

□□□

Əncümən zib qılun, bəzmimə canan gəlür,
Müjdə olsun konülə kol şəhi-xuban gəlür.
Rəhi-əğyari dutun, xəlvət edün bəzmgəhi,
Bu gecə şahidi-dilkeş bizə mehman gəlür.
Şəmi-kafuri götür xəlvətidən, xamuş elə,
Neçün, ol şəmi-rüxi-arizi-taban gəlür.
Salun ol qürfədərə pərdeyi-zərtarləri
Ki, neşün, əncümən içrə məhi-rəxşan gəlür.
Yetməsün bəzmgəhün zivərinə dəsti-qüsur,
Bəzmi-eyşə, neçün, ol şahidi-rizvan gəlür.
Olmiyə pərtovi-gün didə açə rovzənəyə,
Bəzmi-surə bu gecə mehri-dirəxşan gəlür.
Kim, nişatü tərəb əsbabini amadə qılun,
Bəzmgahi-tərəbə türfə nəvaxan gəlür.
Saqiya, bir neçə badə ləbi-nakamə yetür,
Xatiri gərmsər eylə, şəhi-məstan gəlür.
Mütriba, saz eylə ol zirü bəmi-sazləri,
İbtihaci-dil üçün mütribi-xoşxan gəlür.
Salika, sərf qıl ol məhvəşi-dilkeş yoluna
Can mətain ki, neşün, bəzmi-dilə can gəlür.

□□□

Büti-ziba yüzün görgəc könül zarü pərişandur,
Neşün arami-dil derlər, vəli bu afəti-candur.
Mələksima, pəripeykər, qəmərçöhrə güləndamı,
Yüzi bədri-münəvvərdür və ya xurşidi-rəxşandur.
Salubdur şur afaqə, dutubdur şöhrətü cahi,
Təmami-rübi-məskuni, xəlayiq cümlə heyrandur.
Sərü can sərfi-rah etmək bu gülçöhrə həvasilə
Nə layiqdür, bu sevdadə hədiyyə dinü imandur.

Dəhən qönçə, ləbi şəkkər, dişi səmini-gövhərdür,
O meygun ləblərün gör kim, səfasin, ləli-rəxşandur.
Yüzi gül, gözləri nərgis, qaşı bənzər qati yayə,
Kəman çaçi, zəhi möhkəm, rəməndə tiri-peykandur.
Xədəngi-cansitanindən nə mümkündür yaşurmaq can,
Bəlayə tüşmüsən, Salik, həzər qıl, tiri-barandur.

□□□

Halimi qıldı pərişan zülfi-əfşanun sənün,
Xatiri zar eylədi ol ləli-rəxşanun sənün.
Şəmi-rüxsarun çü düşdü məhfili-canü dilə,
Kaxi-səbrə urdu od dürci-dürəfşanun sənün.
Sehri-qəmzi-nərgisin yıxdı könül viranəsin,
Bağrımı çün şərhə qıldı tiri-peykanun sənün.
Tari-türrən bağladı yeksər könül şəhbazini,
Qıldı məva bəs ki, ol çahi-zənəxdanun sənün.
Taciri-əqlə ticarət ögrədüb məxmuri-çeşm,
Nəqdi-cani aldı əldən ləli-qəltanun sənün.
Saliki çəkdi genə rüsvailüq bazarinə,
Dəmbədəm ərzi-məta eylər gülüstanun sənün.

□□□

Bilməzəm ol novnihali-qaməti-rəna nədir,
Sərvi-gülzari-məlahət, sərbepa ziba nədir?
Cuybari-bağdə azadədür sərvi-səhi,
Bu xuraman sərvdə ol zülfi-ənbərsa nədir?
Gör nə nəğz peykərü qamətsəhidür sim saq,
Çöhrə gül , tələt qəmər, bu sərvi-dilara nədir?
Taqətü aram almış xatiri-əfgardən,
Bilməzəm bu gülrüxi-mahi-cəhanara nədir?
Bəs ki, qalmub səbr, yoxdur kim, qərari- xatirim,
Xatiri-divanədə bilmən səri-sevda nədir?
Gülşəni-dəhri-təfərrüc qıldığumdə görmüşəm
Bir güli-suri-yüzün, bilməm güli-həmra nədir?
Valeh etdi mərdümi-çeşmim o gülbərgi-lətif,
Xirə qılduqdə gözüm dərk eyləməz dünya nədir?
Sübhdəm ərzi-məşam etmiş səba bu ənbərin,
Hicri-güldə bilməzəm hali-dili-şeyda nədir?
Salika, can kəştisin qərqə qılub tufani-əşk,
Bilməzəm sahil nə canibdür, ləbi-dərya nədir?

□□□

Bu rahi-eşqdə xatir bəsi zarü pərişandur,
Neşün, sərmənzili-yarə yetişməkdə hərasandur.
Nə mümkündür dili-zarə duta vəsli-rəhi-yari,
Bu əzmi bir də tərk etmək rəhi-üşşaqə nöqsandur.
Səvadi-cismü can tərk et səbili-eşqdə, ey dil,
Neşün, bu surəti-xaki sərapa məhbəsi-candur.
Bu yolda səhli-mətləbdür ki, başü candən keçmək,

Əgərçi qəmu aşiqlər bu sevdadə pərişandur.
Bu gülzar içrə çoq şeyda çəkər gül həsrətin, liykin
Bənim tək hicrəti-güldə degül giryan, xoşxandur.
Cıqarməm xatirimdən kim, kəmani-qövsi əbrunin,
Tərəhhüm qıl dili-zarə, qətili-nuki-hicrandur.
Bu kuyi-eşqdə Salik gəzər növmidü sərgəştə,
Tələttüflə nəzər qılsən, mədari-lütfi-ehsandur.

□□□

Bənə badə gətür, saqi ki, hicrində könül qandur,
Qərarü taqəti dildən alan ol munisi-candur.
O gülçöhrə fəraqində cigər qanə dönüb yeksər
Ki, arami-dili-canım, neşün, cami-füruzandur.
Zibəs hicri-rüxi-səhba sükuni-xatiri almış,
Bu möhnətdən dili-müztərr düşüb tabə ki, tabandur.
Ləbi-meygun zülalinə bəsi təşnə olub xatir,
O abi-nabi-ləlinlə əlac et, dil pərişandur.
Təmənnayi-könüldür bəs xərabatı qıləm məskən,
Neşün, andə dilə həmdəm hamı dil safi-rindandur.
Füruği-məhrüxi-badə xərabatı qılıb rövşən,
Sanasan mahi-rüxsar, səbuhi-mehri-rəxşandur.
Nə sağərdür dutub mütrüb ləbi-ləli-zülalindən,
Könül zövqün qılan əfzun zibəs ol abi-heyvandur.
Mürüvvət eylə bir, saqi, yetür peymanə məstanə
Ki, ol xəmri-ələstidən, neşün kim, əhdi-peymandur.
Rəhi-meyxanə dutmuşdur genə Salik, müfəttəndür,
Gətür ol şahidi-cani ki, can rahində qurbandur.

□□□

Piri-məhzunə deyün Yusifi-Kən’an gəlür,
Valiyi-Misri-məlahət, şəhi-xuban gəlür[21].
Genə Yəqub məşaminə yetüb buyi-əziz,
Beyti-əhzanə məgər qasidi-canan gəlür?
Rəhi-Kən’anə müsəmməmdü məgər əzmi-bəşir,
Rövşənayi-gözə kim, pirəhəni-can gəlür[22].
Çoq zamandur ki, gözüm basirəsi getmişdür,
Mərdümi-çeşmə bu gün nuri-füruzan gəlür.
Bu sərayi-dili tar etmiş idi kim, şəbi-hicr,
Sahəti-tari-dilə şəmi-şəbistan gəlür.
Şükrlillah, Qəmər Əqrəbdən tişrə çıxub,
Bədri-ənvər kimi ol arizi-taban gəlür[23].
Muyi-miğin dağıdub çöhreyi-sima qəmərə
Ki, sanasan bulud içrə məhi-taban gəlür.
Tələti-xuri-üfüq türrədən eylübdü tülu,
Sahəti-xatirə xurşidi-dirəxşan gəlür.
Salikin eşq rəhində canını əldən alan,
Yol dutub cismi saru lütfilə çün can gəlür.

□□□

Cəfa etmə dili-zarə ki, xatirdür bəsi müztər,
Tükətdi ömrümü hicri-rüxün key şuxi-məhpeykər.
Dili-pürtabdən keçdi şərər, can damənin dutmuş,
Fəraqin atəşi yandırdı cismi-zarimi yeksər.
Könül bir qətrə qandur, qıl tərəhhüm, ey şəhi-xuban,
Bu qədər möhnəti-azarə netsün bu dili-müztər.
Sitəm qılma diləfgarə, çoq incitmə bəni-zari,
Həzər qıl ahi-sərdi-səhərimdən, ey mələkmənzər.
Cigərdən gər çəkəm ahi, cəhani-canə od sallam,
Qəmu aləm yanar yeksər xəsin tək, xüşk ola, ya tər.
Nedərsən boynuna gəlsə bu işdə məzləmə, cana?
Cəvabin var isə, söylə, büti-tənnazimə mənzər.
Sənün rahində gər Salik xətakar olsa, dildarım,
Qan olmaz bir nigah etsən bəni-zarə sən, ey sərvər.

□□□

Düşdü çü qəlbə pərtövi-mehri-üzari-yar,
Aldı şəkib, qalmadı dildə dəxi qərar.
Dutdu çü tabi-tələti-xurşid xatiri,
Dil kişvərini yeksərə qıldı füruği-kar.
Pərdə çü saldı mah rüxündən o məhliqa,
Aram hiç qoymadı dildə məhi-üzar.
Əbruyi-qövsi-haləvəş, ol mahi-ənvəri,
Bəs ki, dutub alubdu könüldən hamı qərar.
Ol caduvanə nərgisi-abidfəribi gör,
Qəmz ilə nazü işvə rəhində qılub şüar.
Yəğma əlilə qarət edüb şəhri-xatiri,
Ceyşi-füsuni yıxdı, nola baruyi-həsar.
Qıl bir həzər bu türki-sitəmkardən, aman,
Bircə qıya baxuşla qılub qəlbi tarü mar.
Salik, gər aldı haləti-dil türki-məsti-şux,
Etmə həras, qıl rəhinə canü dil nisar.

□□□

Rüxsari-gülşənə səpübən dürri-şahvar,
Dəsti-səba çü çak qılub məxzəni-əyar.
Əfşan edüb üzari-gülə gövhəri səhər,
Gülzari-bəzminə günəş eylüb ani nisar.
Gülbərginün cəbini ərəqrizi-jalədür,
Bəs ki, səmum xatirini zar edüb, nizar.
Ləli-Yəmani cəm qılub qəhfi-laləyə[24],
Etmiş hədiyyə sahəti-gülzarə novbəhar.
Nərgis gözün xumar qılub zibi-əncümən,
Heyran edüb o xirəsəri zibi-cuybar.
Gülgun qəba qılubdu genə peykəri-güli,
Guya ki, meyli-gülşən edübdür bu gün nigar.
Salik göhər sirişki səpüb rahi-gülşənə,
Canan yolunda ruzü şəb eylər ani nisar.

□□□

Saqi, başə şur saldı sağər,
Bir cam ilə qıl dəmağimi tər.
Hicri-məhi-badədür qəmi-dil,
Qəm dəfin eylə səbuhiyi-zər.
Dərdi-dilimün dəvası meydür,
Zövqi-dili meylə qıl füzuntər.
Tabi-dil urubdu canə atəş,
Dil kişvərini dutubdur əxgər.
Yoq çarə dil atəşinə illa,
Ol safi-zülali-ləli-şəkkər.
Nərgis qədəhinə tök şərabi,
Mənzuri-nəzərdür ol səmənbər.
Dözmən bu xumarə, zövqüm artur,
Səhbayi-ləbi gətür bərabər.
Salik rəhi-meykədə dutubdur,
Dərdi-mey olub dilində əzbər.

□□□

Səhər xüramə gəlüb qaməti-səhipeykər,
Çü oldu zivəri-gülşən bu gün o məhmənzər.
Olub müşərrəfi-pabusi-sərvi-rəvan,
Çü gördü rəsmi-təhiyyət dutub qədi-ərər.
Salub yüzünə səmən türreyi-müənbərini,
Üzari-mahdə gördü çü türreyi-ənbər.
Nəsim verdi məşamə nəvidi-nafeyi-Çin,
Çü qıldı seydi-Xütən suyi-bustanə güzər[25].
Səba çü şanə qılub türreyi-kakil səmənə,
Müəttər etdi güli-gülsitani müşkintər.
O nəğzpeykəri görgəc gözün xumar qılub ,
Neşün ki, bağdə görmüb bu qaməti əbhər.
Təhəyyüri-dil olub cuybar gülzarə,
Zibəs ki, rəşeyi-dil dutdu sərvü neyşəkkər.
Bu rahi-eşqə saru, Salika, qədəm qoyğıl,
Ola ki, sayə sala başıma səhipeykər.

□□□

Sahəti-əncümənə ətri-ruxi-yar gəlür,
Zivəri-məhfil edün kol rüxi-gülnar gəlür.
Sübhdəm guşi-dilə yetdi nəva hatifdən,
Rəhgüzarə çıxun, ol şahi-vəfadar gəlür.
Bu nəvidi yetürün yeksərə əhli-milələ,
Hamı pişvaz eyləsün kim, şəhi-əbrar gəlür.
Əfsəri-izzət ilə tarəki pürzib qılub,
Səltənət təxti saru şahi-nikukar gəlür.
Fidyeyi-canü dili cümlə çəkün rəhgüzərə
Ki, neşün ol şəhi-Cəmcahi-cəhandar gəlür[26].
Ruzigarın nəsəqi getmiş idi, xosrovi-din
Bəhri-tənzimi-ümuri-həmeyi-kar gəlür.
Rəsmi-islam şüarı yoq idi millət ara,

Rövnəqi-məzhəb içün seyyidi-əxyar gəlür.
Şər'i-namusini zəbt etmiş idi əhli-inad,
Varisi-Əhmədi-Muxtar, tələbkar gəlür[27].
Din gülzarinə əl açmış idi cövri-ədu,
İntiqam almağa bəs ləşkəri-salar gəlür.
Kişvəri-dəhri xərab etmiş idi dəsti-xilaf,
Bəhri-təmir, yədi-qüdrəti-Cəbbar gəlür.
Rübi-məskuni müsəxxər eyləmək əzmi ilə,
Naibi-Heydəri-Kərrar, mədədkar gəlür[28].
Salika, canü dili fidyə qıl ol şəh yoluna,
Qıl təfaxür ki, şəhi-sahibi-ənvar gəlür.

□□□

Sənün, ey nigar, ruyin məhi-rövşənayə bənzər,
Rüxün içrə miği-muyin bulud içrə ayə bənzər.
O nə sərvdür dilara ki, nişati-xatir etmiş
Ki, riyazi-tələt içrə qədi-dilrübayə bənzər.
O üzari-məhqərinün ki, qılub cahani rövşən,
Necə mehri-mənzər olmuş, məhi-pürziyayə bənzər.
O cəbini-pürfüruğin ki, salub zəminə pərtov,
Nə cəbin, təbarəkallah ki, huri-səmayə bənzər.
O nə türrə ənbərdür ki, məşam edüb müəttər,
Şəmmi-sünbüli-güllalə həmə müşksayə bənzər.
Nə kəməndi-geysuvandur ki, duşubdü piçü tabə,
Şikəni-təsəlsül ilə siyəh əjdəhayə bənzər.
Bu nə türki-məstdür gör ki, çəküb kəmani-Çaçi,
Sinəmi qoyub nişanə, necə bir cəfayə bənzər.
Çü atır xədəngi-nabin, dili şərhə-şərhə eylər,
Diyə bilmənəm ədüvdür, neşün aşinayə bənzər.
O nə şəkkərin ləbdür ki, nəbatdən urar dəm,
Yetürürsə xəstə kamə ki, yəqin şəfayə bənzər.
Necə qəddi-dilrübadur, geyinüb qəbayi-gülduz
Ki, məgər təladu peykər, sərü pa minayə bənzər.
Böylə məhvəşin yolunda sərü canü dil fəda qıl,
Nə əcəb səxadu, Salik, sərü pa vəfayə bənzər.

□□□

Sitəmi-hicri-rüxün xatiri çün qıldı figar,
Nə rəva eyləyəsən xəstədili bir də nizar.
Çü məhi-arizin olduqda nihan, dideyi-dil
O qədər əşk töküb, mövcə olub bəhri-zəxar.
Məh üzarun çü füruği götürüb kişvəri-dil,
Səhli-viranəligi leyk olub yeksərə tar.
Türreyi-müşkin çü dutub mahi-münəvvər yüzini,
Qəmər Əqrəbdü, nə müşkül səfəri-kuyi-nigar.
Bülhəvəs xatiri gör, əzmi-rəhi-yarə düşüb,
Yolu qəmmaz dutub, müşkül olub karü mədar.
Nəzrdür, gər güzərim düşsə səri-kuyinə, mən
Bu gecə sərfi-rəhi-yar eyliyim cani-nizar.

Pərdə xurşidi-rüxündən nolu bir də saləsən,
Tükənib səbrü şəkibim, dəxi yoq dildə qərar.
Aldi arami-dili-Saliki bəs mahi-rüxün,
Nolur insafə gəlüb bir qılasan kəşfi-üzar.

□□□

Şövqi-həvəsim qönçeyi-xəndanın üçündür,
Xunabeyi-çeşmim şəbi-hicranın üçündür.
Rəngi-rüxümi zərd qılub cövri-fəraqin,
Bu möhnəti-dil sərvi-xuramanın üçündür.
Bimar eyləyübdür tənimi nərgisi-məstin,
Dürdanələrim rişteyi-mərcanın üçündür.
Qəmzən həvəsilə açılur dideyi-şövqüm,
Əşki-göhərim nərgisi-fəttanın üçündür.
Möhnətzədəyəm tünd nigahın səbəbilə,
Aşüftəligim kakili-əfşanın üçündür.
Daği-dil olubdur bəna kim, qeyrilə ünsün,
Bu suzi-dilim şəmi-şəbistanın üçündür.
Çoq cövrü sitəm görmə rəva Saliki-zarə,
Sərgəştə könül bəndeyi-fərmanın üçündür.

□□□

Şəmi-rüxsarinə möhtacdı kim, xatiri-zar,
Nə rəva kim, girə fanusə dəxi şəmi-üzar.
Bürqeyi-türreyi-müşkini götür tələtdən,
Hicri-rüxsar ilə qəlbim evini eyləmə tar.
Bəs ki, müştaqdu şəmi-rüxə pərvaneyi-dil,
Qomə həsrətlə gəzə dövri-rüxündə dili-zar.
Ənbərin zülfləri eyliyəli bürqeyi-məh,
Zülməti-leyl olub xatirə kim, zövi-nəhar.
O məhi-arizə məftun olub mərdümi-çeşm,
Nə səzavar duta mah yüzün türreyi-tar.
Zülfi-müşkini kənar eylə üfüqi-tələtdən,
Yaraşurmi duta xurşidi-cahangiri qubar?
Hicrəti-şəmi-rüxün Saliki avarə qoyub,
Səni Tanrı, dəxi gözdən eləmə şəmi kənar.
Rəhmə gəl, bir də rizayi-həqi mənzur qılub,
Qoma sərgəştə rəhində dili-zari şəbi-tar.

□□□

Səba əli səmənin kakilinə şanə çəkər,
Ərusi-namiyəni məhfili-cinanə çəkər.
Nəsimi-sübh çəmən kişvərinə şur salub,
Dəmi-əyyar ilə baş bağü bustanə çəkər.
Həvayi-ordubehişti həyati-mürdə üçün
Məsihdəm özünü sahəti-cəhanə çəkər.
Sirişki-didə tökər əbri-azəri çəmənə,
Üzari-gülşəni kim, rəngi-imtəhanə çəkər.
Gəlür həzarə nəvayə şükuftə gül görgəc,

Zəbani-nitqi bu nəzmi səhər bəyanə çəkər.
Günəş nisar qılar gül yüzünə şəbnəmi-dürr,
Fəzayi-gülşən ara töhfə ərməğanə çəkər.
Bu surə çak qılar pirəhən güli-suri,
Nişat içün özüni təhti-kamranə çəkər.
Niqabi-isməti yüzdən salur o gülçöhrə,
Bu əndəlibi nə gör şüri-aşiqanə çəkər.
Qəm etmə,Saliki-məhzun, bəhar mövsimidür,
Dutar qəza əlini, tərfi-gülsitanə çəkər.

□□□

Sübhdəm bəhcəti-dil seyri-gülüstan gətürər,
Dili-şeydayə, neşün, nükhəti-gül can gətürər.
Cameyi- istəbrəq ilə zivəri-duşü bər edüb,
Gərdü xaki necə güldəsteyi-reyhan gətürər.
Nəmədi-sündüs ilə fərş qılıb sahəti-dəşt,
Tənə zəngar qəba kuhü biyaban gətürər.
Daməni-dəştə çəküb xərgəhi-Daranı, neşün,
Bərr təsxirinə ləşkər yəli-Nöman gətürər[29].
Sağəri-lalə alub saqiyi-hamun əlinə,
Ləbi-kuhsarə necə badeyi-məstan gətürər.
Məhfili-eyş qılub çidə çü fərraşi-səba,
Əncümənsurə gülü sünbüli-reyhan gətürər.
Təkyei-said edüb gülşən ara saqi-bənəfş,
Gərdənin gör nə qılıb kəc, dilə əhzan gətürər.
Türreyi-sünbüli əfşan eyliyüb şaneyi-sübh,
Zülfi-ənbərsəməni gör necə əfşan gətürər.
Bəzmi-gülzardə gül suri üçün susənə bax,
Dəh zəban ilə özün gör nə sənaxan gətürər.
Xərməni-arizi-güldən genə nəfxi-səhəri,
Bu məşami-dilə kim, ətri-gülüstan gətürər.
Qeysvəş gör nə qılıb Saliki hamuninəvərd
Ki, neşün rəhgüzərə məhmili-canan gətürər.

□□□

Füruği-mahi-arizinlə könül şəhri münəvvərdür,
Ziyabəxşi-sərayi-dil məhi-rüxsari-ənvərdür.
Çü talei-şərqi-tələtdür bu gün xurşidi-rüxsarun,
Fəzayi-xatirə pərtov salan xurşidi-xavərdür.
Füruği-kişvəri-dildür o şəmi-arizin tabi,
Çirağı-məhfili-xatir, füruği-ləli-əhmərdür.
Nişatəngizi-xatir, bəs o səhbayi-ləbi-ləlün,
Füruğbəxşi-dili-müztər, səbuhi-behcətavərdür.
Səbuyi-zərkeşə məftun ləbi-ətşanimə bir bax,
Ləbi-peymanə müştaqi dili-rindi-hünərvərdür.
Necə gör məhvəşi-rəna alubdur ixtiyar əldən,
Qərari-xatiri-müztər alan ol ləli-sağərdür.
Dilü can şəhrinə atəş uran saqidür atəşdəst,
Şərarə rizi-xatir bəs qılan cami-pürəxgərdür.

Üzari-şahidi-dilkeş alub arami-dil, Salik,
Səri-kuyi-xərabatə bulan yol rindi-rəhbərdür.

□□□

Fəraqi-arizi-məhvəş nə qıldı xatiri zar
Ki, tabi-dil elədi könlümü figarü nəzar.
Fəğani-nalə şüari-dil etdi hicri-rüxün,
Neşün, qərari könüldən apardı gülrüxsar.
Kəməndi-xatir olub bəs təsəlsüli-ənbər,
Məşamə çün yetür ol şəmmi-müşki-seydi-tətar.
Füsuni-nərgisi-caduyə yoq əlac bir dəm
Ki, bircə qəmzə ilə dil alub o cadukar.
Hisari-kişvəri-qəlbə nə rəxnələr kim, açub
Ki, bir nigah ilə viran edüb binayi-hisar.
Çü şəhdi-ləli-şəkər yetmədi ləbi-kamə,
Məzaqi-xatiri təlx etdi hicri-ləli-şəkərbar.
Rizayi-Allah üçün sal niqabi gül yüzdən
Ki, hicri-gülrux edüb Saliki bu gün əfgar.

□□□

Qəza küttabi bu xətti səri-tumarə yazmişlər,
Səvadi-eşqdə gör kim, rüxi-dildarə yazmişlər.
Qəmu üşşaqlər adın cünun vadiyi-heyrətdə,
Qədər lövhində sərgərdanü bəxti qarə yazmişlər.
Məqami-sirri-vəhdətdür, rəhi-dildarə yoq qayət,
Olur getdikdə yol barik, nə müşkül karə yazmişlər.
Cünun olmaq, gərək yeksər təəllüq damənin kəsmək,
Əlaqə əhlini, ey dil, qəmu avarə yazmişlər.
Qədəm bu rahə çün urdum, bəsi sərgəştələr gördüm
Ki, Fərhad ilə Şirin nəqşini kuhsarə yazmişlər[30].
Müsəvvir surəti-Əzra dili-Vamiqdə nəqş etmiş,
Həmi Yusif-Züleyxa surətin məhparə yazmişlər[31].
Cünunluq kişvərində nəqş edüb Məcnuni sərgəştə,
Yanında Leyli adını məhi-rüxsarə yazmişlər.
Dəbiri-eşq üşşaqin adın təhrir qılqandə,
Səbili-eşqdə Salik adın biçarə yazmişlər.

□□□

Kuyi-üşşaq rəhin kim, dutubən yar gəlür,
Aşiqi-zarə tərəf ol rüxi-gülnar gəlür.
Necə qəd, sərvi-səhi qamət ilə türfə sənəm,
Gör nə nazü nə xüram ilə dilazar gəlür.
O mələkmənzərü simaqəmərü zöhrəcəbin,
Huri-firdövsbəsan gör nə nikukar gəlür.
Zülfi-ənbərlə məhi-arizi məstur qılub,
Görsə gər mahi-rüxi, qənşərə əğyar gəlür.
İki badami-siyəhnərgisi-fəttan kimi,
Cilveyi-işvə satar, gör necə xəmmar gəlür.
Qəd səhi, sərvi-dilaramü güləndami-lətif,

Sərbepa nəxli-məlahət, güli-gülzar gəlür.
Çöhrə gül, qönçədəhən, muymiyan, gərdən ac,
Şəhdi-şəkkər, süxəni-tutiyi-göftar gəlür.
Simi-ğəbğəb, zənəxi-sib, şəfabəxş ləban,
Xəstə dil təqviyəti, şərbəti-dinar gəlür[32].
Bəs ki, təlxtər idi kami-təmənnayi-məzaq,
Şəhdi-kam etmək üçün ləli-şəkərbar gəlür.
Salika, vəsl rəhin dutmuş idi cövri-rəqib,
Rəğmi-əğyar ilə gör məhfilə dildar gəlür.

□□□

Kişvəri-canə salub şəmi-üzarun çü şərar,
Şərəri-tab ilə məftun könülü qılma figar.
Pərtovi-mehri-rüxün xatiri çün qıldı füruğ,
Mərdümi-çeşmi müfəttən elədi mahi-üzar.
Qəddi-rəssa səhər, olduqda günə cilvəfüruş,
Qamətin aldı qərari-dilimi, hər nə ki var.
Səhər ol sərvi-rəvan basdı çü gülzarə qədəm,
Çəmi-rəftari-xürami elədi xatiri zar.
Şikəni-zülfi-təsəlsül dili zəncirə çəküb,
Könlümü həbs eylədikdə girehi-türreyi-tar.
Aldı arami-dili nafeyi-ahuyi-Xütən,
Müşkbiz etdi məşami çü şəmmi-seydi-tətar[33].
Sağəri-ləli-ləbün zövqi ilə məsti-diləm,
Cövri-səhba ilə bir də könülü qılma nəzar.
Məst olduqda füzun oldu şəkibaiyi-dil,
Pərtovi-mahi-rüxün qoymadı xatirdə qərar.
Salika, şövqi-rüxi-məhvəş ilə dilşadəm,
Tökmüyə cövri-fəraqi dilə gər bir də qübar.

□□□

Genə can qəsdinə gör kim, necə canan gəlür,
Dilü can almaqa gör türk nə məstan gəlür.
Zehi-əbrudə qılub tə’biyə tiri-müjəni,
Ərseyi-rəzmə bu gün farisi-yekran gəlür.
Tiği-əbruni çəküb xuni-dili tökmək üçün,
Kişvəri-canə saru ol şəhi-türkan gəlür.
Nuki-dilduzi yıqub tirkeşə, qəsdi-dil edüb,
Hədəfi-sinəyə bir-bir müjəpeykan gəlür.
Bir də xunriz xədəngin qoyubən şəsti-zəhə,
Dili şərhə elmək qəsdinə türkan gəlür.
Neşün, aramini məftun könlün almaq içün,
Qəmzəvü naz ilə kim, nərgisi-fəttan gəlür.
Gör nə pürtab qılub kin ilə geysuyi-kəmənd,
Dəstgir etməgə dil ol şəhi-xuban gəlür.
Kim, xiyalım quşunu çəngə uran şəhbazəm,
Əzmi-kəbki-dilə can aluci tərlan gəlür.
Qıymayan caninə, Salik, rəhi-eşqə yürüməz,
Canı cananə yetür, gör nə gözəl can gəlür.

□□□

Günəş rüxsarinə üşşaq ruyin “vəzzüha” derlər,
Nə rənadur qədi-mövzun ki, sərvi-dilrüba derlər[34].
Nə arizdür ki, məftuni hamı heyrani-mərdümdür,
Nə bədri-münəvvərdür ki, mahi-pürziya derlər.
Rüxün mahi-cəhantabi çü qıldı aləmi rövşən,
Budur bais o rüxsarə məhü mehri-səma derlər.
Bulub bəhcət təmaşayi-rüxündən əhli-nəzzarə,
Nihan etməklə məh ruyin hamı vahəsrəta derlər.
Bu nazi-işvə, qəmzəylə görünsən mərdümə bir də,
Alursan taqəti-xatir, könülğə binəva derlər.
Kəmani-əbruvanindən müjə peykanın at bir-bir,
Xədəng atma dilə bir də, atər olsən, cəfa derlər.
Ləbi-meyguni-nabindən yetür badə dilə,saqi,
Nə ləli-rəngdür sağər ki, cami-pürsəfa derlər.
Müfəttəndür dili-Salik meyi-səhbayi rənginə,
Şərabi-nabi-ləlin bəs dilə bəhcətfəza derlər.

□□□

Genə nəfxi-səhəri mürdə dilə can gətürər
Ki, neşün, peyki-səba müjdeyi-canan gətürər.
Gülşəni-arizi-dildarə yetüb dəsti-nəsim
Ki, məşamə gəhü gəh ətri-gülüstan gətürər.
Sünbüli-türrəni əfşan eyliyüb şaneyi-sübh,
Oldürür xatirə buyi-güli-reyhan gətürər.
Ya şimal ənbəri-saradan alub müşki-Xütən,
Ətri-nafə dili-canə nə firavan gətürər[35].
Məgər ol sərvi-rəvan sahəti-gülzarə çıxıb?
Necə rəna qədi pabusə xuraman götürər.
Sağəri-lalə çəküb dağ dili-suzanə,
Bəzmİ-kuhsarə, neşün, sağəri-suzan gətürər.
Pərdədən atəşi-gül sahəti-gülzarə çıxub,
Əndəlibi necə gör bəzmə sənaxan gətürər.
Hicrəti-peykəri-tənnazi-mələkmənzər ilə,
Gündə yüz möhnəti-dil, xatiri-nalan gətürər.
Salika, dideyi-müştaqə yetüb cövri-fəraq,
O qədər əşk töküb, axiri tufan gətürər.

□□□

Genə ol sərvi-rəvan canibi-bustanə gedər,
Nə xuraman yeriyür, gör necə məstanə gedər.
Necə rəna qəd ilə sərvi-güləndami-lətif,
Gör nə rəftar ilə kim, seyri-gülüstanə gedər.
Bir neçə türfə sənəm həmdəm ilə Leylivəş,
Şuri-Məcnuni salub başə, dəbistanə gedər.
Tiği-əbruni çəküb Rüstəmi-Dəstansifət,
Xuni-dil tökmək üçün ərseyi-Sistanə gedər[36].
Ya məgər nəğmeyi-bülbül yetişüb suri-gülə,

Dil nişatə gəlübən məhfili-dəstanə gedər.
Türrəyə tab verüb, zülfün edib həlqə kəmənd,
Seydi-dil etməgə gör türk nə məstanə gedər.
Saliki eşq rəhində qoyub avarə genə,
Meyli-gülzar eliyüb, canibi-bostanə gedər.

□□□

Mərdümi-didə, rəhi-dilbərə səp əşki-göhər,
Neşün, ol çöhrəqəmər seyri-gülüstanə gedər.
Müjə carubi çək ol türfə sənəm rahinə bəs,
Pakü pakizə qıl, ol şahi-rəhi qoyma, gedər.
Nə səza gər salasan rahinə dibaci-zəri,
O mübarək qədəmi rəncə qıla bəstəri-zər.
Şəhi-xuban yolinə qıl yüzini payəndaz,
Qədəmin arizə vər qoysa ola fəxri-hünər.
Nəqdi-canü dili sərfi-rəhi-canan eyləsən,
Sədqeyi-mahi-rüxi hər nə ola simlə zər.
Busə qıl xaki-rəhin, ta ləb ola kamrəva,
Arturə zövqi-dili şövqi-ləbi-lə’li-şəkər.
Sürmə qıl dideyi-məftunə qubari-qədəmin,
Pərtovi-mahi-rüxündən yetə ta zöv’i-bəsər.
Sağəri-nərgisi-məxmurdən al kami-dili,
Ta nişat arturə dil, xatir ola bəhcətəsər.
Salika, dəhrdə dut eşqi-rəhi-cananı,
Həzər etmə ki, rəhi-eşq tökər canə şərər.

□□□

Müjdə olsun könülə kol şəhi-xuban gəlür,
Məhfilə zib verün, bəzmimə canan gəlür.
Qəlbi məftun eyliyüb, didəni heyran qılan,
Nazü qəmz ilə görün kim, nə xuraman gəlür.
Səbrü aramı alub, taqəti-xatir aparan,
Rəhm edübdür dilə, arami-dilü can gəlür.
Dili məhzun qılıb, xatiri qəmgin eyliyən,
Bəhcəti-xatir içün xürrəmü xəndan gəlür.
Pətovi-tələti-məh, dideyi-dildən yaşuran,
Məhfili-tari-dilə şəmi-şəbistan gəlür.
Zülməti-hicrət ilə qəlb evini tar qılan,
Bəzmi-tari-könülə çün məhi-taban gəlür.
Qüvveyi-basirəni mərdümi-çeşmimdən alan,
Mərdümi-çeşmimə çün nuri-füruzan gəlür.
Şərəri-atəşi-hicranı dilü canə salan,
Tabi-dil almaqa çün çeşmeyi-heyvan gəlür.
Rəhi-eşqində qılan Saliki sərgəştə nigar
Çoq tərəhhümlə bizə bu gecə mehman gəlür.

□□□

Məclisara eləyün, bəzmə şəhənşah gəlür,
Pişrovdən irəlu xeyməvü xərgah gəlür.

Əncümən saz qılun, zivəri-dərgah eyləyün
Ki, neşün, əncümənə sərvəri-Cəmcah gəlür[37].
Fərz olub rahə çəkilsün müjə carubləri,
Bəs ki, rah ilə bu gün dəstgəhi-şah gəlür.
Əşki-didə səpün ol şahrəhə, ey dılü can,
Yolu pakizə qılun, çün şəhi-zicah gəlür.
Cameyi-ədlilə arayiş edüb duşi-bərin,
Həşməti-şövkət ilə şahi-nikuxah gəlür.
Həft iqlim eli beyətinə dəst qoyub,
Hökmi-fərmaninə həm ləşkərü həm şah gəlür.
Həbəşü Rum, Qumuq, Rusü Xəta, Çinü Firəng
Tabeyi-hökmdü, çün nüsrəti-Allah gəlür[38].
Bəs ki, təyidi-əzəl qurşuyub ol şəh kəmərin,
Ceyşi-fəth ilə zəfər ol şəhə həmrah gəlür.
Xatiri-əhli-miləl röbü həras ilə dolub,
Neşün, ardınca o şahın Əsədullah gəlür[39].
Təkyeyi-nüsrət edüb kövkəbeyi-həşmət ilə,
Tiği-atəşdəm ilə dəsti-Yədullah gəlür[40].
Salika, məsnədi-canı sal onun rahinə sən,
Qədəmin qoysa əgər çöhrəyə, dilxah gəlür.

□□□

Mail olubdu seyrə məgər ol səmənüzar?
Gülbərglə müzəyyən olubdur rəhi-nigar.
Gövhərpərənd olub hamı gülzar caməsi?
Yoqsə ki, meyli-gülşən edübdür o gülüzar?,
Sərvi-rəvan xüram ilə gülzarə girdi bəs,
Arzudən kəmanqəd olub qaməti-çinar.
Rəşki-həsəd cinani qılubdur füsürdədil,
Gülzari-dəhrə çün güzər eylüb o gülüzar.
Qönçə açub təbəssümi-ləb gülsitan ara,
Gəlmiş zibəs şükuftə ləbi-qönçə, ləli-yar.
Şəkkərşikən olub çü ləbi-ləli-şəhdbiz,
Qıldı məzaqi şəhdvəş ol ləli-xoşgüvar.
Salik yetirdi kami-təmənnayə çün şəkər,
Tutisifət şüari olubdur sənayi-yar.

□□□

Mahi-hüsnün pərtovundan dil həmişə zar olur,
Tələti-xurşid birlə xatirim əfgar olur.
Hüsnün olduqca füzun, sərgəştə eylər könlümü,
Eşq bir yoldur, cünun bu rahdə bidar olur.
Sirri-eşq eylər məzaci-aşiqi, bil, müstəqim,
Eşq sirrin aşikar etsən, könül bimar olur.
Dün mədari-eşqdən zahid məni mən’ etdi kim,
Bilməyübdür eşq kuyində gəzən huşyar olur.
Zövqünü eşq əhlinin dərk eyləməz zahirpərəst,
Ol ki, içmibdür məvəddət cami, key bidar olur?
Mən’ eylər aşiqi didardən huri üçün,

Bilməmiş hurü pərisi aşiqin didar olur.
Eşq sevdasinə Salik nəqdi-ömrün sərf edər,
Bilməzəm bu rəsmi tərk etdikdə kim hüşyar olur.

□□□

Nə rənadur səhi qəddin ki, sərvi-dilrüba derlər,
Məhi-rüxsarına,cana, fərəhbəxş ziya derlər.
Nə cadudur, fünunindən xilas olmaz dili-məftun,
Kirişmə eşqisin mərdüm görərsə, pürcəfa derlər.
Dutanda şiveyi-nazi qutulmas kimsə qəmzəndən,
Necə məstanə şəhladur ki, türki-cangəza derlər.
Xədəngi-cansitan ilə cigər qanın tökər hər dəm,
Kəmani-əbruvanın kürzeyi-qövsi-səma derlər.
Camalın gülşəni bəhcət gətürmüş qəlbi-məftunə,
Bu nə gülzardur xoştər ki, baği-dilgüşa derlər.
Şükuft etmiş güli-ariz fəzayi-bustanində,
Gülüstani-İrəmdür kim, qəmu bəhcətfəza derlər.
Gətürmüş xərməni-hüsnün çü xuşə sünbülü reyhan,
Mütərra türrəni gör kim, kəməndi-dilgəza derlər.
Dutub Salik rəhi-eşqin, vəfa kuyin qılub məskən,
Nəzər qılsan dili-zarə, vəfalu padişa derlər.

□□□

Niqabi-türrəni mah rüxündən eylə kənar,
Dutulqac ay, əyandur, cahan olur şəbi-tar.
Yetəndə bədri-münirə xüsufi-türrəsəmən,
Fəzayi-aləmə qovğa salur siğarü kibar.
Güləlє sünbüllə örtmə afitabi-yüzün,
Küsufi-şəmsdə yeksər dutar cəhani qubar.
O əgri telləri qılma işarə mahi-rüxə,
Şəqqi-hilaldə şuriş fəzayi-dəhri dutar.
O zülfi-ənbərfami kəməndi-gərdən elə,
Cünunə lazım zəncirdür səlasili-tar.
Həmayil et sinəmə geysuvani-müşkini,
Di qoy bu çənbərə tovq olsun əfiyi-şəhmar.
Tərəhhüm et könülə, bürqeyi-mahi-rüxün sal,
Neşün ki, aşiqi-məhi-tələtündü Saliki-zar.
O küfri-zülflərün rəxnə saldi iymanə,
Apardı deyrə məni, bağladı belə zünnar.

□□□

Naseh, məzaqi təlx qılub söyləmə səmər,
Əfsanə şəni-zahidə layiqdürür məgər?
Bəs elmdən yoxundu xəbər, yeydürür sükut,
Çün elmi-eşqi dəftərə nəqş etmiyüb qədər.
Söz tə’n ilə ədib dilindən rəva degül,
Vermə kəlamə tul, sözü söylə müxtəsər.
Girmüb təriqi-eşqə xirədmənd dəhr ara?
Dutmub fəna rəhini məgər sahibi-hünər?

Qoy bir qədəm bu kuyi-vəfayə, bir aç gözün,
Ərbabi-dil rüsuminə bir ləhzə qıl nəzər.
Salma həras şəhri-dilə xövfi-nar ilə,
Yeydür sənün mücaləsətindən bəna səqər.
Zahid, sənün canan ilə huriyü səlsəbil,
Bəsdir bəna nigar, zülali-ləbşəkər.
Firdovsi-sidrə, sayeyi-Tuba sənə nəsib,
Ruzi bəna o sayeyi-qüdsiyü mukəmər[41].
Salik dutubdu eşq səbilini dəhr ara,
Tərk eyliyübdü zöhd rəhini, çü mərdvər.

□□□

Nigara, mah rüxsarun sanasan mehri-ənvərdür,
Könül şəhrini nurani qılan mahi-münəvvərdür.
Fəzayi-kişvəri-qəlbə salan tabi-cəbinindür,
Məşamə ənbəri-sara dutan zülfi-müənbərdür.
Füruzi-kişvəri-xatir füruği-şəmi-tələtdür,
Müəttər arizu kamin qılan geysuyi-ənbərdür.
Camalun xuri-aləmgir, arizin mahi-dilaradur,
Müfəttən mürği-dil dami gülalə sünbüli-tərdür.
Şəbistani-zəmin pürnur olub şəmi-üzarindən,
Füruği-məşəli-ruyun zibəs xurşidi-xavərdür.
Nə kişvərgirdür hüsnün, şüai aləmi dutmuş,
Müsəxxər eyləyən afaqi yeksər bədri-ənvərdür.
Sükunü səbr xatirdən alubdur qaməti-rəna,
Dilü didə qılan məftun səhi sərvi-səmənbərdür.
Könül aramını yeksər alan nəğzini-peykərdür,
Qərari-xatiri dildən çəkən qəddi-sənubərdür.
Axan Təsnimü Kövsərdür dəmindən ləli-meygunin,
Həyatbəxşi-ləbi-təşnə zülali-ləli-şəkkərdür[42].
Fəzayi-kuyi-eşqində gəzən Salikdü sərgəştə,
Xudara, dut əlin, rəhm et, pərişanhali-müztərdür.

□□□

Nigara, kuyi-eşqindür ki, üşşaq andə işləllər,
Fəna mülkün qılub məskən, vəfa kuyində qışləllər.
Ləbi-şəkkər zülali bəs cəm etmiş arizü şəhdi,
Təmənna kaminə ləlin yetən saətdə dişləllər.
Atallər tənə taşini pərişan xatirə bir-bir,
Rəhi-eşqində qəmmazın dili-rəncuri nişləllər.
Nigahbandur çü aşiqlər damojnuyi-vüsalində,
Mətai-kişvəri-hüsnün yaşursən, andə şişləllər[43].

Tələbkari-rəhi-vəslün olub ol kim ki, bidildür,
Vəfa kuyin dutub məskən, neşün, ol yurti xoşləllər.
Nihali-qaməti-rəna yetüb bəs həddi-mövzunə,
Turəncin xəstə xatirlər görən saət xahişləllər.
Gülüstani-cəmalində açılmış hər tərəf güldür,
Nə gülşəndür, gülü bülbül qucub, hər yan öpüşəllər.
Xoş gülzardur, Salik, hər ol gül, dil ola mail,

Müyəssərdür tələbkarə, bu gülşəndən bəxişlələr.

□□□

Hicrani-güldə bülbüli-şuridə zar olur,
Şəb ta səhər sirişk tökər, dilfigar olur.
Xunabeyi-cigər səpübən rahi-gülşənə,
Gül həsrətilə ah çəkər, dil nəzar olur.
Xunabi-didə bəs ki, tökər tabi-sinədən,
Suzi-cigərlə qəlb yanub dağdar olur.
Şurə gəlür səhərgəh şəmmi-bəhardən,
Əz bəs məşamə ətri yetər, müşkbar olur.
Həm sübhgəh nəvayə gəlüb hicrəti-gülə,
Əşki-göhərlə dideyi-dil əşkbar olur.
Gülşəndə bəs şükuftə gəlübdür gül atəşi,
Oldur həzarə həsrəti-güldə nəzar olur.
Xatir qılub figar səhər bülbüli-qəmin,
Gülbərg çün nişimənü məvayi-xar olur.
Yəğmayi-dəstbürdi-xəzan gər yetə gülə,
Əlbəttə, bu həvadisə şeyda figar olur.
Salik fəzayi-gülşənə tökmüş sirişki-xun,
Çün hicri-güldə didəsi əbri-bəhar olur.

□□□

Hicri-rüxündə dideyi-dil əşkbardur,
Bu möhnəti-ğəmə genə xatir figardur.
Gözdən nihan olubdu çü gülzari-tələtün,
Ənduhi-dil füzun olubən hali-zardur.
Sərvi-qədin fəraqi qılub ta qamətim kəman,
Məh peykərün cəfası ilə dıl nizardur.
Mürği-xəyalə dami-mihən əgri tellərin,
Qeydi-bəla bu gərdənə rənciri-tardur.
Düzdi-dilim müənbəri-geysuyi-müşknab,
Tərrari-qəlb o silsileyi-müşkbardur.
Vəh, sünbüli-gülalə alub ixtiyarimi,
Taqət tükəndi, səbr gedüb, dil figardur.
Ceyşi-həbəş dutubdu hamı kişvəri-rüxün,
Müstəhfizi-cəmal, neşün, zəngbardur.
Salik əsiri-türreyi-tar oldu, həbs edün
Ol çahdə ki, çevrəsi əqrəblə mardur.

□□□

Yenə tiği-siyəhfami çəkübdür cansitan dilbər,
Həzər qıl türki-məstindən, qılubdur qəsdi-can dilbər.
Necə qəttaldur, xunriz, yoqdur rəhm qəlbində,
Göz ətrafını qan dutmuş, ələ almış sinan dilbər.
Xədəngi-xunçəkanın gör, tamar qan tiri-peykanində,
Çəküb şəstə zehi-qövsi, qılub möhkəm kəman dilbər.
Kəmin eylüb tökə qanım o türki-məsti-xunaşam,
Həzər qıl, tirbarandur ki, bilməz ələman dilbər.

Gəlür tiri-cəfa bir-bir, dil üzrə nuki-müjgandur,
Saqin, ey qıymıyan canə ki, verməz heç aman dilbər.
Kəməndi-zülfi-mişkini salub tabə, dutub ərsə,
Çıxıbdur rəzmgahə, gör bu gün namehriban dilbər.
Qədəm bu ərsəyə qoy bir təhəvvürlə sən, ey Salik,
Kəməndi-türrəyə baş ver aparsun ərməğan dilbər.

□□□

Ey ki, dövrani dutubdur şövkəti-cahin hənuz,
Sahəti-dil görmiyübdür pərtovi-mahin hənuz.
Başə qoydun dilrübalıq tacini bəs dəhr ara,
Qıldı yəğma kişvəri-dil ceyşi-gümrahin hənuz.
Yusifi-Kən’an kimi mehri-cəmalun aləmə
Qülqülə salmış əzəl kim, tələti-mahin hənuz[44].
Yüz Züleyxanı qılub məftun iki şəhla gözün,
Məstü mədhuş eyləyübdür lə’li-dilxunin hənuz[45].
Sərf qıldım nuri-çeşmi bəs təriqi-vəslinə,
Tutiya olmuş gözə çün xaki-dərgahin hənuz.
Halimi qıldı pərişan möhnəti-cövri-rüxün,
Miği-muyin bəs nihan qıldı rüxi-mahin hənuz.
Rahi-eşqin Salikinə bir nigah et, lütf qıl,
Ta təsəlli xatir etsün talibi-rahin hənuz.

□□□

Can zardu,dil nəzar sənsiz,
Canü dil olub figar sənsiz.
Ey şahidi-məhvəşi-yeganə,
Dünyadu gözümdə xar sənsiz.
Səbrim tükənib, gedüb qərarım,
Etməkmi olur qərar sənsiz?
Payanə yetişdi nameyi-ömr,
Əldən gedüb ixtiyar sənsiz.
Hicrində kəman olubdu qamət,
Çeşmim olub əşkbar sənsiz.
Xunabə olub rəvanə gözdən,
Key munisi-gülüzar sənsiz.
Rövşən günüzüm oludbu yəlda,
Tar oldı bu ruzigar sənsiz.
Cövri-sitəmin yetüb nişatə,
Eyşim olub ahü zar sənsiz.
Sərmayeyi-ömrü sərf qıldım
Rahi-tələbində, yar, sənsiz.
Eşqin rəhini dutubdu Salik,
Daim çəkər intizar sənsiz.

□□□

Xüramə gəldi səhərgəh çü qaməti-tənnaz,
Şəkibi-xatiri yeksər apardı şiveyi-naz.
Çü tərzi-qəmzə dutub dildən aldı aramı,
Necə nihan ola eldən dəxi dilimdəki raz.

Gələndə tərzi-çəmi-pürkirişmə rəftarə,
Qərari-dil hamı aldı çəmi-kirişmətəraz.
Şikargahə çəküb dami-fitnə çün səyyad,
Götürdü çəngə dili həmçü seyd ol şəhbaz.
Dedüm əyan eyləmə, qoy nihan qala dərdim,
Bənimlə bir neçə dəm ta ola o gül həmraz.
Dili-müfəttən əgər aşikari-raz etsə,
Mühaldur,ola bilməz o şux ilə dəmsaz.
Dutubdu eşqi-rəhi-yari gərçi Saliki-zar,
Çe sud, rahi-mərami-vəfa dutub qəmmaz.

□□□

Tələti-hüsnündə dil seyri-gülüstan istəməz,
Mahi-bədrinlə könül xurşidi-rəxşan istəməz.
Qaməti-mövzundən xatir əgər bəhcət bula,
Qaməti-şümşad ilə sərvi-xuraman istəməz.
Zülfi-müşkinün şəkibasın qılan nəvayi-dil,
Ənbəri-Sara qəmilə dil dolu qan istəməz.
Zövqbəxşi-kami-dil olduqda lə'li-ləblərün,
Oldürür bais, könül ləli-Bədəxşan istəməz[46].
Dürri-dəndanın füruğbəxşi-xatir oldu bəsi,
Məxzəni-gövhərlə xatir dürri-qəltan istəməz.
Taqi-əbruyin çü qiblə oldi ərbabi-dilə,
Qibleyi-ami dəxi bu qəlbi-nalan istəməz.
Vadiyi-eşqində, cana, canü dil sərgəştədür,
Rahi-vəslin dutmiyə Salik dəxi can istəməz.

□□□

Arizin gördükdə didə meyli-gülzar eyləməz,
Gülşənü büstanə baqməz, xatir əfgar eyləməz.
Naziri-hüsni-cəmalun ibtihaci-dil edər,
Xatiri-əfgarə bir də həmmü qəm bar eyləməz.
Sayeyi-sərvi-rəvanində fərağət istəyən,
Türrə, ənbər, yasəminə dil giriftar eyləməz.
Ol müqəvvəs qaşlarun taqinə kürniş eyləyən,
Qiblədən yüz döndərər, millət ara ar eyləməz.
Gülşəni-hüsnün gülündən bəhcəti-xatir bulan,
Nərgisi-fəttanə baqməz, meyli-gülzar eyləməz.
Ləli-meygunindən ol cami-məvəddət nuş edən,
Məst olur, mədhuş könlün hiç hüşyar eyləməz.
Daneyi-xali-rüxün sirrini təhqiq etsə dil,
Səfheyi-dörandə meyli-xətti-zəngar eyləməz.
Sirri-vəhdət mülkinə əzm eyliyən, Salik, yetər
Şahidi-əsrarə, meyli-nəqşi-divar eyləməz.

□□□

Aləmə sirri-nihani faş edər izhar söz,
Gəh səmər derlər ona, gəh ləfzi-gövhərbar söz.
Bilməyən söz qədrini, bilməz nişati-cavidan,

Bir göhərdür dürcdə, gər olmiyə təkrar söz.
Xabi-qəflət gər duta göftardə söz sahibin,
Hər nəfəs mümkündür ani eyləyə bidar söz.
Dilrübalıq rəsmdə bir məhvəşi-gülçöhrədür,
Göstərər ol pərdeyi-əsrardən rüxsar söz.
Xazini-gəncineyi-fəhmi-kəyasətdür, düzər
Rişteyi-göftarə dürri-lölöi-şəhvar söz.
Bəhri-sözdə olmiyən ğəvvas təhsil eyləməz
Mərifət lövhündə yeksər gövhəri-rəftar söz.
İzzət istərkən, sözdən az eylə, Salik, dəhr ara
Kim, çoq olmaqla qılıbdur sahibini xar söz.
Söyləmə əfsanə çoq də, bilgilən söz qədrini,
Ləğləği derlər kişi gər eyliyə təkrar söz.

□□□

Könül nə növ eylər meyli-gülüstan sənsiz
Ki, xardur gözümə bağü bustan sənsiz.
Nişati-eyşə əgər qəlb eyləsə iqbal,
Süruri-xatiri yeksər ola fəğan sənsiz.
Vər olsa maili-gülzar dideyi-dili-zar,
Gözümdə xar olu yeksər güli-cinan sənsiz.
Yetişsə gər nəzərim qaməti-səhisərvə,
Qılar o qaməti-rəna qəddim kəman sənsiz.
Yetə məşamə əgər buyi-sünbülü reyhan
Ki, yadi-türrə qılar xatirimi qan sənsiz.
Nişat qılsa könül gülsitan seyrindən,
Bahari-eyşim olur dəhr ara xəzan sənsiz.
Baqəndə suri gülə, qəm füzun edər könülə,
Neşün ki, gülruxun olmaz gözə əyan sənsiz
Ki, hicri-gülşəni-ruyin qılıbdu qəlbi figar,
Şüari-xatir olub naləvü fəğan sənsiz.
Qəmi-fəraq ilə xunabeyi-cigər şəbü ruz,
Sirişki-didə qılub damənə rəvan sənsiz.
Rəhi-məvəddətinə çün qoyub qədəm Salik,
Bu eşq atəşinə yandı cismü can sənsiz.

□□□

Şahidi-xurdur niqabi-əxzəridə pərdəpuş,
Şöhrəti-hüsnün neşün vermiş ona cami-süruş?
Badeyi-ləlin görüb bəs ruzü şəb gərdiş qılar,
Axtarur sağər fələk bəzmində ol zərrinəpuş.
Gəh şüain sərf edər təhsil edə məh badəsin,
Gəh nihan eylər yüzün meyxanədə ol dordnuş.
Göndərər gəh pərtovun bazari-dəhrə mey içün,
Gəh öpər saqi əyağın ol nigari-pərdəpuş.
Gəh çəkər rüxsardən ismət niqabin, yüz açar,
Sübhdəm meyxaneyi-xavər çü eylər cürənuş.
Gəh çəkər tiri-şüain fəth qılsun meykədə,
Məhfili-meyxaneyi-dəhrə salur hər dəm xüruş.

Dutgilən meyxanə rahin,Salika, qıl ciddü cəhd,
Saqiyi-məhvəş əyağin öp, qıla ta cürənuş.

□□□

Səhni-gülzarə çıxub arizi gülnar bənəfş,
Güzər eylübdü genə gülşənə dildar bənəfş.
Nəmədi-sündüslə fərş qılub sahəti-bağ,
Bustanə döşüyüb məsnədi-zəngar bənəfş.
Ləbi-cu zeyb qılub qaliyi-istəbrəq ilə,
Məhfilarayi-çəmənzardü sərkar bənəfş.
Təkyeyi-said edüb, bəs ki, olub qüssə füzun,
Qəmi-hicrandən olub xatiri-əfgar bənəfş.
Mütəfəkkir nə baxur həsrət ilə rəhgüzərə,
Bilməzəm aşiqdür qəlbi-giriftar bənəfş.
Kəc edüb gərdənini, cameyi-nili sarunub,
Genə dərdi-dil edüb aləmə izhar bənəfş.
Neşün, əfsürdədil olmaq gərək ol tazəbəhar,
Belə məlum ki, məftundil olub zar bənəfş.
Eşq dərdi dilinə tab salub, zar qılub,
Aşikar etməgə dərdin eliyüb ar bənəfş.
Salika, eşq təriqin ələ dut, ar eləmə,
Çoqdu həmrazi-rəhin kim, biridür zar bənəfş.

□□□

Ləbi cu mayilidür dideyi-müştaq bənəfş,
Oldürür təkyeyi-said eliyüb saq bənəfş.
Həmə ca sahəti-gülzarə çəküb xərgəhini,
Güli-novruzə olub əhd ilə ortaq bənəfş.
Münhəni qaməti gör, əldə əsa seyrə çıxub,
Bəzmi-gülzarə girüb gör necə dustaq bənəfş.
Özünü üzlət ilə guşeyi-bustanə çəküb,
Rahi-təcrid dutub tazəcə sərsaq bənəfş.
Nə müzəvvirdü qılub künci-xərabat muqam,
Camə təğyir qılub səbz qəba aq bənəfş.
Ovr olub, caməsini məkr ilə təndən cıxarub,
Bağçegərd olub peykəri çıplaq bənəfş.
Rəhi-təzvirə girüb dutma riya damənini,
Salika, dutma dəxi məsləki-üşşaq bənəfş.

□□□

Ey səba, bu hali-zarım qıl gələn dildarə ərz,
Bu pərişan xatirimdən şəmmei et yarə ərz.
Dərdi-hicranın tükətdi ömrümü, qəddim büküb,
Haləti-qəlbi-qəmini qıl pərirüxsarə ərz.
Yadi-ğəmzi-nərgisün xatir şərərbar eyliyüb,
Kol şərari-işvədən eylər dili-əfgarə ərz.
Gülşəni-hüsni-cəmalun arizu eylər könül,
Bir məşami-xatirə gül ətrin eylə barə ərz.
Bülbüli-əfsürdeəm, gülzardən məhrumi-dil,

Əndəlibin halini gəl eylə ol gülzarə ərz.
Bir şərərdü bu dili-pürtabdə hicri-rüxün,
Suzi-dildən Tanrı içün et rüxi-gülnarə ərz.
Can mətai cismim içrə bir əmanətdür rəhin,
Bu mətai al, yetür ol ləli-gövhərbarə ərz.
Rahi-eşqün Saliki divaneyi-sərgəştədür,
Bu cünun halin bir eylə ol pərirüxsarə ərz.

□□□

Ey könül, uyma cəhanə, qılma əqdi-irtibat,
Kim görübdür bu fəna dar içrə feyzi-inbisat?
Qət’i-mənzildən müsafir xatirə yoqdur güriz,
Qəflət etmə, bu xətərdən dut təriqi-ehtiyat.
Bədrəqə yox, dərd çox, bulmuş təriqin pürxətər,
Mənzilin bu vadiyi-heyrətdə bir viran ribat.
Can mətaini yaşurməq kim, sibai-vəhşdən,
Səhl əgər olsa müyəssər xatirə zövqi-nişat.
Bədrəqə eylə bu rahə, şahi-valahimmətin,
Ta yetirsün mənzilə, mümkün bulunsun inbisat.
Salika, gər talibi-dildarsən bu rahdə,
Neşə mümkündü səfər əsnaidə eyşü nəşat?

□□□

Dürci-ləlindür tökər hər dəm dürri-şəhvar ləfz,
Gövhəri-səmmin tüzər hər riştəyə göftar ləfz.
Qönçeyi-ləlin lətafət ilə olub həmraz kim,
Hər nəfəs eylər mühəyya gövhəri-əsrar ləfz.
Ol sədəf lövhində pünhan nitqi-ləli-şəkkərün,
Bir fəridə dürrdür, hər saət eylər bar ləfz.
Ləfz mirvaridə bənzər, bibəhadür dəhr ara,
Bulmuyubdur qədrini ol kim, elər təkrar ləfz.
Qönçeyi-ləli-ləbün sirrini kim təhqiq edər,
Gər şükuftə gəlmiyə, mümkün degül izhar ləfz.
Salika, əqdi-göhərdür müntəzəm ləlin düri,
Kim deyür əfsanədür nəzmi-düri-şəhvar ləfz?

□□□

Eşq sevdasi dilə rəhbər olub yarə tərəf,
Oldürür didə baxur arizi-dildarə tərəf.
Cəzbeyi-şövq salub başə neşün zöhrəcəbin?
Mərdümü valeh edüb ol məhi-rüxsarə tərəf.
Girehi-zülfi-təsəlsül dili dəstgir eliyüb,
Aparur məhbusu kim, türreyi-tərrarə tərəf.
Şəhdbiz olduğdə təngi-şəkər kami-dilə,
Arturər meyli-ləbi ləli-şəkərbarə tərəf.
Xəstə xatir bəs olub sibzənəx möhtacı,
Təbi mail eliyüb nəxldəki narə tərəf.
Əndəlibi-dili-məftuni qılub lalü xəmuş
Ki, neşün, mail edüb tutiyi-goftarə tərəf.

Mərdümi-çeşmi müfəttən eliyüb arizi-gül,
Baxuri həsrət ilə ol rüxi-gülzarə tərəf.
Şəmi-rüxsar rəhi-Saliki rövşən eyliyüb,
Rəhnümuni olub ol arizi-gülnarə tərəf.

□□□

Bülbül ki, çəkər nalə gülüstandə mütləq,
Həqqa ki, səni yad elər əlhandə mütləq.
Hər ləhzə düşər narə kim, ol pərtovi-ruyun,
Pərvanə yanar atəşi-suzandə mütləq.
Xurşidi-rüxün Yusifi-Kənanə çü düşdü,
Yəqubi qəmin eylədi əhzandə mütləq.
Hüsnün əsəri arizi-Şirinə yetişdi,
Lə’l eylədi Fərhad ürəgin qandə mütləq[47].
Eşqün şərərindən çü salub başinə sevda,
Məcnundu, deyər Leyli biyabandə mütləq[48].
Hicrində gözüm yaşi bəna bəhri-bəladur,
Qərqabi-bəla neyləsün ümmandə mütləq.
Sahibnəzərə heyəti-nəqşi-həmə aləm,
Bir nöqteyi-mövhumdur insandə mütləq.
Kibr etmə vücudun ilə bir xaki-cahanda,
Gör fərq nədür adəmü şeytandə mütləq.
Qəlb ayinəsin zəngi-kədərdən eylə sən pak,
Məlum olur surəti-nsandə mütləq.
İnsaf qıl, ey müddəi, aç çeşmi-bəsirət,
Gör şübhə sözü sidqlə böhtandə mütləq.
İnkarü iba, şiveyi-təslimü riza həm,
Bil, təcrübədür küfr ilə imandə mütləq.
Kizb əhlidür ol eşqdə bəs qıymıya canə,
Sadiqdürür ol baş qoya meydandə mütləq.
Əmmaməvü təsbihü əsa, xatəmü misvak,
Əsbabi-riya məzhəbi-irfandə mütləq.
Xuddarlıq etmə, bu rəhi-eşqdü, Salik,
Can ver ki, riya şivəsi yoq candə mütləq.
Əfsus ki. bu dəhrdə insafü ədalət,
Ənqavəş olub rəsmi-müsəlmandə mütləq.

□□□

Müshəfi-vəchdə mişkin xətin, ey ayəti-həqq,
Dərsi-üşşaqdu bəs ki, oqunur halü səbəq.
Nöqteyi-səfheyi-rüxsarinə gər qılsa nəzər,
Sirri-təhqiqi-məani edər idrak xələq.
Dəftəri-arizinə səbt olalı nəqşi-xütut,
Şərhi-təcridi-məani elər əndami-vərəq.
Əhli-idrakə nə şəkk məniyi-əsrari-hüruf,
Surəti-nöqteyi-mövhümlə məfhum oləcəq.
Tələtün nuri dutub gün kimi afaq yüzüni,
Sahəti-dəhri münəvvər eyliyüb zöv’i-fələq.
Miği-muyində üful eyləyə gər mehi-ruxun,

Şükrlilləh, dutub afaqi şüa ilə şəfəq.
Bədri-kamil çü olub mahi-rüxün, örtmə dəxi,
Nə rəva bir də məhaq ilə duta dəhri qəsəq.
Güli-gülzari-camalun eliyüb bəs ki, şükuft,
Ətrbiz etdi məşami-dili pürğönçə təbəq.
Talibi-ləli-göhər Saliki-rahindü, gərək
Bəhri-eşqində təlatümlə qıla cismi qərəq.

□□□

Gülşəni-hüsnün kimi aləmdə bir gülzar yoq,
Qamətin tək gülsitandə sərvi-cuybar yoq.
Gül üzarun cilvəgər oldu çü çeşmi-xatirə,
Dideyi-məftunə ruyin tək dəxi gülnar yoq.
Dil xilas olmaz füsuni-nərgisindən bir zaman,
Bu nə cadudur, cahan içrə belə məkkar yoq.
Məhfili-aləmdə qeyri-sağəri-ləli-ləbin,
Kambəxşi-xəstələb, bir ləli-şəkərbar yoq.
Şəhdbizi-kami-xatir oldu təlin şəkkəri,
Nitqi-ləlindək neşün şəhdi-şəkkərgöftar yoq.
Peykəri-rəna xurami zail etdi əqlimi,
Qaməti-şümşaddə bəs ki, belə rəftar yoq.
Zülfi-müşkinün kəməndə çəkdi məftun xatiri,
Dil müqəyyəd etməgə türrən kimi tərrar yoq.
Türki-məstin dəstgiri çoxdürür məftun könül,
Leyk ol məhbuslərdə mən kimi bir zar yoq.
Sağəri-ləlin buldi zövqi-dil, Salik, genə,
Meygüsarində mənin dək bir dili-xəmmar yoq.

□□□

Nişati-dil füzun etməz gülüstan gülüzarun tək,
Gətürməz bəhcəti-xatir çəmənruyi-bəharun tək.
Könül seydin əsir etdi çü tabi-türrə mişkinün,
Kəməndi-dil nə mümkündür o zülfi-tabdarun tək.
Məgəs qəndi şəkər versə təmənna kaminə hər dəm,
Məzaqi şəhdi-kam etməz o ləli-xoşgüvarun tək.
Qıya baxmaq ilə nərgis əgər məftun edə mərdüm,
Müfəttən didəmi qılmaz o çeşmi-pürxumarun tək.
Çəmü nazi-qədi-rəna alub arami-dil yeksər,
Görülmüb işvə rəftarı xürami-xoşmədarun tək.
Turənci-ğəbğəbin mislin gülüstan bulmuyub hasil,
Nihali-bustan bəs ki, səmər verməz ənarun tək.
Nihan etmə məhi-ruyun, cəfa qılma dili-zarə,
Könül şəhrini tar etmə o türrə müşkbarun tək.
Xəti-mişkinə maildür dili-Salik yüzün görgəc,
Nəzarətbəxşi-dil qanı xəti-mişkin üzarun tək?

□□□

Yüzün cövri yetər hər dəm dilə bərqi-füruzan tək,
Salub bəs ki, dili tabə, olur dil nari-suzan tək.

Cəfa eylər məh ruyun, hicabə çün girər hər dəm,
Könül dərdi-fəraqində olur zari-pərişan tək.
Qılar möhnət dilə mehri-rüxün, bəs ki, olur pünhan,
Dili pürtab elər hicri füruği-mehri-taban tək.
Sitəm qılduğdə xurşidi-üzarun xatiri-zarə,
Şərərəngiz olur xatir, yanur qəhr ilə niran tək.
Füruzan hüsnüvi, cana, nihan qılma bu mərdümdən,
Cəmalun görməyə gər göz tökər xunabi-dil qan tək.
Dilü can maili-ruyun olub rüxsarun gördükdə,
Füruğun sal dilü canə ruxun mehri-füruzan tək.
Dutub eşqin rəhin Salik, gəzər sərgəştə kuyində,
Tələttüf eylə, cananım, müdarun olsun ehsan tək.

□□□

Bir rüxi-gülnardən başda, könül, sevda gərək,
Ol güli-rüxsarə aşiq kim, dili-şeyda gərək.
Gər xürami-qəd səhi qılsa müfəttən mərdümi,
Gilvəgər çeşmi-dilə bir qaməti-rəna gərək.
Xublər rüxsarunun sevdası tüşsə xatirə,
Eyşi-dil əfzun edən bir gülruxi-ziba gərək.
Kim dili-şeydadə şövqi-seyri-gülşən olsa vər
Dideyi-məftunə mənzər bir güli-həmra gərək.
Çün zülali-ləli-meygunə müfəttən bulsa dil,
Zövqi-xatir arturən bir sağəri-səhba gərək.
Kim ki, başə şuri-şövqi-peykəri-rəna salub,
Cilvəgər məftun gözə qəd sərvi-dilara gərək.
Salika, bir şahidi-ziba alub arami-dil,
Rahi-eşqin dutməqə dil aşiqi-rüsva gərək.

□□□

Bədi'i-hüsn görülmüb sənün kimi kamil,
Odur ki, mehri-rüxün hər dilə olub şamil.
Füruği-nuri-cəmalun qılub cahanı münir,
Hilali-tələtünə hər görən olub mail.
Bu afitabi-səmadur və ya məhi-ənvər,
Cəmii-basirədə pərtovi dutub mənzil.
Nə hüsndür ki, salub şur məhfili-dəhrə,
Görən cəmalini yeksər olur çü valehi-dil.
Nə şux nərgisdür,nazi, ğəmzi tərk etməz
Ki, bir qıya yaxışı əqlü huş edər zail.
Bu türki-məstün olub adəti sinan çəkmək
Ki, xəncəri-müjəsi hər dilə olur qatil.
Kəman ələ çü alur, navəkin qılur pürtab,
Sədayi-əlhəzərindən könül olur hail.
Müjə xədəngin atar sinəyə, aman bilməz,
Mühaldur sitəmindən xilasi-məftun dil.
Alur qərari-dili-Saliki rəhi-eşqi,
Şəkibü səbr könüldən elər hamı zail.

□□□

Tərki-xabü xor edüb, bir-iki dəm bidar ol,
Fövti-fürsət nə rəva kim, neçə dəm huşyar ol.
Nagəhan peyki-əcəl rahi-məsammatı dutub,
Müjdeyi-mərg verür guşi-dilə, əyyar ol.
Nəqdi-ömrü eyləmə cinsi-həva rahinə sərf,
Can mətain al ələ, bir mələki-tüccar ol.
Şeydü rizq ilə əməl dutma, riyanı elə tərk,
Dəlqi-rindanə geyüb, arifi-nikətvar ol.
Qılma təzvir dəxi, dutma təcərrüd yolunu,
Kuyi-eşqə yeri bir, aşiqi-məhrüxsar ol.
Üzlətə qoyma qədəm, tərk eylə xudbinligi,
Sirri-vəhdət tələb et, müxbiri-hər əsrar ol.
Həlqeyi-rində girüb zöhdi kənar eyləgilən,
Canibi-meykədəyə Salik olub, xəmmar ol.

□□□

Çeşmi-aləm görmiyüb bir sən kimi ziba gözəl,
Kəsmənəm ümmid səndən, yetməsə peyki-əcəl.
Gör necə rəna gözəlsən yoqdu mislin dəhr ara,
Çəkmiyübdür lövhə timsalun sənün sün'i-əzəl.
Afərin, sün'i-cəmili-nəqşi-ziba, afərin,
Bu necə surətdü salmış kainat içrə cədəl.
Kuyi-eşqindən dedüm mən' eyliyüm şeyda dili,
Sölədi: mümkünmüdür təğyiri-təqdiri-əzəl?
Bağlamaz surət xilasi-eşqdən divanə dil,
Eşqdür bir hali-mümkün, olmaz ol halə məhəl.
Vəhm qıldım mən'i-zahiddən bu rahi-eşqdə,
Eşq sultanı yenə tiğin çəküb qıldı cədəl.
Sölədi: Rüsva gərək aşiq cəhani-bazardə,
Əql kuyində verülmüb aşiqə cayi-məhəl.
Eşq rahindən kənarə, Salika, qoyma qədəm,
Şiveyi-namusi tərk et, həmçü Qeysi-bibədəl.

□□□

Xatirə salmış fələk hər ay qaşından bir xiyal
Kim, səbəb olmuş, hər ay başı qılub qaşın hilal.
Görgəc əbru məhvəşin sərgəştə oldi mahi-nov,
Şəhrlər seyri urar, avarə eylüb mahü sal.
Hüsnünə qarşu durub izhari-hüsn etdi kamal,
Oldürür rüxsarinə gərdun verər bir-bir zaval.
Sübh göstərdün yüzün, xurşid oldi bürqəpuş,
Şam gördü talətün, rüxsarin etdi zərdü al.
Eyləsə pünhan gözümdən xalini dövri-ləbün,
Dudi-ahimdür, gərdunə tüzər xali-məlal.
Gər yetürsəydi qubari-rahini məh arizə,
Etməz idi zəfi-tale gunəsin təğyiri-hal.
Daməni-xurşiddən əl çəkmə, Salik, mah tək,

Mehri-rüxsar ilə olsa dildə əzmi-ittisal.

□□□

Talibi-dildar olsan, istəsən bəzmi-vüsal,
Dilfigar olmaq bu rahin rəsmidür, xatir məlal.
Kamyabi-vəsli-yar olmaz cəhan aşiqləri,
Dudi-ahi-sərd bəsdür, xatiri-əfsürdə hal.
Aşiqü məşuq rəsmi mümkün olsəydi əzəl,
Mahü mehr ilə görərdi çərx rəsmi-ittisal.
Leyliyü Məcnundə salmazdı cəfayi-cövri-dəhr,
Təfriqə taşın arayə mahü mah, salü sal.
Vamiqi Əzradən etməzdi cüda dadi-fələk,
Dəhr qılmazdı şüari-xatirin əfğanü nal.
Kim, qəza surətgəri çəkməzdi Şirin nəqşini
Sineyi-Fərhadə aləmdə neçə qərn ilə sal.
Qət'i-ümmid etgilən, Salik, vüsali-yardən,
Yoq müdara dəhr ara əyyami-vəslü ittisal.

□□□

Qıya hər kimsəyə baxsan, gedər andən qərai-dil,
Olur çün mərdümi-çeşmi zibəs hər baxşına mail.
Sükun ilə dil aramı dəxi qalmaz o bidildə,
Gərək kim, guşeyi-çeşmün ola ol mərdümə mənzil.
Xumarin nərgisi-şəhla qılar bir nim xənd ilə,
Dilü can kişvərin qarət, görər çün mərdümin qafil.
Kənari-çeşmeyi-nuşə güzər qılmaq gərək hər dəm,
Həbəş mülkün qərar etmək dili-məftunə sərmənzil.
Alur məkr ilə dil şəhrin, dutar çün şiveyi-nazi,
Nə cadudur, füsunindən xilas olmaq olub müşkül.
Kirişmə, işvə rəftarı mübərhən hər nigahində,
Alur bir qəmzlə halət, qılar bəs ki, səni bidil.
Bu şəhlayi-füsunsazə dilü can nəqdini tabşur,
Neşün, ol şux sevdası alubdur ixtiyari-dil.
Təəllüq damənin kəsmək gərəkdür, Salika, yeksər,
Vüsali-qürbi-cananə dilü candur olan hail.

□□□

Mərifət rahində bəsdür saqiyi-məhvəş dəlil,
Arif oldur zövqi-səhbadən bula rahi-cəmil.
Rəhbəri-arifdə istedadi-ilham olsa gər,
Şahrəhdə hər biri zərratdur, bir Cəbrəil[49].
Hər kişi əzmi-dilə təqdirdən rəhbər gərək,
Aşiq istər vəsli-yarin, zahid istər səlsəbil.
Hurü cənnət istər ikən rahəti-canin sevər,
Bu həmaqət rəsmdür, dutmuş ələ miskin, bəxil.
İzzəti-dari-bəqa qılsan tələb, xar et özün,
İzzəti-dari-fəna eylər səni andə zəlil.
Vədeyi-vəslin xəyali çəkdi dami-zülfünə
Kim, əməl tul istəsə, sərmayədir ömri-təvil.

Salika, zikri-cəmali-xub ilə xoşxatirəm,
Şükr kim, kəsb etmişəm aləmdə bir zikri-cəmil.

□□□

Təşneyi-vəsli-zülaləm, abi-heyvan istəməm,
Küşteyi-tiği-hilaləm, dərdə dərman istəməm.
Küfri-zülfün görmüşəm, dəm urmazam imandən,
Şəmi-rüxsarinlə xurşidi-rəxşan istəməm.
Zairi-xaki-dəründə hurü cənnət meyli yoq,
Gül üzarın görkəli seyri-gülüstan istəməm.
Dudi-ahim gər dutubdur sahəti-gərdun yüzin,
Bu dili-pürtab ilə ol hüsnə nöqsan istəməm.
Atəşi-eşqində yandırdın könül qəmxanəsin,
Xatiri-bəhcət mədarim bil ki, viran istəməm.
Zərrei-bak etmənəm rüsvayi-aləm olsam ər,
Eşq sevdasində bir dəm dərdi-pünhan istəməm.
Salika, bir şahidi-məhvəş rəhini dutmişəm,
Məhfili-aləmdə bil kim, qeyri-canan istəməm.

□□□

Xublər xaki-dəridir səcdə ayinim bənim,
Bəs ki, bir ziba gözəldür dəhr ara dinim bənim.
Bağiban, sərvi-səhidən aşiqə çoq söləmə,
Ol səhi qamətdü dari-bəhcətaginim bənim.
Nəstərənü nəsrindən, gülzar, çoq da urma dəm,
Arizi-gülnardır gülşəndə nəsrinim bənim.
Kakili-zülfi-səməndən zikr qılma, cuybar,
Şəmmi-zülfi-ənbərindür nafeyi-Çinim bənim.
Sibü narəncü türəncin bu qədər vəsf eyləmə,
Bəsliyüb bu nəxli-dilkəş nari-şirinim bənim.
Suri-gül rüxsarini çəkmə nəzər bazarinə,
Bir pərivəş çöhrəgüldür güldə təhsinim bənim.
Salika, gülzari-dəhr eylüb şükuftəbün güli,
Leyk dəhr gülşənündə bəsdü gülçinim bənim.

□□□

Dedim ki, meykədədən xatiri kənarə edəm,
Bu bülhəvəs dilə mümkünmidür ki, çarə edəm?
Olanda rind qəmu məsti-ləli-peymanə,
Rəva degül məni-müştaq ona nəzarə edəm.
Cünun xatiriə, yaran, əlac edün mey ilə,
Əgər ki,bəzmi-tərəbdən ani kənarə edəm.
Müdara gər qıla bu bəxti-vajgun, şayəd,
Bir-iki cam ilə çarə dili-figarə edəm.
Gədayi-meykədeəm, məsti-pürxərab olubəm,
Necə olur özümü bəzmdən kənarə edəm?
Əgər zülali-ləbi-ləldən əta qıləsən,
Bu pirlik mərəzinə yəqin ki, çarə edəm.
Çü qönçə xürrəmü xəndə, ləbi-şükuftəvü dil,

Səbuyi-zərkeş ilə bəzmi-dil əmarə edəm.
Əgər ki, Salikə saqi yenə duta bir cam,
Ümid var ki, həmi zindəgi dübarə edəm.

Dil giriftari-şikəntürreyi-tərrar olubəm,
Dami-geysuyi-müənbərlə bəsi zar olubəm.
Girehi-zülfi-rəsəntabə düçar oldu könül,
Oldürür silsileyi-tarə giriftar olubəm.
Kişvəri-xatiri rövşən qılalı mahi-münir,
Maili-xalü xəti-arizi-dildar olubəm.
Zövqi-dil bəs ki, füzun eyliyüb ol çöhrəqəmər,
Valehi-hüsni-xudadadi-rüxi-yar olubəm.
Afitabi-rüxi-məhvəş alub arami-dili,
Qalmuyub taqəti-dil, oldürür əfgar olubəm.
Həsrəti-sağəri-səhba dili pürxun eyliyüb,
Bəs ki, məftuni-ləbü ləli-şəkərbar olubəm.
Dil olub maili-meyguni-ləbi-cami-əqiq,
Təşnələb cür'əkeşi-badeyi-gülnar olubəm.
Salika, meykədə rahin dut ələ, ar eləmə,
Tərki-namuslə mən şöhreyi-bazar olubəm.

Eşq dərdinə giriftar olalı zar olubəm,
Zövq olduqda füzun xatiri-əfgar olubəm.
Səhldür, canə şərarə tökübən cism yanub,
Bu yəman dərd ki, tə'nezədi-əğyar olubəm.
Bu necə şurdu piranə sərə tazə düşüb,
Valehi-hüsni-cəmali-rüxi-dildar olubəm.
Gülşəni-arizə qılduqda nəzər huş gedüb,
Genə bülbül kimi məhvi-güli-gülzar olubəm.
Həsrəti-sağəri-meygun ilə dil qanə dönüb,
Bəs ki, məftuni-ləbi-ləli-şəkkərbar olubəm.
Taqi-əbru çü olub cilvəgəri-dideyi-dil,
Məhvi-mehrabi-cəbin, maili-dərbar olubəm.
Tiri-müjgan ilə əzmi-dil edüb nərgisi-məst,
Səbəb oldur hədəfi-tiri-cəfakar olubəm.
Cilveyi-sərvi-rəvan taqəti-dil yeksər alub,
Bəs ki, məftuni-səmənzülfi-rüxi-yar olubəm.
Mürği-xatir girehi-türrəyə pabəst olalı,
Daneyi-xalə uyub, damə giriftar olubəm.
Dami-fitnə quralı zülfi-müənbər könülə,
Məhbəsi-silsileyi-türreyi-tərrar olubəm.
Göhəri-didə ilə Saliki-rahi-tələbəm,
Güli-rüxsarına oldur ki, xiridar olubəm.

Eşq dərdindən yürəkdə bir mərəz var, ey həkim,
Bu mərəz əsrarini etməm mən izhar, ey həkim.

Kim, mətəbbi-dəhrdə dərman bulunmaz dərdimə,
Qoy məni, bu dərdə dərman eyləmə, var, ey həkim.
Əl urub nəbzimlə təşxis etmə hali-dil dəxi,
Zahir etmə dərdi-pünhanimi, zinhar, ey həkim.
Səyi-bihudə qılub təlx etmə kami-xatiri,
Şərbəti-cami-əcəldür dərdimə yar, ey həkim.
Tanrı içün baq şəbi-hicranə bir, suzi-dilə,
Qıl həzər ruzi-cəzadən, etmə azar, ey həkim.
Çəkmə zəhmət çareyi-dərdimdə bica, ey təbib,
Eşq dərdinə dəva aləmdə gör var, ey həkim?
Qət’i-ümid eylə, Salik, səhhətindən çəkmə rənc,
Qabili-səhhət bulunmaz böylə bimar, ey həkim.

□□□

Salubdur arizə pərdə çü şahidi-gülfam,
Alubdu zövqi-dili, qalmıyub dəxi aram.
Biduni-mütrübü mey zeybi-bəzmi-rind olmaz,
Gərək ki, zivəri-məhfil ola o güləndam.
Gəlübdü tabə könül, pürşərər qılub cigəri,
Zülali-sağəri-ləldən istəyür dil kam.
Gətür o badeyi-meyguni, saqiya, dut əlim,
Qərari-xatiri yeksər apardı zərrin cam.
Şərabi-nab ilə nərgis piyaləsin doldur,
Xumari-sər gətirsün, ta müyəssər olsun kam.
Səbuhi-saf yetür ol zülali-biğişdən
Ki, tabi-dil dəxi qoymub sükun ilə aram.
Gətür bərabərə səhba, ətəş qərarım alub,
Yoxumdu bak, zibəs olmuşam bu gün bədnam.
Veribdü Saliki-məftun meyə vərə nəqdin,
Dutanda mütrübi-saqi ləbə səbuhiyü cam.

□□□

Qaməti-rəna, səhiqəd, sərvi-dilara sənəm,
Mahtələt, Müştəritinət, qəmərsima sənəm[50].
Mahpeykər, hurmənzər, şahidi-şəngülü şux,
Məhvəşi-siminüzari-gülrüxi-ziba sənəm.
Türfə dilbər, mahmənzər, acgərdən, mukəmər,
Şahidi-tənnaz, dilkeş, mahi-bəzmara sənəm.
Ənbərin cədi-təsəlsül, geysuvani-müşkfam,
Ətrrizü müşkbizü zülfi-ənbərsa sənəm.
Ol pərirüxsar, xoşrəftar, şahi-tacdar,
Bəzləqgu, şirinsüxən, mahi-cahanara sənəm.
Qabizi-can, cansitan, afəti-cani-cahan,
Fitneyi-axirzaman, məhrüx, mələksima sənəm.
Simtən, siminbədən, gülçöhrəvü qönçədəhən,
Mahru, xurşidtələt, dilkəşi-ziba sənəm.
Qövsi-əbru, tiri-müjgan, çeşmi-cadu, dilfərib,
Şəkkərinləb, şəhdbəxşi-ləli-şəkkərsa sənəm.
Bu gözəl vəsfində, Salik, urma dəm tutimisal,

Çoqləri eylüb sənün tək aşiqi-şeyda sənəm.

□□□

Apardı dildən aramı o qıyqaci-çəpəndazun,
Şəkib aldı çü xatirdən xürami-işvəvü nazun.
Günəş rüxsarini görgəc göz oldu valehi-hüsnün,
Dəm urdu mehri-ruyindən, o dəm çün oldu sərbazun.
Cəmalun mərdümi-çeşmim çü gördü, oldu məftuni,
Tələbkari-rüxün buldu könül olduqda canbazun.
Niqab atdun üzardən, əyan oldu məhi-ruyun,
Hamı bidil olub mail, görəndə ruyi-tənnazun.
Xəti-rüxsarun sirrini əyan etdün çü üşşaqə,
Vəfa dərsi oqurdardun könül olduqda həmrazun.
Rəhi-eşqində can vermək mərami-dildür əvvəldən,
Nə hasil bəs, dutub rahi müfəttən qəlbə qəmmazun?
Üqabi-türrə pürtabun şikar etdi könül seydin,
Əsiri-dami-zülf etdi, çü urdu çəngə şəhbazun.
Rəhi-eşqün tələbkarı olub çoq mən kimi bidil,
Çü dutdu dəhrü afaqi cəmali-seyt avazun.
O şəmi-arizin tabi salub tabə çü pərvanə,
Odur şəmi-rüxün dudin alub üşşaqi-canbazun.
Dutubdu Saliki-bidil rəhi-eşqin, yüzün görgəc,
Qərari-xatiri yeksər çü aldı püstə dəmsazun.

□□□

Yüzün görgəc qərari-dil əlmdən getdi, cananım,
Nə səbri-xatirim qaldı, nə arami-dilü canım.
Rəhi-eşqində sərf etdüm dilü can nəqdini əvvəl,
Çü rəna qamətin gördüm, nə din qaldı, nə imanım.
Xürami-nazə gəldikdə qədi-ziba gülüstandə,
Şəkibi-xatiri yeksər apardı sərvi-bustanım.
Dəxi dil haləti qoymub o qıyqaci-çəpəndazun,
Dönüb bir də qıya baxma, məni öldürmə, sultanım.
Əgər bir guşeyi-çeşmin açub bir də nigah etsən,
Həyati-dil dəxi qalmaz məni-bidildə, tərlanım.
Kəbutərtək dili damə salubdur zülfi-pürtabun,
Kəməndi-türrəyə bir də nə hacət, rəhmsiz canım.
Nə kinə ərsəsi dutmuş genə gör türki-xunxarə,
Xədəngi-cansitan ilə tökər hər dəm cigər qanım.
Müjə navəklərin sancar dili-rəncurimə bir-bir,
Kəmanin bir yerə qoymaz, usanmaz türki-məstanım.
Bu şərhə sinəmə, Salik, atub peykani-pürtabın,
Dələr baqrım başın peykan, tökər dildən qızıl qanım.

□□□

Kami-dil bir də əgər şahidi-dilkəşdən alam,
Əcəb olmaz səri-piranə cavanbəxt olam.
Vər zülali-ləbi-meygun yetə bir cür’ə ləbə,
Xızrvəş bəs olu kim, dəhrdə cavid qalam.

Bir də peymaneyi-ləb, cür’əfişani-ləb ola,
Dutaram meykədə küncündə neçə qərn muqam.
Ləbi-ətşani vər ol sağəri-safi qıla yad,
Öpərəm saqi əyağini səhərgahlə şam.
Mahi-badə verə əfruğ əgər bəzmi-dilə,
Məhfili-tari-dili rövşən edər bədri-təmam.

Zivəri-məclisi-rindan ola vər düxtəri-rəz,
Nəqdi-canı rəhi-cananə gərək sərf qılam.
Saqiya, kami-təmənnayə yetür rətli-giran,
Eyləməz rəfi-ətəş gər yetə təşnə ləbə cam.
Dut sürahilə səbu, zərkeşi-səhbayi-səbuh,
Salika, meykədə rahin duta bilməz dili-xam.

□□□

Girehi-zülfə könül oldu giriftar bu dəm,
Çəngi-şəhbazə əsir oldu dili-zar bu dəm.
Aşiyan mürği-dilə piçü xəmi-türrəşikən,
Dili zəncirə çəkübsilsileyi-tar bu dəm.
Bu nə geysudu düşüb tabə, qılub həlqəkəmənd,
Sərməşüb bir-birə çün əfiyi-şəhmar bu dəm.
Əzm edübdür ki, həlak eyləyə məftun könülü,
Alub arami-dili türreyi-tərrar bu dəm.
Dami-fitnə çü qurub sünbüli-əfşan könülə,
Genə mişkin dəm olub xatiri-əfgar bu dəm.
O səmən kakili gör rind kibi aldı dilim,
Çəkdi zənciri-kəməndə o cəfakar bu dəm.
Həbəşizadə əlindən qutaram gər könülü,
Verməcəm dəxi ona eyləyə azar bu dəm.
Nafeyi-seydi-Xütən bir də məşamə yetə gər,
Seydi-xatir elər ol ahuyi-tatar bu dəm.
Xərməni-arizə Salik yetirüb nəqdi-dili,
Xuşeyi-sünbüli-reyhani qılub bar bu dəm.

□□□

Məhfili-dildə füruği-tələti-yar istərəm,
Neməti-dünya nə hacət, vəsli-dildar istərəm.
Dün məni zahid mədari-eşqdən mən’ eylədi,
Yoq şüuri, bilmiyübdür mən dili-zar istərəm.
Cənnətü hur ilə Tuba sayəsi, zahid, sənün,
Mən ləbi-cananimi ləli-şəkərbar istərəm.
Sufiyi-zərraqə verrəm kövsəri firdövsilə,
Dünyəyü üqbadə bir xurşidrüxsar istərəm.
İstəməm aləm ara cahü cəlalü eyşi-dil,
Mənsəbi-dünyadə birlə bəxti-bidar istərəm.
Bu cahan dari rəqibə gər yetə, yoxdur qəmim,
Ərseyi-aləmdə mümkün olsa, didar istərəm.
Bəhcəti-eyşü nişatü şadimaniyü sürur,
Yeksər əğyarın ki, mən çeşmi-göhərbar istərəm.

Bərbətü çəngü sürudü udü sazü nayü ney,
Qəmusi, mütrüb, sənün, mən birlə mizmar istərəm[51].
Salika, sərgəştəyəm rahində bir gülçöhrənin,
Gül üzarun görməgə didar üçün bar istərəm.

□□□

Mərhəba, firuztale, bəxti-bidar olmuşam,
Bir nigarın rahi-eşqinə giriftar olmuşam.
Qaməti-mövzuninün rəftarı məhvi-əql edüb,
Qədi-xuramanını görgəc xatiri-zar olmuşam.
Türreyi-əfşanitək qıldı pərişan könlümü,
Afiyət qalmubdu təndə, bəs ki, bimar olmuşam.
Dami-giysuyə salub mürği-xəyalim, həbs edüb,
Dilgiriftari-kəməndi-türreyi-tar olmuşam.
Düşdü sevdayi-dilim bir türk əbru qövsinə,
Navəki-müjganinə dil ərz edüb, zar olmuşam.
Tələti-mahin görüb göz oldu məhvü maili,
Qalmıyub arami-dil, oldur diləfgar olmuşam.
Nazü qəmzi-nərgisi-əfsun dili məftun edüb,

Bu necə cadudu, görgəc dilgiriftar olmuşam.
Salika, bu rahdə dil müztərib, heyrani-çeşm,
Talibi-vəsli-rüxi-zibayi-dildar olmuşam.

□□□

Nəqdi-ömrü qəmu sərfi-rəhi-canan eylərəm,
Sazü bərgi dilü can rahinə qurban eylərəm.
Kişvəri-xatiri-məftun həsarini yıxıb,
Qəsri-zəngarini gör kim, necə viran eylərəm.
Məst tavusi genə cəngəlü gülzar ara,
Çəngi-şəhbazə urub, seydi-dilü can eylərəm.
Şahidi-şux həvasilə təfərrüc qılubən,
Arizu kamini gör kim, necə şadan eylərəm.
Gülşəni-hüsnün ətri-gülini töhfə içün,
Şişeyi-qəlb qəmində genə pünhan eylərəm.
O gözəl bağçənün püstəvü badamını həm,
Tömeyi-Saliki-məhzuni-qəzəlxan eylərəm.
Şəkəri-ləli-ləbin, şəhdi-zülali-dəhənin,
Xurişi-ətimeyi-tutiyi-xoşxan eylərəm.
Girehi-türreyi-şəbrəngini mürği-könülə
Aşiyan, sünbüli-giysu ilə reyhan eylərəm.
O mələkmənzəri kim, Misri-məlahətdə genə,
Təxti-izzətdə bu gün Yusifi-Kən’an eylərəm[52].
Dutaram sidqilə ol mahliqa damənini,
Dili-məftuni rəhi-eşqinə qurban eylərəm.

□□□

Ey mələkmənzəri-simaqəməri-zöhrəcəbin,
Nə deyim arizinə mah ola, ya nuri-mübin?

Gün desəm tələtünə, qorxum odur inciyəsən,
Səncə gündür ki, ola bu məhi-rüxsarə qərin?
Bənzəməz qamətinə sərvi-səhi, qəddi-səmən,
Peykəri-hur ola, ya Tubiyi-firdövsi-bərin[53].
Yaxşı saətdə çəküb surətini kilki-əzəl,
Oxşamaz peykərinə şahidi-xur, surəti-Çin[54].
Şuri-avazeyi-hüsnün rüxi-afaqi dutub,
Görməgə tələtüvi şayiq olub əhli-zəmin.
Hər kimin ki, nəzəri ol rüxi-zibayə düşüb,
Aşiqi-ruyun olub, şad eliyüb qəlbi-ğəmin.
Saliki eşqi-rüxün dəhrdə sərgəştə qılub,
Hicrəti-arizi-gül xatirin eylübdü həzin.

□□□

Ələ dutmuş rəhi-canan genə kim, xatiri-nalan,
Çü qılmış mahi-rüxsari müfəttən didəmi heyran.
Günəş rüxsarinə valeh olub didə yüzün görgəc,
Qılıb xirə çü çeşmi-dil füruği-tələti-taban.
Üzari-şəmi-canandan münəvvər oldi xatir kim,
Qılan dəm bəzmi-dil rövşən şərari-məşəli-suzan.
Niqab üzdən götürdükdə nümayan oldu məh çöhrə,
Qərari-taqəti aldı çü nuri-tələti-taban.
Kirişmə, işvə rahini dutanda ğəmzi-şəhlasi,
Könül şəhrinə əl tapdı füsuni-nərgisi-fəttan.
Füzun qıldı dilim zövqin çü mahi-badeyi-ləli,
Şərabi-nabi-ləlindən hamı məst oldu meyxaran.
Bu gülrux yar sevdasın başə sal, Saliki-məhzun,
Müşəvvəş olma,ver canın, ola sərfi-rəhi-canan.

□□□

Halimi qıldı pərişan zülfi-əfşanun sənün,
Xatiri zar eylədi ol ləli-rəxşanun sənün.
Şəmi-rüxsarun çü düşdü məhfili-canü dilə,
Kaxi-səbrə urdu od dürci-dürəfşanun sənün.
Sehri-qəmzi-nərgisün yıxdı könül viranəsin,
Bağrımı çün şərhə qıldı tirü peykanun sənün.
Tari-türrən bağladı yeksər könül şəhbazını,
Qıldı məva bəs ki, ol çahi-zənəxdanun sənün.
Taciri-əqlə ticarət ögrədüb məxmuri-çeşm,
Nəqdi-cani aldı əldən ləli-ğəltanun sənün.
Saliki çəkdi genə rüsvayiliğ bazarinə,
Dəmbədəm ərzi-məta eylər gülüstanun sənün.

□□□

Sün'i-nəqqaş bənanə çü dutub kilki-bəyan,
Çəkdi timsalini lövhə sənün, ey afəti-can.
Peykərin əksini kim, səfheyi-icadə çəküb,
Kim ki gördü, olub ol aşiqi-qədi-sərvi-çəmən.
Tələtün məhfili-dəhrə çü verib zibi-füruğ,

Həft iqlimi müsəxxər eyliyüb xur besan.
Rüb'i-məskuni füruzan çü qılub mahi-rüxün,
Məh üzar ilə münəvvər olunub bəzmi-cəhan.
Muyi-ruyin xətini xameyi-təqdir çəküb,
Türrə mişkini bəyazi-rüxə "vəlleyl" nişan[55].
Lövhi-rüxsarə qızıl su ilə təhrir olunub,
"Vəzzüha"nun rəqəmi səfheyi-vəchində əyan[56].
Səlsəbili gətürübdür ləbinə lə'li-şəkər,
Abi-Xızri çü rəvan eyliyüb ol təngdəhan[57].
Vər zülali-şəkərin feyzi yetə təşnə ləbə,
Ömri-cavid görər Xızr kimi mürdədilan.
Hər iki nəşədə huşyar olu dil, zövqə yetər,
Qədəhi-nərgisi-məxmurin ilə məst olan.
Salika, sağəri-suzani-ləbi-məhvəşi gör,
Könülə tab salub, qıldı qara bağrımı qan.

□□□

Füruzan qıldı afaqi rüxi-mehri-cəhantabın,
Müsəxxər eylədi dəhri çü məh rüxsari-pürtabın.
Könül şəhrin günəş ruyun sərasər qıldı nurani,
Füruği-bəzmi-dil etdi yüzün nurilə əhbabın.
Çü şuri-sər füzun qıldı şərabi-ləli-peymanə,
Könül zövqünü arturdu zülali-badeyi-nabın.
Dili-məftunimi çəkdi genə zəncirə Məcnun tək,
Kəməndi-xatir oldu bəs o geysuyi-rəsəntabın.
Xəyali-türreyi-mişkinün salub damə kəbutərtək,
Dili-məftunimi, çəkdi kəməndə zülfi-pürtabın.
Zəbani-xamə künd olmuş rüxün vəsfində, dildarım,
Kəmalə çün yetüb hüsnün, nə bilsün həddi-nisabın.
Sənayi-məh üzarində olub heyran dili-Salik,
Çü gəlməz şərhi-təqrirə, nə yazsun kilki-küttabın?

□□□

Fəraqi-yar qərarı alub hamı əldən,
Şəkibü səbrü fərağət gedüb genə dildən.
Niqab bəs ki, salub çöhrəyə güli-ariz,
Həzarədür ki, çəkər nalə hicrəti-güldən.
Bu rəsmdür ki, nihan olsa güllərdə rüxi-gül,
Nəvayi-nalə gəlür iztirabi-bülbüldən.
Ələssəbah tökər didədən cigər qanın,
Gəlir xüruşə səhər iştiyaqi-sünbüldən.
Təvani-tab gedər sinədən, olur mədhuş,
Kunəz zəmani olur lal təneyi-eldən.
Təhəmmüli kəsilür, suzi-dil olur əfzun,
Fəğan çəkər gejələr həsrəti-gül-müldən.
Gülündən ayru düşüb Saliki-əndəlibsifət,
Gəlür nəvayə səhərgah hərarəti-dildən.

□□□

Qıldı heyran didəmi mahi-müniri-tələtün,
Zail etdi əqlimi xurşidi-ziba surətin.
Mərdümi-çeşmi-dili mail qılub mövzun qədün,
Valeh etdi xatiri sərvi-səhi tək qamətün.
Saldı qovğayə başım, şurun çü düşdü başimə,
Səbrü arami-qərarım aldı ziba tələtün.
Ərzi-rüxsar eylədün, aldın nişati-xatiri,
Qoymuri arami-dil kim, heyəti-mahiyyətün.
Nazi-qəmz ilə füsun etdi dilə şəhla gözün,
Bir nigah ilə pərişan qıldı hali-surətün.
Qıldı məftun xatiri jövri-təsəlsül müşkbu,
Bağladı zəncuri-tarə zülfi-hindu heyətün.
Şəhdkam etdi dili əvvəl ləbi-ləli-şəkkər,
Təlx qıldı axiri jövri-fəraqü möhnətün.
Eyliyübdür Saliki eşqün rəhində dərbədər,
Qeysvəş, avarə, vadiyi-heyrət hicrətün.

□□□

Qıl, səba, cananımı müxbir bu hali-zardən,
Vaqif eylə ol nigari bir dili-əfgardən.
Surəti-hali-dili bir ərzə qıl dildarimə,
Tanrı içün bir xəbər ver bu dili-təbdardən.
Atəşi-hicri-rüxün yeksər dutubdur xatiri,
Ha şarərlərdür çıqər başə dili-pürnardən.
Lütf edüb, ruzi-əzəl mahi-müniri-tələtün
Göstərib, aramı aldın qəlbi-atəşbardən.
Bivəfalıq rəsmini bilməm neşün aldın ələ,
Şəmi-rüxsarın yaşurdun dideyi-xunbardən.
Şamlər qanlu sirişkim seyli qərq eylər məni,
Mövcuxiz olduqda tufan çeşmi-əşkbardən.
Dideyi-Məcnuntək səhra yüzin əşkim dutar,
Jari etdikdə sirişki-didəni rüxsardən.
Salikin bir ahi-sərdindən həzər qıl, ey könül,
Qorxuram aləm yana tabi-dili-pürnardən.

□□□

Kaş ki, bir də görəydüm ol güli-rəna yüzin,
Nazü qəmzi-pürfüsuni-nərgisi-şəhla yüzün.
Küfri-zülfin ərz ədəydim köksdə imanə mən,
Tərk edəydim zöhd rəsmin, görgəj ol tərsa yüzin.
Bağlıyub zünnar, məskən eyliyübdü küncu-deyr,
Ta görəydim bir doyunja ol büti-ziba yüzin.
Taqi-deyrə baş qoyəydim səjdə ayini içün,
Ərz edəydim mərdümi-çeşmə Məsihasa yüzin[58].
Həm müğü müğzadə ilə ol müğan vadidə mən,
Rəsmi-ülfətlə görəydim piri-dilara yüzin.
Piri-rəhbərlə buləydim rahi-rüşdi-xatiri,
Döndərəydim bu jəhandən birlə istifna yüzin.
Dut rəhi-hicrani-yari, Salika, kəsmə ümid,

Bil ki, bu yolda görərsən şahidi-ziba yüzin.

□□□

Məh rüxsardən pərdə salub xatiri nizar etdin,
Jəmalun göstərən saət dili-zari figar etdin.
Niqab ol hüsni-kamildən götürgəs göz bolub heyran,
Üzarın sirrini görgəc pərişan ruzigar etdin.
Kəməndi-türreyi-ənbər xəyali çəkdi zəncurə,
Xəti-zəngar məftuni qılub, seydi şikar etdin.
Nə nərgisdür, qıya baxşı apardı dildən aramı,
Gözi məftuni-şəhlayi-dü badami-xumar etdin.
Çü səhbayi-ləbi-sağər könül zövqün füzun qıldı,
Ləbi-müştaqi məftuni-o ləli-xoşgüvar etdin.
Xətü xali-rüxün görgəc nişati-dil bulub hasil,
Odur məftun gözü mail xətü xali-üzar etdin.
Səri-kuyində sərgərdan qılıbsan Saliki-zari,
Çü məftuni-rəhi-eşqin görüb bəs xaksar etdin.

□□□

Girehi-zülfi-təsəlsül çü olub dami-fitən,
Salub ol damə müfəttən dili bəs türrəşikən.
Bu nə geysudu müənbər ki, şəmi-nafə ilə,
Yetürər ətr məşamə genə ol seydi-Xütən.
Nə qəra teldü gəlüb tabə, yetüb tabi-dilə,
Yeksərə payi-dili bağlıyub ol türrəsəmən,
Bəhcəti-dil gətürüb xalü xəti-dövri-ləbi,
Arturub nuri-bəsər nəzrəti-xəzrayi-çəmən.
Qədəhi-nərgisi gör, zövqi-dil əfzun qılub,
Sağəri-ləl dutub bəs ki, ləbə ləli-Yəmən.

□□□

Mehri-rüxsarun münəvvər qıldı dil kaşanəsin,
Mahi-ruyun rövşən etdi xatirim viranəsin.
Məhfili-aləm işıqlandı üzarın şəmidən,
Eylədi valeh füruği-şəm dil pərvanəsin.
Dövri-şəmi-arizin də hər gejə sərgəştədür,
Yandıra ta şöleyi-şəm'ə könül qəmxanəsin.
Tələtün xurşidvəş afaqı dutmuş zöv ilə,
Pürfüruğ etmiş jəhanın cümlə zülmətxanəsin.
Yəxşi saətdə çəküb nəqşi-rüxün sün'i-əzəl,
İntixab etmiş gözəllərdən könül cananəsin.
Müntəzəm qılmış gövhər dəndanın ustadi-nəsəq,
Gövhəri-mənzum tək düzmüş telə dürdanəsin.
Ləblərin ləli-Yəmani tək çü olmuş pürfüruğ,
Bibəha eylübdü kanın yaqut danəsin.
Bu nigarın rahi-eşqin, Salika, dut dəhr ara,
Tuşeyi-rah etğilən ləli-ləb peymanəsin.

□□□

Bülbüli-miskin güli-gülzarın eylər arizü
Tutiyi-dil ləli-şəkkərbarın eylər arizu.
Gər səvadi namə nuri-basirə artursə, leyk,
Guşi-xatir ləhjeyi-göftarın eylər arizu.
Ərməğan ilə dəxi qılma pərişan könlümü,
Müttəsil əfsürdədil didarın eylər arizu.
Meyli-gülşən eyləməz gülzari-hüsnün naziri,
Dəhr ara ol gülbün rüxsarın eylər arizu.
Qaməti-rənayi-sərvə bağ ara qılmaz nəzər,
Vəh, xuraman qəd, xoş rəftarın eylər arizu.
Dil giriftari-kəməndi-türreyi-mişkin olub,
Oldürür geysuyi-müşkbarın eylər arizu.
Səjdə eylər xatirim mehrabi-əbruyində kim,
Bəs ki, taqi-qibleyi-ənvarın eylər arizu.
Saliki-sərgəştə müştaqındürür, divanə dil
Vəslinə talibdürür, didarın eylər arizu.

Xəyali-batili gör kim, Necə vəhş ilə dutmuş xu,
Nihali-ömr təhtinə cəm etmiş gəlleyi-ahu.
Bəsani-Qeys hamundə ənisi-vəhşü teyr olmuş[59],
Başın quş aşiyan dutmuş, ayağdan vəhşə vermiş su.
Kərahət mümkün olsaydı yuqu vəqtində balindən,
Olurdu astan taşindən ikrahi-könül hər su.
O türrə ənbərin dami nə məftun eyləmiş xatir,
Giriftari-kəmənd etmiş, Necə əcdərdür ol geysu.
Əsiri-zülfi-mişkinə tərəhhüm eylə Tanriçün,
Xədəngi-cansitanindən həzər qıl, ey kəmanəbru.
Sual etdim: nədür dövri-rüxündə görsənən mərdüm?
Həbəş jeyşi, – dedi, - kəşt ilə seyri-bəhr edib hindu[60].
O şəmi-arizin hicri şərərbar eylədi könlüm,
Tərəhhüm etmədün bir dəm dili-pürtabə key xoşxu.
Düşübsən dərdi-hicranə, şikayət qılma çoq, Salik,
Mədari-dəhrdür bil kim, cahanda adət olmuş bu.

Müzafati-ləbi-lə’li alubdur ləşkəri-hindu,
Dutubdur çeşmeyi-nuşi sipahi-zəngiyi-bədxu[61].
Rəva görmə yana mərdüm, çəkə həsrət zülalində,
Həlakət baisi olma cahan içrə sən, ey xoşxu.
Dutubdur kişvəri-hüsnün sərasər Zəngibar əhli,
Müsəxxər olmuş ol jeyşə ləbi-lə’li-ruxun hər su[62].
Həbəş jeysi olub kəştinişin ol bəhrdə,
Qılıbdur didəban zəngi nəjadi kim, kəmanəbru.
Salubdur rəxnə imanə o küfri-tellərin, cana,
Könül seydin əsir eylüb kəməndi-əcdəri-geysu.
Həzər etmək gərək, ey dil, o türki-məst cövründən,
Sinani-xunçəkanindən tamar qan, rəhmsizdir bu.
Siyəh mücgan xədənginə qılub sinə sipər Salik,

Atar peykani-qəmzin sinəm üzrə bir-bir ol jadu.

□□□

Atəşi-eşq genə saldı bəni sevdayə,
Mail etdi bir əcəb türfə güli-rənayə.
Məstü mədhuş elədi, valehü sərgəştə həmi,
Laübali buraqur Qeyssifər səhrayə.
Bu nə işdür ki, başə şur salub tazə yili,
Aşiq eylüb genə bir sərvqədi-zibayə.
Bağlıyub mürği-dili rişteyi-giysuyə bu gün,
Bu qədər möhnət ilə başimə salmaz sayə.
Əyagi bağlu gərək bu qəmu divanələrün,
Yoq nəhayət səri-kuyində gəzən şeydayə.
Şərhə-şərhə eliyüb bağrımı ol tiri-mücə,
Etmədi mərhəm bir bu dili-qəmfərsayə.
Nərgisi-məst verər Salikə qəmz ilə füsun,
Eşq rahində salur başini yüz qovğayə.

□□□

Əşki-çeşmim su səpər hər dəm şərari-ahimə,
Ta şərarə urmasun ətrafi-mehrü mahimə.
Könlümi atəşpərəst etdi sənün şəmi-rüxün,
Qıl tamaşa çaki-sinəmdən bir atəşgahimə.
Ha şərərlərdür çıqan tişrə dili-suzandən,
Qıl tərəhhüm bir nigah ilə bu dudi-ahimə.
Atəşi-hicrin şərarə tökdü şəhri-xatirə,
Həq rizasiçün nəzər qıl bu şərari-ahimə.
Mihmanəm bən səna, dut hörmətim bir-iki gün,
Rəsmi-ayinini gözlə, baqmə fəqrü jahimə.
Gör üzarin xətti birlə əks salmış sinəmə,
Qondurubdur gərd mirafti-dili-agahimə.
Salika, əğyardən çoq jövr gördüm dəhr ara,
Sidq ilə birlə sıqındım bu ülüvvi-jahimə.

□□□

Aldı arami-dili türfə nigarım bu gejə,
Şəmi-bəzm oldu çü ol lalə üzarım bu gejə.
Dili pərvanə kimi yaxdı genə hicr oduna,
Girdi fanusə çü şəmi-rüxi-yarım bu gejə.
Qüssədən tabi-şərər canə salub, cusm alışub,
Tükənüb taqət ilə səbrü qərarım bu gejə.
Müşkbu qıldı məşami-dili çün ənbəri-zülf,
Çəkdi zəncurə cünuntək dili-zarım bu gejə.
Gülşəni-arizin etdi gözümi maili-gül,
Türrə sünbül çü qəra qıldı mədarım bu gejə.
Müjə peykanı açub rövzənə könlüm evinə,
Qılmıyub rəhm dilə türkü tətarım bu gejə.
Bağrımı şərhə qılıb navəki-dilduzi-xədəng,
Tabi-dildən ucalub naleyi-zarım bu gejə.

Nəzrdür itlərinə ləxti-cugərpareyi-dil,
Səri-kuyinə əgər düşsə güzarım bu gejə.
Salika, çəkmə ayaq eşq rəhindən sənəmin,
Sərfi-rahi ola gər nəqdi-əyarım bu gejə.

□□□

Atəşi-hicrlə gəl könlümü əfgar eyləmə,
Dərdi-hicranə dili bir də giriftar eyləmə.
Pərtovi-mehri-rüxün xatiri pürtab eliyüb,
Örtmə xurşidi-rüxün, qəlbi şərərbar eyləmə.
Hüsnünə valeh olub mərdümi-çeşmim, sənəma,
Qılma pünhan yüzüni, didəmi xunbar eyləmə.
Maili-mahi-rüxün bəs ki, olub dideyi-dil,
Məh rüxü qılma nihan, mərdümə azar eyləmə.
Məh üzar ilə münəvvər çü olub kişvəri-dil,
Arizə pərdə salub, şəhri-dili tar eyləmə.
Nə fəraq atəşidür qəlbi şərərbar qılub,
Dili-rəncurə dəxi atəş urub, zar eyləmə.
Salika, gərçi dilaram alub arami-dili,
Qoy aparsun dili dilbər, qəmi-dil bar eyləmə.

□□□

Bülbül ki, çəkər nalə gülüstan arasında,
Gülzari-rüxün yad elər əfğan arasında.
Bəs gülşəni-hüsnündə çü gördü güli-suri,
Başinə salub şur nəvaxan arasında.
Şəb-ruz qılar naləvü əfğan sərasər,
Suzi-dil ilə sübhdəm əlhan arasında.
Gül atəşi gülzari-rüxi qıldı çü tabi,
Yandırdı dili atəşi-suzan arasında.
Taqi-xəm əbruyini görgəc zəhi-əflak,
Sərgəştə gəzər qövs ilə mizan arasında.
Zülfün çü qılıb dəhr məşamini müəttər,
Nafə dilini qarə edüb qan arasında.
Görgəc gözüni nərgis olub valehü heyran,
Məxmur olub məst o məstan arasında.
Xali-ləbinin sirrini təhqiq edə mərdüm,
Mühüm görər nöqtəni Qur’an arasında[63].
Ləli-ləbinə qıldı həsəd ləli-Bədəxşan,
Qan ilə dolub qəlbi anun kan arasında.
Qönçəsifət, ol püstədəhən xəndə qılıb məst,
Gül suri edüb qəhqəhə bustan arasında.
Təhqiqi-ləbin hikmətdən qıldı təkəllüm,
Lal eylədi kim, tutini xoşxan arasında.
Əqdi-göhərin rişteyi-göftarə tüzüldi,
Ərzan elədi gövhəri mərcan arasında.
Gülzari-jəmalun gülü gəldikdə şükuftə,
Gülzari-gül əfsürdədü rizvan arasında.
Lövhündə dilim laldur, ey şahidi-rizvan,

Yoxdur bədəlin hur ilə qılman arasında.
Gəlmübdü şəbihün bu jəhanə sənün, ey şux,
Hurü mələki kim görüb insan arasında?
Sərvi-qədinə Salik olub valehü heyran,
Bəs şurə gəlüb cümlə qəzəlxan arasında.

□□□

Çü tabi-mehri-rüxsarın yetişdi kişvəri-canə,
Fəzayi-xatirə saldı şərər, od dutdu kaşanə.
Füruği-məh üzarindən münəvvər oldu bəzmi-dil,
Göz oldu maili-hüsnün, rüxün çün oldu tabanə.
Çü şəmi-arizin tabi şərərbar etdi dil şəhrin,
Nə atəşdür, şərarindən könül yandı çü pərvanə?
Dili-məftuni zəncurə çəkər türrə rəsəntabi,
Kəməndin çün salur tabə, həmi geysuyi-tabanə.
Məşamə ənbərasa tiri-türreyi-müənbərdən,
Səhər məşşatə çün şanə çəkər zülfi-pərişanə.
Füsuni-nərgisi-jadu gözüm bağladı sehr ilə,
Necə gör mərdümi valeh qılıb ol sehri-fəttanə.
Bu türki-məst cövründən usanmaz, rəhmə bir gəlməz,
Çəkər şəstinə zəh, əbru əl eylər tiri-mücganə.
Mügə navəklərin sanjar dili-məftunə kim, hər yan,
Qılar möhkəm kəmanın, bəs dəyər peykani peykanə[64].
Çü mahi-badeyi-ləlin münəvvər qıldı dil bəzmin,
Qərari-xatiri aldı füruği-jami-məstanə.
Səfayi-xatiri-Salik bulunməz kişi-təqvadən,
Tərəhhüm qıl bana, saqi, yetir bir neçə peymanə.

□□□

Çıxıb cudalə genə türki-məsti-məstanə,
Düzüb sipahi-həbəş ərseyi-gülüstanə[65].
Nəcadi-zəngidən arastə qılıb səfü səf,
Çəkübdür Rumə Firəngi-sipəh dəliranə[66].
Süfufi-küfr cüyuşi-qulami-hinduni,
Xədəngü xəncər ilə ərz edüb dilü canə.
Çəkibdü tiği-düsər türki-məsti-xunaşam,
Qitali-seydi-dilə əl açubdu mərdanə.
Nə kindür ki, çəküb şəstə qövsi-əbruni,
Atar mücə oxunu qəlbi-zari-nalanə.
Urar bu sinəmə bir-bir xədəngi-dilduzi,
Zi bəs şüardu xunrizlik bu türkanə.
Atubdu seydi-dilə tabi-türrədən qüllab,
Salubdu seydi-xiyali çəhi-zənəxdanə.
Çəkübdü silsiləyə qəlbi-Saliki-zari,
Verüb qərəzlə əsirin qəra beyk əfğanə.

□□□

Xüramə gəldi səhi sərv çün gülüstanə,
Çəmən nişat qılıb saldi şur bustanə.
Çü gördü qaməti-rəna cunandə sərvi-azad,

Ədəblə başın əgüb qoydu payi-canana.
Qədi-sənubər ilə ərər ehtizazə gəlüb,
Xəmidə qəd olub ol qaməti-xuramanə.
Şəmayili-qədi-mövzuni-peykəri-şümşad,
Təvazö ilə qədin xəm qılıbdu xaqanə.
Səba əli uzanub türrə kakili-səmənə,
Çinar pənjəsini gör Necə qılub şanə.
Nəsimi-sübh çəküb şanə yasəmin telinə,
Qılıbdu buyi pərakəndə sünbülüstanə.
Əbiri-müşk töküb nəfxi-sübh gülzarə,
Hədiyyə qıldı səba məhfili-gülüstanə.
Xumar qıldı gözün xabi-nazdən əbhər,
Nəzarəgahə çıxub açdı çeşmi-məstanə.
Ərusi-namiyə saldı niqabını yüzdən,
Xurami-naz ilə gəldi o, məhfili-canə.
Şəqayiq ud töküb məjmərə, qılıb pürtab,
Buxur üçün gətürüb bəzmi-şahi-şahanə.
Səpübdü əşki-göhər rahə didədən Salik,
Qılıb nisar düri-şəhvari-cananə.

□□□

Xuramə gəldi çü sərvi-riyazi-sün’i-İlah,
Göz oldu maili-sərvi-səhiyü peykəri-mah.
Fəda o qaməti-rənayə, sayəsi ola qəmz,
Kirişməsi həm ola bu sözümdə ədli-güvah.
Nə nəxli-dilkəşdür, bərgü baridir həme naz,
Dili-müfəttəni-nazin gərək çəkə, həme gah.
Pəsənddür hərəkati, ze sər bepa həsənat,
Səzayi-nitq degül zikr edə sənayi-səvah.
Gəlür çü cünbüşə, arami-dil alur yeksər,
Qılər çü cilvə pəripeykəri-füruzan mah.
Qərari-dil alur, iyma qılər çü əbrusi,
Dönüb qıya çü baqər, qəlbi eylər atəşgah.
Şərər tökər könülə, od dutar, yanar dili-zar,
Çəkəndə şəmi-üzari çü şöleyi-cankah.
Xitabi-“Inni ənəllah” yetər bu guşi-dilə,
Məgər ki, vadiyi-Əyməndü nəxli-Turi-İlah[67].
Çəkibdü dəsti-qəza ya ki, darə Həllaci,
Gəlür sədayi-“ənəlhəqq” qulağimə gəhü gah[68].
Riyazi-dəhrdə bu novnihal rəftari,
Qılıb təəyyüşi-Salik həramü hal təbah.

□□□

Sübhdəm guşi-dilə yetdi bu avaz genə,
Sirri-dil faş eləmə ta gələ həmraz genə.
Leyk eyşi-dilə amadə qıl əsbabi-tərəb,
Vəqtdür bəzmə gələ mütrübi-dəmsaz genə.
Bəhcəti-xatir içün əncüməni-surə gətür,
Bərbətü ud ilə mizmarü dəfü saz genə.

Saqiya, badeyi-peymanəni ləbriz qılub,
Bir neçə cam gətür nəşeyi-pərvaz genə.
Gərmsər eylə dili, razi-nihandən xəbər al,
Söləsün əhli-dilə məhvəşdən raz genə.
Mütrüba, rasti-nəva bəzmi yetür guşi-dilə,
Nəğəmatı dolanub, bir də de Şəhnaz genə.
Gəz Əraq ilə Sifahan, Nişabur, Hicaz,
Suyi-Azərbaycanə elə pərvaz genə[69].
Xatirə zövq yetür artura ta şuri-səri,
Bu qədər işvə satub eyləmə gəl naz genə.
Ta çəkə nəzmə o gülrux sənəmin midhətini,
Pərdədən tişrə çıxa şahidi-tənnaz genə.
Rəhbəri-Salik olub məhfili-rində yetürə,
Qıla ta bir neçə dəm rindlə həmraz genə.

□□□

Fəna sərmənzilin,ey dil, məqam et qəlbi-Məcnunə,
Nigarinxanə dövrandə yaraşmaz qəlbi-məscunə.
Müqəyyəd olma aləmdə sərayi-bağü bustanə,
Büsati-xərgəhi nəql et fəzayi-dəşti-hamunə.
Neşün, məmurə dünya vəfa qılmaz sənə hərgiz,
Görülmüb dəhrdə təkyə qıla kimsə bu məskunə.
Verür guşi-dilə hər dəm xəbər bəs aşina mərgi,
Rəva qılma dəxi eyşi-cahandə qəlbi-məftunə.
Əcəl qarşu durub dutsun giribanın, nə qəflətdür,
Dəxi gəl etibar etmə mətai-nakəsi-dunə.
Yaranmış şərbəti-mərgə tiküb göz bəzmi-dövrandə
Yetirsün badeyi-nabın hamı bir ləli-meygunə.
Səbili-mərgə talibdür cəhandə cümlə hal əhli,
Rüxi-dildardən tuşə götürsün hali-məhzunə.
Rəhi-cananı dut, Salik, anin eşqində can sərf et,
Sənayi-arizi-yari gətür bir təbi-mövzunə.

□□□

Gətür məh badəsin, saqi, füruğin sal dilü canə,
Neşün, ol məh rüxün hicri qılıbdur qəlbi tabanə.
O sağəri-ləlgun ilə nolur tabi-dili alsan,
O gülrüxsar cövründən dönübdür xatirim qanə.
Gətür səhbayi-gülrəngi ki, dildə qalmıyub halət,
Ləbi-ləlün zülalindən ləbə dut saf peymanə.
O məhpeykər surahilə müzəyyən qıl könül bəzmin,
Nə məhfildür bula zivər beduni-ruyi-cananə.
O atəşrəng meydən bir əyaği-laləni doldur,
Şərərbiz oldu xatir bəs, şərarə dutdu kaşanə.
Meyi-nabi-səbuh ilə dili sərgərm qıl, saqi,
Könül zövqün füzun eylə, gətür bir cami-məstanə.
Səbuyi-zərkeşi lütf et, bəsi ətşan olub xatir,
Gəl ol xəmri-ələstidən gətür bir bəzmi-rindanə.
Güzər qıl bir xərabatə, rəhi-meyxanə dut, Salik,

Ola sərmənzilin axir fəzayi-kuyi-meyxanə.

□□□

Könül müsəmməm olubdur vüsali-dildarə,
İradeyi-səfər etmək gərək suyi-yarə.
O şəmi-arizə pərvanədür dili-məftun,
Gərək yetürmək ani dövri-şəmi-rüxsarə.
Füruği-məhfili-can olduğunda şəmi-rüxün,
Səvayi yanmaq pərvanəyə nədür çarə?
Dirəxti-vadiyi-Əymən salubdur canə şərər
Ki, fərzdür dilü cani yetürmək ol narə[70].
Bu kuyi-eşqdə Musa kimi mücərrəd olub,
Şərarə cəm eyləmək məxzəni-dılı-zarə[71].
Rəhi-nigardə kahil muradinə yetməz,
Neşün, şəbihdü tənbəl o nəqşi-divarə.
Fəribxurdeyi-möhtaleyi-əcuz olma,
Təlaq ver, dəxi bel bağlama bu məkkarə.
Mətai-nəqdi-dili tuşə qıl rəhi-eşqə,
Teyyi-mənazil edüb, Saliki yetür yarə.

□□□

Gələcək əncümənə türfə nigarım bu gecə,
Zeybi-məhfil olacaq laləüzarım bu gecə.
Saqiya, badeyi-meyguni yetür xəstə ləbə,
Tabi-dildən aluşub xatiri-zarım bu gecə.
Sağəri-ləli meyi-nab ilə sərşar qılun,
Bəs ki, səbrim tükənüb, yoqdu qərarım bu gecə.
Qədəhi-nərgisdən zövq yetür xəstə dilə,
Badeyi-məhvəşə sərf et nə ki varım bu gecə.
Sənəmi-mahüzarın götürün pərdəsini,
Zivəri-bəzmi-dil olsun rüxi-yarım bu gecə.
Hicrəti-mahi-rüxi-məhvəş alub səbri-dili,
Çıqacaq ərşə genə naləvü zarım bu gecə.
Atəşi rəng meyi tök qədəhi-laləyə, ver,
Keçməsün qüssəvü möhnətlə mədarım bu gecə.
Salika, dərdi-zəbanxamə rüxi-məhvəş olub,
Bir sənayi-rüxi-dilbərdü şüarım bu gecə.

□□□

Girehi-türrə nə gör dami-fitəndür könülə,
Bəs ki, məftun eliyüb xatiri ol əgri telə.
Qərəquş çəngi kimi qəlbə nə qəynaqin atub,
Qanlu tırnaq irişüb sinədəki mürği-dilə.
Seydi-şəhbaz eliyüb kəbki-xiyali bu gecə
Ki, müqəyyəd eliyüb tazə genə kəsmə telə.
Sərməşüb marsifət bir-birə geysuyi-siyəh,
Kin ilə tabə gəlüb, qəsd eyliyüb canü dilə.
Dağıdubdur məh arizə kim, türrələrün
Ki, nəçün, bədr gərək zivər ola halə ilə.

Cövri-mişkini-təsəlsüldə qılub ənbəri zəbt,
Olmiyə, nafeyi-seydi-Xütən ərzan satulə.
Bağlıyub Salik əyağini neşün silsiləyə
Ki, gərək aşiq olan həlqeyi-tarə çəkülə.

□□□

Nə xüraman gəlür qənşərə dildar genə,
Dildən aramı alan arizi-gülnar genə.
Pürkirişmə yeriyür, işvə satub, can aləcəq,
Gərm bazar qılub sübhdəm əttar genə.
Bir qıya baxmaqlən taqətimi yeksər alub,
Dili məhzun eliyüb, xatiri əfgar genə.
Mərdümi-çeşmi nə cadudu, müfəttən eyliyub,
Bu nə əfsundu verür nərgisi-xəmmar genə.
Ənbərin zülf töküb gərdənə ol türrəsəmən,
Qəsdi-canü dil edüb əfiyi-şahmar genə.
Bağlıyub silsileyi-tarə bu məftun könülü,
Dəstgir eyliyüb ol türreyi-tərrar genə.
Təlxkam etmişdi xatiri çün təngi-şəkər,
Şəhdbizi-ləb olub ləli-şəkərbar genə.
Tar qılmışdı sərayi-könülü bəs şəbi-hicr,
Gəlüb əfruğ verə ol məhi-rüxsar genə.
Rahi-eşqində dili-Saliki zar etmişdi,
Afiyətbəxşi-dili-zar olub yar genə.

□□□

Yüzüvün nə nisbəti var məhü mehri-asimanə
Ki, salub şüaini gün fələkə, bu xakdanə.
O ki, mehri-tələtündür həme ca dutub zəmini,
Nə səmavü ərşi-kürsi, yetişübdü laməkanə.
Gətümüb riyazi-dövran o səhi qədin misalin,
Nə rəva ki, oxşadam mən ani Tubiyi-cinanə.
Necə zülfi-ənbərindür, olub ətrbizi-aləm,
Dağıdıbdu buyi-mişki həmə məhfili-cəhanə.
Şəbi-qədr tək girami çü olub səvadi-qaşun,
Yarəşür ki, qabi-qövseyn diyələ zehi-kamanə.
İki şux məsti-çeşmin nə salubdu dəhrə fitnə,
Hamı göz müfəttən olmuş bu füsuni-cavidanə.
Bu nə sağər idi səhba ki, dolub meyi-məhəbbət
Ki, dutubdu şux saqi necə gör meyi-muğanə.
İki ləbşəkər dəmindən tökülər çü abi-kövsər,
O zülalə təşnələbdür hamı ləli-xəstəganə.
Genə səfheyi-rüxündə yazılub xəti-bənəfşə,
Görən ol xətti-riqqani nə baqər xəti-Quranə.
Yenə səbzəzari-ruyun gətürüb çü türrə sünbül,
Əcəb olmaz ər şəbahət ola bağü bustanə.
Baxan ol güli-cəmalə, necə göz götürsün andən,
Ola kur çeşmi-şövqi, nəzər etsə gülsitanə.
Genə xameyi-nigarin dü zəban olubdu, Salik,

Bu nigari-nazəninün sifətin çəkər bəyanə.

□□□

Yenə Məcnun kimi könlüm qoyubdu yüz biyabanə,
Nolur çəksən bu məcnuni kəməndi-zülfi-əfşanə.
Çəkübdür türki-məstün gör bəna kim, ğəmzə peykanın,
Tökər xunabə bağrımdən, nəzər etməz qızıl qanə.
Müjə navəklərin sancar bu köksüm üzrə kim, hər yan,
Kəmanın bir yerə qoymaz o türki-məsti-məstanə.
Çigər qanın tökər hər dəm xədəngün sinəyə dəgcək,
Dil eylər nalə, ta peykan dəgər köksümdə peykanə.
Dilü can şad olur, xürrəm sədayi-tiri-peykandən,
Olur bari-fərağət kim, bəla zindandən canə.
Boyanmış qanə gülzar içrə güllər caməsi yeksər,
Məgər ol sərv xəncərlə bu gün çıqmış gülüstanə?
Cahan içrə məlamət atəşinə yanmasan, Salik,
Tələttüf et, rəva görmə ki, aləm oduna yanə.

□□□

Yüzünü gün görəli zövün edüb cümlə təbah,
Mah sərgəştə olub çöhrənə qılduqda nigah.
Necə tərif qılum qamətün, ey sərvi-səhi,
Kim görüb sərv başında belə tatari külah?
Həme azadədu kim, sahəti-bostandə sərv,
Nə səhidür ki, salub mahi-rüxə türrə siyah?
Cövri-mişkini-təsəlsüldə qılub xatiri həbs,
Həlqeyi-tarə çəkibdür könülü ol rüxi-mah.
Ənbərin türrəni gör kim, nə qılub dami-fitən,
Qəlbi-məftuni salub sicnə genə xali-siyah.
Taqi-əbruyinə etdikdə nəzər mərdümi-çeşm,
Tərk edüb yeksərə tovfi-hərəmi-Beytullah[72].
Aldı arami-dili-Saliki ol zöhrəcəbin,
Bəs ki, əfruğ verib səhni-dilə tələti-mah.

□□□

Ol güli-rənanı kim gördü, cigər qan etmədi?
Gül şükuft etdikdə halü dil pərişan etmədi?
Bir təbəssümlə qılub pürzövqi-xatir qönçə gül,
Nimxənd ilə könül şəhrini viran etmədi?
Hər görən gülbərgi-ruyun eyşi-dil əfzun edüb,
Hicrlə ənduhi-xatir, didə giryan etmədi?
Hüsni-gülzarın təmaşası alub arami-dil,
Ah, cövri-gülrüxün kim, bağrımı qan etmədi?
Mərdümi-didə o gül rüxsarinə heyrandürür,
O nə mərdüm, arizinə didə heyran etmədi?
Seyri-gülgəşti-cəmalindən olur hasil nişat,
O nə şeydadur şükufti-güldə əfğan etmədi?
Bəhcəti-xatir füzun eylər o gülbərgi-lətif,
Leyk məhcub olmaqı nə dildür əhzan etmədi?
Nərgisi-xəmarı gör, hali-dili yeksər alub,

Bir nigah ilə nə xatirdür ki, nalan etmədi?
Salika, gülşən rəhində qıl fəda canü dili
Kim, nə dil, gül rahinə fidyə dilü can etmədi?

□□□

Ey vücudun əsəri, xilqəti-əşya səbəbi,
Şərəfi-zat ilə sən cümlə rüsul müntəxəbi.
Afərinişdə qanı gövhəri-zatun kibi pak?
Qədrilə fəxri-cəmii-bəşər olsun həsəbi?
Görmiyüb çeşmi-cahan sən kimi bir pak sifat,
Ənbiya içrə qanı sən kimi pakizə nəbi?
Məhrəmi-razi-hərimi-hərəmi-"Əv ədna",
Hamili-çar kütub, ya əbərani, ərəbi[73].
Şərəfi-rütbət ilə Sidrə məqaminə yetən,
Mədəni-fəzlü hünər, rahi-həqiqət tələbi[74].
Fələki-şəmsi-hüdavü üfüqi-sübhi-əzəl,
Cümleyi-əzminədə rüşdü hidayət səbəbi.
Key şəha, Salikdən feyzi-nəzər kəsməgilən,
Dərgəhində gər ola səhllə tərki-ədəbi.

□□□

İştiyaqi-güli-ariz alub arami-dili,
Bəs ki, gülbərgi-rüxün aldı qərari-könüli.
Türrə sünbül olalı zeybi-gülüstani-üzar,
Girehi-zülfi-təsəlsüldü salan damə dili.
Çün şükuft etdi ləbi-qönçə, dilə yetdi nişat,
Bəs gözə cilvəfüruş oldu anun bərgi-güli.
Bir nigah ilə qılub xirə gözü nərgisi-məst,
Bəs ki, bir xəndə ilə aldı hamı səbri-dili.
Sağəri-lalə ilə zeybi verüb bəzmi-rüxə,
Genə müştaq eliyüb sağərə meyxarə dili.
Susənü sünbülü gül, laləvü nəsrinü səmən,
Zivəri-gülşən olub aldı qərari-könüli.
Genə məşşatə çəküb şanə teli-yasəmənə,
Müşkbiz etdi məşami səmənün ətri-güli.
Salika, sahəti-gülzarə çıxub zövqi-dil et,
Qədəhi-nərgisdən ta alasan kami-dili.

□□□

Ey xoşa ol dəm ki, vəslin dəhr ara məqdur idi,
Şəmi-arizdən ümidim didəsi pürnur idi.
Xatiri-məhzunim eyşi sağəri-səhbayi-ləb,
Lə'li-şəkkər bəhcətəfzayi-dili-məhcur idi.
Afitabi-tələtündən bəzmi-xatir rövşəna,
Sahəti-könlüm füruği-mahdən pürnur idi.
Ənbərin geysu məşami qılmış idi ətrbiz,
Türreyi-mişkindən sərayi-xatirim məmur idi.
Taqi-əbruyin dili-məftunə mehrabi-dua,
Səcdəgah içün bəna xali-ləbin mənzur idi.

Şəkkəri-ləlinlə ümmidim ləbi şirin idi,
Qönçeyi-xəndan ilə pəjmürdə dil məsrur idi.
Hicrdən yetməzdi bir zərrə küdurət könlümə,
Gərçi hicr ayini-rəsmi dəhr ara məşhur idi.
Saliki dərdi-fəraqə mübtəla qılmış qədər,
Bəs ki, dərdi-hicrdən qafil dili-məğrur idi.

□□□

Ey pəripeykər, rüxün şəmi qılub heyran bəni,
Eyliyüb pərvanə dək dövrəndə sərgərdan bəni.
Pərtovi-mahin niqabi-türrədə qıldun nihan,
Zülməti-xatirlə qoydun müztərib, nalan bəni.
Rövşən etdi mehri-ruyun bəs fəzayi-xatiri,
Zərrə tək qoydu pərişan arizi-taban bəni.
Nazi-qəmzə nərgisün ecaz ilə əfsun edüb,
Kişvəri-cismi müsəxxər eylədi hər yan bəni.
Baği-hüsnündə xüraman oldı çün sərvi-qədin,
Ol çəmi-rəftar qıldı valehü heyran bəni.
Sünbüli-gülzari-hüsnündən bulub bəhcət könül,
Qönçeyi-ləlün şükufti şad edüb, xəndan bəni.
Gül üzarun Saliki bülbültək eylüb novhəxan,
Hicrəti-güldə qoyubdur xatiri-nalan bəni.

□□□

O gül üzar qəmi gör salub nə halə məni,
Hezar möhnəti-dərdə qılub həvalə məni.
Çəkübdü qəlbimə daği-siyəh fəraqi-nigar,
Nolur ki, rəhm qıla, bir də yadə salə məni.
Görüm, ilahi, rəqibin nişati bərhəm ola,
Neşün ki, həsrət edübdür o gül cəmalə məni.
Zibəs ki, qiblə olub taqi-əbruyi-canan,
Qılubdu qaməti xəm, döndəribdü nalə məni.
O xali-dürri-ləbin həsrəti mühacir edüb,
Həbəşnəjadi bilüb, bənzədüb Bilalə məni[75].
Həmişə çahi-zənəx həsrətin çəkər çeşmim,
Neşün, müfəttən edüb sünbüli-gülalə məni.
O taqi-mahcəbinə fəda ola dilü can,
Rizayi-həq görə gər, etikafə salə məni.
O nəğzpeykəri-sərvi-səhi, şəmayil qəd,
Qədim kəman qılub, döndərib hilalə məni.
Bu hicri-tələti-məhpeykəri-pərivəşdür
Ki, dağdari-dil eylüb çü bərgi-lalə məni.
Bu eşq kari alub ixtiyarımı yeksər,
Bəsani-Qeys qılub qəmlərə həvalə məni.
Hanı əcəl ala canım, xilasi-möhnət edə,
Əcəlsiz öldürür axir bu ahü nalə məni.
Bu rahi-eşqə fəda eyliyübdü can Salik,
Əgər qəbul eliyə sahibi-risalə məni.

□□□

Ayaqdan saldı, dildarım, yüzün cövri məni zari,
Cəfa qılma dili-zarə, yüzün örtmə, səni tari.
Niqabi-türrəni bir sal o məh ruyi-münəvvərdən,
Könül qəsrini tar etmə, di qoy məhtab ola bari.
Füruği-məhüzar ilə fəzayi-qəlbi qıl rövşən,
Səfayi-xatir artursun məhi-rüxsari-gülnari.
Cəmalın seyti kim, dutmuş hamı afaq ətrafın,
Nə tələtdür olub heyran görən ol mah rüxsari?
Kəməndi-türrə pürtabin salub tabə, könül nolsə,
Nə məftun dil, nə kim, bidil olub yeksər giriftari.
Füruği-şəmi-rüxsarun münəvvər eyliyüb xatir,
Gözü heyran edüb, valeh o şəmin bəs ki, ənvari.
Həyati-dil qılır hasil zülali-sağəri-ləlin,
Nolur bir cür'ə gər qılsan bu xəstələb pərəstari.
Təmənnayi-dili-Salikdür ol ləli-meygunin,
Yetür bir xəstə kamə, şəfa bulsun bu bimari.

□□□

Ey camalın mehri-ənvər, arizin məh parəsi,
Naziri-ruyindürür eşqi-rəhin avarəsi.
Tələtün xurşidi-rəxşandur, yüzün bədri-münir,
Maili-hüsnündürür bu ayü gün nəzzarəsi.
Ol günəş rüxsarini göz gördü, oldu maili,
Əşki-didə həsrətində qoymadı göz qarəsi.
Gülşəni-hüsnündə gül suri şükuft etdi əyan,
Lazım olmuş su verə gülzarə göz fəvvarəsi.
Nərgisi-məsti-xumarın çeşmi çün heyran edüb,
Canü dildür fidyəsi, göz nuridür kəffarəsi.
Ey kəmanəbru, xədəngin şərhə qılmış sinəmi,
Olmuri mərhəmpəzir olsun dəxi dil yarəsi.
Çün sinani-xunçəkanın kişvəri-dil qəsd edüb,
Yıxdı bu möhkəm həsari, qalmadi bir barəsi.
Rəhmsiz səyyaf qətlimqə çəküb tiği-düsər,
Tökdü baqrım qanını axir anın qəddarəsi.
Salika, can tərkin et, bu dilbərün dut rahini,
Sərfi-nəqdi-candan ğeyri bulunmaz çarəsi.

□□□

Pərdədən yüz göstərüb qıldın çü məcnun könlümü,
Möhnəti-hicri-rüxün zar etdi məhzun könlümü.
Afitabi-tələtün görkəc göz oldu maili,
Mah ruyun pərtovi etdi digərgün könlümü.
Şövqi-didarın qərari-xatiri yeksər alub,
Şuri-vəslin zövqü bəs ki, qıldı məşhun könlümü.
Türreyi-mişkin kəməndi dəstgiri-dil edüb,
Bağladı zənciri-tarə, qıldı məscun könlümü.
Şəhdi-kam etdi rəqibi şəhdi-ləlin şəkkəri,
Təlxi-kam etdi ləbin səhbası məğbun könlümü.

Çün kənar oldu başimdən sayeyi-sərvi-qədin,
Tabi-dildən bəs şərarə dutdu pürxun könlümü.
Nərgisin məxmur olub, dutub sağər biganəyə,
Möhnəti-cövr pərişan qıldı məftun könlümü.
Kuyi-eşqində gəzər sərgəştə, heyran xatirim,
Cəzbeyi-şövqün salub səhrayə Məcnun könlümü.
Salika, şövqi-rüxi-məhvəş alub arami-can,
Dəşti-heyrətdə qoyub avarə məhzun könlümü.

□□□

Cəhd qıldım, əzmi-dildə bəxt bidar olmadı,
Vajgun tale məramə bir mədədkar olmadı.
Sirri-eşqi saqlədüm məxfi könüldə mahü sal,
Hiç kəs bu qüssəvü qəmdə bəna yar olmadı.
Xatiri zar eylədi bu möhnəti-sevdayi-eşq,
Dərd dərmaninə kimsə bir tələbkar olmadı.
Nəqdi-can sərfi-rəhi-rüxsari-canan eylədüm,
Dilrüba məhvəşdə bir insaf olub yar olmadı.
Tiği-əbru kin ilə çəkdi tökə xunabi-dil,
Ərzə qıldum başü cani kim, bəna ar olmadı.
Tiri-dilduz ilə əzmi-xatir etdi türki-məst,
Sinəmi qıldum hədəf kim, xatirə bar olmadı.
Müşkbu cövri-təsəlsül qeydi-çənbər oldu bəs,
Bağladı zənciri-tarə, kimsə qəmxar olmadı.
Vəhm qılma, Salika, cövrü cəfayi-yardən,
Can mətain sərfi-rah et, səhl didar olmadı.

□□□

Xürami-sərvi-səhi dildən aldı arami,
Çü dutdu tərzi-çəmi-qəmzə ol səhi nami.
Çü oldu maili-gülşən, dutub rəhi-işvə,
Sipahi-ömrü apardı qərari-dil hami.
Məhi-üzari qılub türrə ənbərin məstur,
Düçari-möhnət edüb qəlbi hicr əyyami.
Çü bürci-Əqrəbi mənzil qılub bu gün Qəmərə,
Rəvadu gər duta dil türreyi-şikən dami[76].
Çıqə gər Əqrəbdən mahi-ənvəri-ariz,
Qərari-dil alu yeksər rüxi-güləndami[77].
Mücavirət qıla gər qövslə o mahi-münir,
Dutar fəzayi-cəhani füruği-məh hami.
Nə olsa kişvəri, dil yeksərə qılar təsxir,
Yüzündən etsə əgər pərdeyi-siyahfami.
Fəda ola o məh arizə dili-Salik,
Füruği valeh edüb dideyi-dili hami.

□□□

Sərvi-qədindürür çəməni-dəhrin ayəti,
Gülzari-tələtün güli-gülşən şəbahəti.
Ərzü səma məzrəinin nəzrəti olub,

Səbzi-xətin mübahisə ilə hekayəti.
Məhv etdi nuri-basirə gözdən zamanü dəhr,
Görgəc gözündə nökteyi-həqbin rəvayəti.
Sübhi-əzəl şükuft elədi qönçeyi-ləbin
Kim, sirri-hikmətin bu gül olmuş nəhayəti.
Ruhülqüdüs pəyam elədi cümlə mürsələ,
Məzmuni-möcüzi-ləbi-ləlün rəvayəti.
Görmübdü bəzmi-ruyi-zəmin, səfheyi-fələk,
Nitqin kibi kəlami-fəsahət bəlağəti.
Gəldün cəhanə, əhli-həsəd qıldı etiraz,
İqrari-əcz etdi, çü gördü bəraəti.
Eşqün rəhində Salikə, cana, tərəhhüm et,
Göstər xəti-rüxündə olan sirri-qayəti.

□□□

Suri gülün yüzün kimi yoqdur lətafəti,
Vəh, əgri tellərün səmən olmaz şəbahəti.
Sərvi-qədin şəbihi nə mümkündü bağ ara,
Gər naz ilə xüram edəsən sərvi-qaməti.
Vər seyr üçün güzər edəsən bağü gülşənə,
Xiclət yetər sənubərə görgəc o qaməti.
Gör türki-məst ğəmzə sipahin nə cəm edüb,
Ləşkər çəkübdü çar tərəf, yoq nəhayəti.
Qoymaz yerə kəmanini bir türki-məsti-şux,
Bu qəlbi-zar ilə necə bar gör ədavəti.
Bir-bir urar bu sinəmə peykan, həm sinan,
Bilməm kimə bu cövrdən eylüm şikayəti.
Tiği-müjəndü şərhə qılan zar könlümü,
Xunrizlikdü bəs ki, bu müjganın adəti.
Tiği-siyahfam ilə əzmi-dil eyliyüb,
Bax bir səlabəti-hünərə, gör cəladəti.
Vey cövrkeş, tiğü xədəngə nə ehtiyac,
Bəsdür bənə bu ərsədə düşmən şəmatəti.
Salik verübdü can sənə görgəc yüzün gülün,
Kəsmə dəxi sən əhli-vəfadən inayəti.

□□□

Dili-məftunə zi bəs yetdi üzarun sitəmi,
Qoymadı tab qala dideyi-xunbar nəmi.
Muyi-miğin çü dutub ol məhi-rüxsar yüzün,
Arturub xatiri-ğəmdunə genə həmmü ğəmi.
Çeşmi-müştaqdən olduqda nihan mehri-rüxün,
Şərərəngiz elədi xatiri, cövrü ələmi
Kim, səri-kuyinə düşdükdə güzər ruzi-əzəl,
Bəhcəti-dil gətürüb göz ki, görüb ol sənəmi.
Leyk məhcub qılub mahi-rüxi, aldı şəkib,
Neyləsün Qeysi-dilim, köçdü çü Leyli həşəmi.
Mübtəla dərdi-fəraqə olu məftundil olan,
Səhl gər olmiyə bu vərtədə əğyar ğəmi.

Afitabi-rüxüni qılma nihan bir də, sənəm,
Salikə bəsdü yetən mahi-üzarun sitəmi.

□□□

Dəxi cövr etmə, cananım, Tarı sevməz sitəmkarı,
Vəfa rəsmin unutma gəl, salub getmə məni-zarı.
Əzəl saldun niqab uzdən, məh rüxsarı göstərdün,
Qərari-xatiri aldun, di qoy taqət qala barı.
Dilaramım, dil aramın dilimdən yeksərə aldun,
Sükunü səbrimi bəs ki, apardı çöhrə gülnarı.
Könül şəhrinə əl tapdun, şəbixun urdun iymanə,
Əlimdən nəngü namusi dəxi alma, səni Tarı.
Qılanda ğarəti-təqva, əməl nəqdini zəbt etdün,
Çü yəğma eylədün dinim, pozuldu cümlə pərgarı.
Xürami-qaməti-rəna apardı haləti-xatir,
Neşün arami-dil qoymub o sərvün nazi-rəftarı?
Məni-bicürmdən, aya, nə gördün, əhdi sındırdun?
Nəzərdən yeksərə saldun məni-zarü diləfgarı.
Çü sayə başdən çəkdün, apardun aqibət təndən,
Sihhət ümmidini görməz dəxi bu çeşmi-xunbarı.
Əyaqdən Saliki-zarı salub gülçöhrə hicrani,
Di qoy dəşti-həlakətdə sürünsün kuyinə sarı.

□□□

Şəmi-rüxsarun çü gördüm, ixtiyarım qalmadı,
Od dutub pərvanə könlüm, bir qərarım qalmadı.
Mahi-hüsnün əbri-türrə didədən qıldı nihan,
Tabi-dildən gör ki, çeşmi-əşkbarım qalmadı.
Möhnəti-cövri-rüxün dutdu fəzayi-xatiri,
Qəlbi-məhzunə dəxi qəmgüsarım qalmadı.
Əşki-çeşmim seylinə qərq oldular əvani-dil,
Bu sirişki kəsməgə gör bircə yarım qalmadı.
Bəxt oldu vajgun cövri-cəfayi-dəhr ilə
Kim, nişati-xatirə gör ruzigarım qalmadı.
Taqətim taq etdi hicrün, aldı arami-dili,
Bu cahan içrə dəxi zərrə qərarım qalmadı.
Eşq rahində bəna ancaq fəna məqsuddi,
Şükr kim, məqsudə yetdüm, intizarım qalmadı.
Yar içün, Salik, bəna əğyar oldu hər görən,
Suzi-dildən ğeyr bir dilsuz yarım qalmadı.

□□□

Şəmi-ruyun çün könül bəzmin çirağan eylədi,
Xatiri pərvanə tək ol şəm suzan eylədi.
Afitabi-arizin şəhri-dili təsxir edüb,
Qəlbi-məftunimi gör kim, bəndəfərman eylədi.
Surətün əksi çü lovhi-dildə oldu cilvəgər,
Cismü can məmurəsin yeksər füruzan eylədi.
Tələtün nəqşini görgəc kilki-Mani künd olub,

Şərmi-dildən gör midadun yeksərə qan eylədi[78].
Bəs ki, timsalın görüb nəqqaşi-Çin azərm edüb,
Oldürür, kim ki, nigarın xanəviran eylədi.
Cilvə qıldı bustandə çünki sərvi-qamətin,
Mərdümi-çeşmi müfəttən, qəd xüraman eylədi.
Sağəri-ləli-ləbi-meygunun oldu cür'əbəxş,
Rəngi-badə dideyi-müştaqi heyran eylədi.
Salika, cövri-rüxi-məhvəş sirişki-didədən
Seyli-xun qıldı rəvan, axir ki, tufan eylədi.

□□□

Şəbi-hicrandə dutub əşki-gözüm dünyanı,
Zərrə-zərrə yıqılub, ovd qılub tufanı.
Ahi-sərdi-səhərim tabi-dilimdən ucalub,
Atəşi-ahimə baq, gör bu dili-suzanı.
Kəsmə ümmid, könül, çöhrəgüli-zibadən,
Olu kim, vəqti-səhər yad qılar şeydanı.
Rəhm edün canimə, incitməyün, ey dərdü bəla,
Lütf edüb dust dutun bir-iki gün mehmanı.
Çoq hücum etmiyün, ey qüssəvü ğəm, xatirə siz,
Görmüsüz qəlbdəki bu şərəri-tabanı?
Görməgə yar yüzün əzm eliyüb didəvü dil,
Verə əfruğ gözə bəlkə məhi-tabanı.
Salika, fidyədür ol mah rüxə canü dilim,
Çəkərəm rəhgüzərə kəsmək üçün qurbanı.

□□□

Könül çü oldu o ziba yüzün xiridarı,
Dəxi cəfa eləmə xatirə, səni Tarı.
Alubdu cəzbeyi-şövqi-rüxün qərari-dili,
Çəkibdü silsiliyə payi-xatiri-zarı.
O sərvi-peykəri görgəc olub gözüm heyran,
Çü kakili-səmənin dil olub giriftarı.
Dutubdu kini-rəhin türki-məsti-xunaşam,
Çəkibdü qətlimə tiğü sinani-xunxarı.
Nə səxt çillə edüb gör kəmani-əbruni,
Atar müjə oxunu qövsiyi-şərərbarı.
Dili nişanə qoyub, navəkin qılub pürtab,
Gəlür bu sinəmə bir-bir xədəngi-xunbarı.
Zülali-ləli-şəkər xəstə dil qərarın alub,
Şəfadən ötrü dilər ləli-ləb şəkkərbarı.
Təkəllümə çü gəlür, şəhdi-ləb tökər, şəkkər,
Qərari-xatir alur nitqi-şəhdi-göftarı.
Həmişə Saliki-zarı çəkər rəhi-eşqə,
Salur bəlalərə başın xürami-rəftarı.

□□□

Sənəma, o gül üzarun məhi-pürziya degülmi?
Çəməni-bənəfşəzarun xəti-dilgüşa degülmi?

İki əbruyi-siyahın zehi-qövsi-asimani,
Biri eydi-şəb hilalı, biri xudnüma degülmi?
İki çeşmi-pürxumarun satar işvəvü kirişmə,
Biri nərgisi-pürəfsun, biri pürcəfa degülmi?
İki türrə ənbərinün olub ətrbizi-aləm,
Biri nafə, bəs müənbər, biri müşksa degülmi?
İki zülfi-müşknabun ki, qurubdu dami-fitnə,
Birisi kəməndi-xatir, biri cangəza degülmi?
İki geysuvani-mişkin girehi-bəlayi-candur,
Biri şahi-mahi-pürkin, biri əjdəha degülmi?
İki məhüzari-çöhrən ki, qılub cahanı rövşən,
Biri afitabi-aləm, birisi səba degülmi?
İki ləli-şəhdbizdən dağıdar nəbatü şəkkər,
Birisi təbibi-candur, birisi şəfa degülmi?
İki xali-ənbərinün ki, nəjad alub həbəşdən,
Biri nöqteyi-məlahət, biri dilrüba degülmi?
İki simü saqü said gələ entinavü əzmə,
Birisi həmayili-can, biri pürsəxa degülmi?
İki sibi-novnəhalın həme sərbepa lətafət,
Biri zadi-rahi-Salik, biri müddəa degülmi?

□□□

Üzarun tabı çün dutdu təmami-rüb'i-məskuni,
Müsəxxər qıldı məh ruyin fəzayi-qəlbi-məftuni.
O şəmi-arizin tabı yetəndə məhfili-canə,
Çü pərvanə dili-zarə qəza etdi cigər xuni.
Cəmalun cilvə etdikdə göz oldu maili-hüsnün,
Şəkibi-dil zibəs aldı xürami-qəddi-mövzuni.
Gülüstani-cəmalindən bulundu bəhcəti-canım,
Sürur etdi o gülbərgi-lətifin qəlbi-məhzuni.
Füruği-ləli-peymanə başə şur arturur hər dəm,
Zibəs zövqi-dili əfzun qılubdur ləli-meyguni.
Gətür, saqi, bəna badə, şərər canə töküb hicri,
Gəlüb tabə dili-suzan, yetür ol cami-gülguni.
Riyanı tərk edüb Salik, xərabatı qılub məskən,
Meyü mütrüb həvasilə dutubdur rəsmi-qanuni.

□□□

Genə ol sərvi-rəvan gör nə xüraman gəlüri,
Can alub, işvə satan, arizi-taban gəlüri.
Ğəmzəvü naz ilə arami-dili almaq içün,
Yerə minnət qoyubən ol şəhi-xuban gəlüri.
Gör nə cadudu, füsuni dili məftun qılub,
Pürkirişmə necə gör nərgisi-fəttan gəlüri.
Görmiyüb dəhr gözü qaniçici bir belə türk,
Qoymuri hiç kəmanın yerə, məstan gəlüri[79].
Bəs ki, dilduzi-xədəngin qoyubən şəsti-zehə,
Tiri-müjgan cigərə gör necə bir an gəlüri.
Bu nə insafdu, müztər könülə rəhm eləmüb,

Sipəri-siniyə bir-bir genə peykan gəlüri.
Tiği-əbruni çəküb bəs ki, cigər qanı tökə,
Cansitan nizə əlində, şəhi-türkan gəlüri.
Salika, eylə həzər, gör nə kamandardu türk,
Ələ tirkeş götürüb, qəsdi-dilü can gəlüri.

□□□

Giryədür xali edər möhnətlə dolmuş könlümü,
Əşki-çeşmimdür açar qəmdən dutulmuş könlümü.
Ey pərivəş, məh üzarın ərzə qıl bir mərdümə,
Bəhcətəfza et bu ənduh ilə tolmuş könlümü.
Vədeyi-vəsl ilə qılma çoq pərişan, dilbərım,
Hicr əyyamində bu aram bulmuş könlümü.
Xunçəkan peykan ilə tökmə cigər qanın dəxi,
Şərhə-şərhə eyləmə qan ilə dolmuş könlümü.
İltifati-yardən aram bulmuş görmədim,
Vadiyi-heyrətdə tənha bu yorulmuş könlümü.
Gül üzarın eşqi valeh eylədi şeyda dili,
Bağladı zənciri-tarə sər bulmuş könlümü.
Sahəti-gülşəndə, Salik, atəşi-gül həsrəti
Çoq şərərbar etdi bu atəştəb olmuş könlümü.

□□□

Görmiyüb əhli-cəfa bəndə vəfadən qeyri,
Yetmədi xatirə anlərdə cəfadən qeyri.
Əhli-təzvirü riya sakin olur sovməədə,
Görmədim sovməə, məsciddə riyadən qeyri.
Bir xərabatə güzər qıl, mey ilə saqiyə bax,
Rüxi-pakəndə görülmübdü səfadən qeyri.
Şeş cəhət möhnəti-qəmlə doludur mülki-vücud,
Bir fərağət yeri yoq şəhri-fənadən qeyri.
Oldu əğyar bənə yar yolunda qəmu xəlq,
Qalmadı kimsə mədədkar Xudadən qeyri.
Əzmi-kuyində könül talibi-imdaddürür,
Nidüm,əldə mədədim yoxdu duadən qeyri.
Salika, əhli-vücudun şərəfi fəqrdü, bəs,
Kimsəyə görmə rəva ol füqəradən qeyri.

□□□

Görmək istür genə göz ol güli-rəna yüzini,
Gülşəni-arizdə nərgisi-şəhla yüzini.
Ol səmən kakilə verrəm könülü darə çəkə,
Bir də görsəm əgər ol türreyi-ziba yüzini.
Küfri-zülfini genə ərz elərəm imanə,
Görgəc ol sünbüli-giysuyi-mütərra yüzini.
Dil giriftar elərəm silsileyi-tarə bu gün,
Görəm ər zülfi-səmənsayi-çəlipa yüzini.
Bağlaram silsilə tarə genə məftun könülü,
Türki-məstə verürəm, görsəm o rəna yüzini.
Taqi-əbrusini məscid elərəm xatirə kim,

Gər görəm ol sənəmin mahi-dilara yüzini.
Etikaf eylərəm ol deyri-müqəddəs dilə mən,.
Salika, bir də görəm gər büti-ziba yüzini.

□□□

Məgər xab içrə gördün, ey könül, ol mahi-tabani?
Gözi açub yumibcə ğərqi-əşk etdün dilü cani.
Tələttüf eylədün əvvəl, niqabı çöhrədən saldun,
Dil oldu maili-hüsnün neşün görgəc gülüstani?
Ğubari-rahimi göndərdi gərdunə xəti-ruyun,
Xəyalim vəhmi andəndür duta xurşidi-rəxşani.
Müsəvvir, mərhəba, çəkdün o dilbər surətin, əmma
Degül mümkün məramimcə çəkilmək lə'li-qəltani.
Bəladur mən kibi rüsvayi-xəlq olmaq zəman içrə,
Bu yeydür Qeysvəş məskən qılam kuhü biyabani.
Hilalun əbri-ənbərlə qılub məstur, fariğdür
Gözüm, gər bədr ola ol məh, di gəl görsün təmaşani.
Tüyuri-eşqdür başdə qılubdur aşiyan yeksər,
Şərarə çıqsə ahimdən, sovar başdən bu ğovğani.
Necə gülzari-gülşəndür, açılmış hər tərəf güllər,
Gözü məxmuri-məst etdi həmi görgəc o şəhlani.
Açılmış atəşi-güldür bu gülzarın fəzasində,
Cəhanın didəsi görmüb bu tərzi-sünbülüstani.
Salıbsan başinə, Salik, bu gülrüx yar sevdasın,
Gedər başun, əgər başdən çıqərmərsən bu sevdani.

□□□

Nizamə gör nə düzüb türk ceyşi-hinduni
Ki, əzm edibdü tökə ərsəgahə dilxuni.
Çəkibdü şəstə zehi tökməgə cigər qanın,
Urar bu sinəmə tirü sinani-caduni.
Nə kindür ki, usanmaz cəfavü cövründən,
Şərərfəşan eliyüb qəlbə tiği-əbruni.
Şikənci-zülfi-təsəlsüldə bağlıyub könülü,
Çəkübdü həlqeyi-zəncirə qəlbi-məftuni.
Kəməndi-türrəni pürtab edüb o cadukar,
Çəküb səlasili-tarə genə bu Məcnuni.
Qurubdu dami-cəfa türrə ənbərin könülə,
Kəmində məxfi qılub ceyşi-küfri-hinduni.
Gülalə sünbül alub ixtiyari-dil əldən,
Çü müşkbiz qılub ənbər ilə geysuni.
Atub sərayi-dilə tabi-türrədən qüllab,
Bu kişvəri-dilə ğafil urub şəbixuni.
Salub şikənceyi-tarə xiyali-məftuni,
Səbahü şam qəza eyliyüb cigər xuni.
Qəfəsdə həbs qılub, Salika, könül quşunu,
Mühaldur ki, xilas eyliyə bu məscuni.

□□□

Kimdürür şəmi-rüxündən dil füruzan etmədi?

Gül üzarindən könül şəhrini suzan etmədi?
Mahi-rüxsarun füruği dutdu bəzmi-aləmi,
Qalmadı aləmdə dil, ol məh ki, taban etmədi.
Rübi-məskuni müsəxxər qıldı mehri-tələtün,
Yoqdürür bir dil ki, mehri andə tüğyan etmədi.
Hüsnüvi kim gördü, mail olmadı ol gülrüxə?
Gül cəmalin sirrinə kim didə heyran etmədi?.
Kim ki gülbərgi-lətifin gördü, oldu valehi,
Qansı dil ol gülrüxə məhvi-dilü can etmədi?
Şuri-gülzari-rüxündən zövqi-dil əfzun olub,
Dil qılub xürsənd, bu sevdayə nöqsan etmədi.
Salika, bu gülrüxün sevdayi-vəslin başə sal,
Kimdü canın sərfi-rahi-ruyi-canan etmədi?

□□□

Yenə ol sərvi-rəvan etdi kəman qamətimi,
Bəs ki, rəftari-çəmi əldən alub taqətimi.
Gör nə nazü nə xüram ilə gülüstanə gedər,
Hərəkatı hədər etdi qəmu mahiyyətimi.
Ey gözüm, bu gözəlün işvəsinə, qəmzinə bax,
Bir qıya baxməqi naçiz elədi şövkətimi.
Bu nə cadudu, füsun etdi dili-məftunə,
Bir nigah ilə pərişan elədi halətimi.
Ərzi-rüxsar eliyüb, qıldı dili zarü nizar,
Zərdi-gunə elədi tabi-dərun surətimi.
Miği-muyin dağudub, gün kimi yüz etdi tülu,
Zərrə tək qıldı fəna heyəti-mahiyyətimi.
Qıldı pürtab məhi-arizi Salik cigərin,
Arturub rənci-dili, etdi füzun möhnətimi.

□□□

Yenə giryandürür didə ki, görmüb mahi-tabani,
Tüzər rüxsarə gör bir-bir düri-şəhvari-mərcani.
Rəhi-eşqində cananın nisari-xaki-pa eylər,
Müfəttən çeşm bəhrindən göhərsəmmini-qəltani.
Cigər qanın tökər hər dəm dili-pürtab hicrində,
Gəlür xunabeyi-əşkim, verür seylabə dünyani.
Əzəl ərzi-cəmal etdün, göz oldu xirə şövqündən,
Yaşurdun didədən sonra zi bəs xurşidi-rəxşani.
Könül ğəmxanəsin yıxdun ğəmi-hicri-üzar ilə,
Neşün cövrü cəfa etdün, pərişan eylədün cani?
Məşami-qəlbi-məftuni müəttər eylədün əvvəl,
Müənbər türrə şəmmilə müfərrəh eylədün cani,
Kəməndi-zülfi-mişkinə giriftar eylədin könlüm,
Zənəxdan çahinə saldun, dil oldu andə zindani.
Bəsani-Qeysi-məftundil rəhi-eşqün dutub Salik,
Siva nəqdi-dilü candan əlində yoqdu samani.

□□□

Yoxdur cinandə sərvi-rəvanın şəbahəti,

Naz ilə gər xüramə gətürsən o qaməti.
Şayəstədür, bu peykərə sərvi-Ədən desəm,
Görmüb cəhan gözü çü belə sərvi-qaməti[80].
Tubaqədi-şəmaili-dilcu gətürmiyüb
Sərvi-qədin kibi çəməni-dəhrin ayəti.
Tutisifət təkəllümə gəldükdə ləbşəkər,
Nitqi-zəmanə lal olu görkəc bəlağəti.
Təngi-şəkər çü xəstə ləbə afiyət verür,
Ver bir məzaqə ləli-şəkərdən bəşarəti.
Şəmi-rüxün çü məhfili-dəhrə salubdu tab,
Məhcub qılma didədən ol mahi-tələti.
Mahi-üzari qılma nihan çeşmi-xirədən,
Arturma zar xatirə bir də küdurəti.
Salik rəhində sərf qılubdu mətai-can,
Kəsmə dəxi sən əhli-vəfadən inayəti.
Məstur qılma dideyi-xunbardən yüzün,
Gər ah çəkəm, şərarə dutar dəhr sahəti.

Xublər rahin dutən dil şövkətü şandin keçər,
Rəhi-canan dutqalı kim, bu əziz candin keçər.
Ol ki, sevdayi-bütan bulmuş təmənnayi-dli,
Gördügündə nəqşi-büt, deyrində iymandin keçər.
Peykəri-bütmehrdin xatir füruz itkan kişi,
Şeyx Sən'andək rəhi-rəsmi-müsəlmandin keçər[81].
Kim ki, tərki-nəngü namus ilə dutmuş meykədə,
Əlğə peymanə götürsə, əhdi-peymandin keçər.
Bil ki, meyxanə rəhində sərfi-can bulğan könül,
Kişi-zöhdi tərk itar, hur ilə ğılmandin keçər.
Xatiri-Məhmudə dam olmuş şikəni-zülfi-Əyaz,
Oldürür eşq rüxündə cahü sultandin keçər[82].
Kim ki, mehri-arizi-dildari salmış xatirə,
Şahidi-yekta rəhində baği-rizvandin keçər.
Salika, keç masivadin, dut rəhi-canani sən,
Vasili-canan bulən mülki-Süleymandin keçər.

□□□

Könqül dərdiğə eşqinqdə cəhandə heç dəva barmu?
Dilim cövrünqlə zar irmiş, səninqdək bivəfa barmu?
Bu nəqdi-ömri sərf itsam səninq rahi-fəraqində,
Cigər parə, gözi yaşluq, rüxündək pürcəfa barmu?
Fəzayi-məhşərə girsam sənün eşqində "hu" eylab,
Görə bilmən qiyamətdə bənqa bir dadxa barmu?[83]
Hekayət yoqdu Əzradən, keçübdir qisseyi-Vamiq,
Məninqdək eşq rahində dəxi bir binəva barmu?[84]
Yanub eşqinq şərarilə fəraqinqdə dili-məftun,
Neta, bilmən hüzurində rüxümdək rusiya barmu?[85]
Səri-kuyində avarə gəzər şeyda dilim hər yan,
Rəhi-dərgahinqni məndək dutan gör bir gəda barmu?
Yüzin gülzarinqi görgəc bulundu inbisati-dil,
Gülüstan içrə ruyindək dəxi bir dilgüşa barmu?
Töküb eşq atəşin Salik yolinqdə kişvəri-canə,
Ruxunqdək xublər içrə cəhandə məhliqa barmu?

□□□

Fəraqi-ruyi-canandin bəsi əfsürdədir xatir,
Könülğə nəzrəti-tazə dəxi abi-bəqa birmas.
Yüzün xurşidi-ənvər tək hicabi-türrəyə çəkmə,
Günəş ruyin nihan qılsən, gözə bir də cəla birmas.
Füruği-mahi-rüxsarinq alub kim, zülfi-müşkinün,
Məhi-ənvər dilə bir də çü pünhandır, ziya birmas.
Fəzayi-gülşəni-hüsnün dutub gül atəşi yeksər,
Neşün bir bəhcəti-xatir o baği-dilgüşa birmas?
Şükufti-qönçeyi-ləlinq nişatəngizi-hər dildir,
Nişati-dil neçün əfzun qılub, qəlbə səfa birmas?
Güli-rüxsarinqə qərşu durubdur türreyi-sünbül,

Nə hasil nafeyi-sünbül məşamə bir səba birmas.
O gülbərgi-lətifinq tək gülüstan bərgi-gül bulmas,
Məşami-xatiri-zarə neşün ətri-vəfa birmas?
Üzarinq mehri-ənvər tək qılub rövşən könqüllərni,
Neçün ərzi-dilə, Salik, o gün bir rövşəna birmas?

□□□

Könqül, bir yari-dildari cəhandə munisi-can qıl,
Məhəbbət atəşi birlə fəzayi-canı taban qıl.
Dilü can kişvərin tabşur şərari-mehri-cananə,
Neçünq, pərvanəvəş xatir bu atəş içrə suzan qıl.
Cəhandə bolmağıl ğafil rüxi-məhbub zikridin,
Dəvayi-məsiyət bundə anınq yadini dərman qıl.
Yəqin bolğıl, kitarsən kim, bu aləmdin, əcəl quyməs,
O dilbər rahinə bundə dilü caninqni qurban qıl.
Əcəldin qafil olmağıl, dutər bir gün gəribaninq,
Yəqən dutmasdən ilkari di gil bu yolğə, saman qıl.
Ölümni xatirə giltür, dili əfgar qıl bundə,
Qəra yerka yatır can dib, bu müşkül işdə əfqan qıl.
Dutər məhşər güni heyrət könqülni, iş bolur müşkil,
Qiyamət müşkilin bundə əməl nəqdilə asan qıl.
Fəzayi-kuyi-cananqə məalinq gər ola yetməq,
Tiriklikdə bu aləmdə mədarinq xeyrü ehsan qıl.
Könqül xəstə, gözi yaşluq mühiblərni sevər canan,
Bu həsrət çeşmini, Salik, rəhi-yarinqdə giryan qıl.

□□□

Kim ki, ol gül çöhrəni gördü, könül zar itmədi,
Gülüzari-yardin kim, xatir əfgar itmədi.
Gülşəni-hüsni-nigarindin nişati-dil bulən,
Hicri-gülbərg ilə möhnət xatirə bar itmədi.
Ənbəri-Sara məşamə zülfi-ənbərdin dutan,
Dil giriftari-kəməndi-türrə tərrar itmədi.
Xuşə-sünbül xərməni-gülzari-canandin bulan,
Keştzari-arizi-dildardin bar itmədi.
Sağəri-ləli-ləbi-meyguni dutqan xəstə dil,
Şəhdi-kami-arizu, ləli-şəkərbar itmədi.
Gülüzari-yardin xatir bolub aşüftəhal,
Kim ki, gördi gülrüxi, ol, didə xunbar itmədi.
Atəşi-gül cövrdin Salik dilin pürtab idüb
Kim, görüb ol gülşəni, xatir şərərbar etmədi.

□□□

Noldu cürmüm, dilbərim, axir cüda qıldınq məni,
Möhnəti-hicranə bir də mübtəla qıldınq məni
Kim, dili-Məcnunimi saldın çölə Leylisifət,
Eylədinq aşüftəhal, andin gəda qıldınq məni.
Dil bulurdi bir təmaşayi-cəmalindin nişat,
Nişə özünqdin ayırdın, binəva qıldınq məni.

Xatirə tökdün şərari-dudi-hicri aqibət,
Bəs neçün əvvəl özünqa aşina qıdınq məni?
Çöhrəni pünhan qılub, etdinq cəfa heyran gözə
Kim, müjeyi- xunbar ilə xunin liəva qıldınq məni.
Möhnəti-dərdi-fəraqi könqlümə gördinq rəva,
Rənci-xatir arturub, əhli-ina qıldınq məni.
Saliki eşqinq rəhində bihünər gördünq, əya?
Dərgəhində gör ki, axir rusiyah qıldınq məni.

□□□

Kim ki, gördü qəd xuramaninq ki, candin keçmədi?
Qaməti-rənani görgəc xanimandin keçmədi?
Nazü ğəmzü haləti-rəftarınq aldı səbri-dil,
Peykəri-nəğz ilə dil sərvi-rəvandin keçmədi.
Mişkbu sünbül ələ gülzari-hüsnündin dutən,
Seyri-gülgəştü fəzayi-bustandin keçmədi.
Laləvü reyhan cəm irmiş bustani-arizinq,
Kim ki, gördi gülşənin, ol gülsitandin keçmədi.
Nərgisi-şəhlanı görgəc bir xumarın bağ ara,
Kim görüb məkrü füsunin, cadu andin keçmədi.
Cür'əbəxşi-xatir olmuş sağəri-lə'li-ləbinq,
Cür'əxari kimdü, Təsnimi-cinandin keçmədi?[86]
Məşrəbi-safi-zülali-ləbləringq ehyayi-dil,
Kim görüb bir cür'ə, abi-həyəvandin keçmədi?
Salika, bu sərvi-qəddin sayəsində dut məqam,
Ni gərəkdür masiva kim, xakdandin keçmədi?

□□□

Pəripeykər güləndamə əcaib dilrüba dirlər,
Gülüstani-İrəm içrə onqa huriliqa dirlər.
Səni Leylayi-rəna tək salubdır şöhrətə hüsnünq,
Məni Məcnuni-rüsva tək qəpuğində gəda dirlər.
Nə kim, aləmdə bidil bar, ani bir nazü qəmzəylə
Alursən haləti-qəlbin, bəsi dil mübtəla dirlər.
Xurami-nazi-rəftarinq alur yeksər qərari-dil,
Pərişan xatir itdikdə könqülni, pürbəla dirlər.
Fəzayi-kuyinqa yetsəm, fəğanım ərşi titradır,
Nə çəndan ki, nəva qılsam, hənuz köp binəva dirlər.
Yüzin saru nigah etsəm, alur dil bəhrə ruyindin,
Məhi-rüxsari görkandə, dilə bəhcətfəza dirlər.
Quristanğə güzər qılsənq, təbəssüm eyləban nagəh,
Bari mürdə hamı gordən turub, vahəsrəta dirlər.
Rəhi-eşqinq dutub Salik, vəfa kuyin qılub məskən,
Neşün, aləmdə bidillər onqa əhli-vəfa dirlər.

□□□

Ol ki, sübh uyqusidin çeşmi-dili bidar iməs[87],
Vasili-canan bulur kim, layiqi-didar iməs.
Guşi-xatirni qılən kər sübh tangindin səhər,

Çeşmi-dil binuri-xatir, bəs ki, biənvar iməs.
Ruzi-məhşər bəhrəyab ulmas şəfaətdin, könül,
Ol kişi kim, dustdari-Əhmədi-Muxtar iməs[88].
Mərifət təhsil bulqan, taətə qıl ciddü cəhd,
Ğərqi-rəhmətdür bu yoldə kim ki, bu kirdar iməs.
Ol ki, mehri-yardin dil kişvərin pürtab etüb,
Sərgiran olməs qiyamət gün ki, nik ətvar iməs.
Mərifət rəxtilə zeybi-duş hər qilqan, könül,
Dil qılub xürsənd bundə, bəs ki, xoşrəftar iməs.
Taəti-həqq birlə, Salik, etmə xatircəm, neçün,
Gülsitanlərğə nəzər qıl, bir gülü bir xar iməs.

□□□

Rəhi-eşqində can birmey vəfa rəsmində qan ulmas,
Neşün, canan rəhində sərfi-candin nəqsi-can ulmas.
Vüsalinqni tilab, hicran otiğə canü dil yaxməq,
Mədari-eşqdür bəs ki, bu sevdadə ziyan ulmas.
Səri-kuyində sərgərdan bu ömrimni təmam itsam,
Qiyamət tnqi atğuncə sənin dərdin əyan ulmas.
Nidüm bu rahi-eşqində, kimə söylüm könqül dərdin?
Yəqin bu rahdə ölsam, qəmim şərhi bəyan ulmas.
Xuda qazi bolub sorsa bu möhnətka dilim yoqdur,
Qəmi-hicrin bəyan qılsam, qəmim ildən nihan ulmas.
Cigər qanin rəvan etsam, gözümdən qəm olur zahir,
Xəlayiq zar yığlaşur, könül sirri nihan ulmas.
Ləhəd içrə fəğan eylab, rüxün cövrin əyan itsam,
Mələklər zar itar xatir, bu şərhə dastan ulmas.
Vüsali-yarə dövrandə ümid etgil, sən ey Salik,
Bu dəhrin qayəti yoqdur, neşün axirzəman ulmas?

□□□

Kim ki, cananin sevər, kəsmək gərək candin təmə,
Vər sevərsə canini, kəssün o canandin təmə.
Rənci-rahi-dilbəri vər çəkmiyə məftun könül,
Yeydürür qət eyləsün rüxsari-xubandin təmə.
Möhnəti-eşqi-rəhi dildardin dil mən idən,
Fərzdür bəs kim, kəsə ol mahi-tabandin təmə.
Qaməti-rənayi-sərvi-bağdin bəhcət bulən,
Ni təəccüb, gər kəsə sərvi-gülüstandin təmə.
Bustani-arizi-cənanidin dil bulsə zövq,
Eyş xatirni gərək kim, bağü bostandin təmə.
Gər gülüstani-cəmali-yari görsə çeşmi-dil,
Səhldür qət eyliyə gülzari-rizvandin təmə.
Gülşəni-gülzari-yarindin ələ sünbül dutən,
Qılməsün ərzə məşamə ətri-reyhandin təmə.
Salika, bir gülşəni-rüxsari-yarə qıl nəzər,
Qılmə ərzə mərdümə seyri-gülüstandin təmə.

□□□

Bənqa dərdindürür dərmandin ərtuq,
Sənqa qul bulğanum sultandin ərtuq.
Əgər hamundə yadinq olsə virdim,
Olur səhra bənqa bustandin ərtuq.
Gita zikri-camalınq gər tilimdin,
Könqül şəhri bolur virandin ərtuq.
Rəhi-üsyan dutub dil qəflətimdin,
Nəzər itganligin ehsandin ərtuq.
Əzizü xar qılğan lütfü qəhrinq,
Bolur lütfün bənqa rizvandin ərtuq.
Əcəb ulməs qulin əfv etsə xacə,
Neçün, ol qul bolur xaqandin ərtuq.
Vüsalindir bənqa yeyraq cinandin,
Bolur hicrindəki nirandin ərtuq.
Ni bulğay dərdi-eşqin talibi-zöhd,
Bu dərdin bulğani loqmandin ərtuq.
Əgər eşqin rəhin Salik bıraqsə,
Nə yol dutsun rəhi-canandin ərtuq?

□□□

Çiqa barğay axiri təndin əziz canim məninq,
Dəgşürər axir mənazil üşbu mehmanim məninq.
Mərgdin dil qafil ulməq ni gərəkdür dəhr ara,
Çün əcəl qərşu turub dutsun giribanim məninq.
Tökməsam hicran güni rahi-nigarə xuni-dil,
Vasili-canan ni bulğay qəlbi-nalanim məninq.
Eyşi-dünya məkrdin vermiş xiyalə kim, fərib,
Ni gərəkdür baği-rizvan, bar gülüstanim məninq.
Kuyi-eşqi-yarə gir, sal başə şuri-dilbəri,
Heç gərəkməz xatirə hur ilə qılmanim məninq.
Kövsərü Təsnimə qilməs meyl təşnə xatirim,
Bəs ki, bar safi-zülali-şəkəristanim məninq.
Qaməti-sərvi-səhi gülşən fəzasin dutqali,
Eyşi-xatir arturub sərvi-xüramanim məninq.
Salika, bu dilbərin rahinə sərf et nəqdi-dil,
Yeydürür kim, xublərdən türfə cananim məninq[89].

□□□

Olub dərdin bənqa dərmandin əfzun,
Sənqa qul bulğanim sultandin əfzun.
Əgər yadinq olə hamundə virdim,
Olur hamun bənqa bustandin əfzun.
Tilimdin gər gita zikri-cəmalinq,
Könqül şəhri bolur virandin əfzun.
Diləfkar bolmuşəm öz qəflətimdin,
Nəzər etkanliginq ehsandin əfzun.
Əzizü xar qılğan lütfü qəhrinq,
Olur lütfin bənqa rizvandin əfzun.
Əcəb olmas qulin əfv etsə xacə,

Bolur ol qul, neşün, xaqandin əfzun.
Vüsalindür bənqa yeyraq cinandin,
Vəli hicründürür nirandin əfzun.
Ni bulğay dərdi-eşqin talibi-zöhd,
Bu dərdin bulğani loqmandin əfzun.
Əgər eşqin rəhin Salik bıraqsə,
Nə yol dutsun rəhi-canandin əfzun?

□□□

Qəra gündür ouşal saət ki, aləmdin səfər qılsən,
Mənalü malü mülkündin bari sindin güzər qılsən.
Səni quyməs əcəl hərgiz, əgər hökmün rəvan bulsə,
Hökumətlə gər aləmni həmi zirü zəbər qılsən.
Mühəssəldür xəlayiqqə əcəl misli-yəsavul tək,
Alur can aluci canin, əgər çoq zarlər qılsən.
Yaranmış şərbəti-mərgi gərəkdür qamısı içsün,
Qaçub andin qutulməzsən, əgər çoq-çoq həzər qılsən.
Xəlayiqnün məzariğə barub bir-bir təmaşa qıl,
Ölünqlərdin alub ibrət əgər türfə nəzər qılsən.
Bacarsən yəxşiluq qıl,qıl gətir sən uşbu dünyadin,
Qiyamət tuşəsi yeydir, gözün xuni-cigər qılsən.
Qədər fərmanini dutqan bolur kim, övliyalərdin,
Bolursən övliyalərdin riyazətlə hünər qılsən.
Təfaxür eyləmə cahü cəlalü izzətə, ey dil,
Qani baqi olən hişmət, vər andə fikirlər qılsən?
Qani bəs zivərü zeyb, əsasi-cümlə zişövkət?
Fəna naçiz itüb qami, nəzarə türfətər qılsən.
Qani İsgəndəri-dövran, qani Turani-şəhi-türkan?
Qamusi cahidin keçmiş, əgər ibrət nəzər qılsən[90].
Gəl, ey dil, məsiyyət birlə həyatin qılmağil zaye,
Bolursən layiqi-həzrət, əgər taət səhər qılsən.
Səravü bağü bustanə dəxi bil bağləmə, Salik,
Vəfa kim, yoxdu dövrandə, əgər zərrin kəmər qılsən.

□□□

Mürği-xatir girehi-türrəyə məftun olalı,
Qərəquş çənginə gör kim, nə giriftar olubəm.

□□□

Xüramə gəldi çü sərvi-qəd, peykəri-tənnaz,
Qərari-səbri-dili aldı qəmzü işvəvü naz.

□□□

Sitəmi-hicri-rüxün xatiri çün qıldı figar,
Nə rəva eyləyəsən xəstə dili bir də nizar.

□□□

Hicrəti-mahi-rüxün aldı qərari-könülü,
Nolur insaf edə, ehya eyliyə mürdə dili.

□□□

Nə yəman dərddür aləmdə fəraqin ələmi,
Səhl gər olmiyə bu vərtədə əğyar qəmi.

□□□

Bir də hicran ilə gəl xatiri əfgar eyləmə,
Qəlbi-rəncurə dəxi atəş urub zar eyləmə.

□□□

Bu fəraq atəşi gör qəlbə salub yeksərə tab,
Nə şərərdür ki, qılub xatiri pürtabü kəbab.

□□□

Qədkəman etdi bəni sərvi-səhi, qaməti-yar,
Cövri-hicran ilə qıldı çü dili zarü nizar.

□□□

İştiyaqi-güli-ariz alub arami-dili,
Bağluyub silsileyi-tarə çü məftun könüli.

□□□

Çü dərdi-hicr məzaci füsürdəhal eylər,
Mərizi-eşqə əlac eyləsə, vüsal eylər.

□□□

Girehi-zülfi-təsəlsül olalı dami-fitən,
Salub ol damə xiyalim quşunu türrəşikən.

□□□

Çəküb kəməndə dili geysuvani-mişkindən,
Məhaldur ani almaq üqab çəngindən.

□□□

Yetür məşamə şəmmi-türreyi-ənbərsara,
Nedüm, qəzali-Xütən didədən nihandur[91].

□□□

Qılub məşami müəttər nəvidi-nafeyi-Çin,
Məgər səba güzər eylübdü vadiyi-Xütənə?[92]

□□□

Salub şikənceyi-tarə bu qəlbi-məcnuni,
Çəküb səlasilə gör kim, xiyali-məftuni.

□□□

Qurubdu dami-cəfa türrə ənbərin könülə,
Qılubdu həbs dili, baqmıyub əsiri-dilə.

□□□

Füsuni-nərgisi-şəhla qılubdu halimi zar,
Neşün, müfəttən edüb xatiri o cadukar

□□□

Gövhər pərənddür genə gülzar caməsi?
Yoqsa ki, meyli-gülşən edibdür bu gün nigar?

□□□

Rəşki-həsəd cinanə yetüb hurieyn ilə,
Gülzari-dəhrə bəs ki, qoyubdur qədəm nigar.

□□□

Gəlmiş xüramə sərvi-rəvanın çü qaməti,
Nərgis gözünü xirə qılub zibi-surəti.

□□□

Şanə çəkübdü dəsti-səba türrə ənbərə,
Eylüb genə məşamı müəttər o mişkbu.

□□□

Dami-cəfa qurubdu genə mürği-xatirə,
Cövri-təsəlsül, girehi-zülfi-pürşikən.

□□□

Bu türki-məstdən həzər etmək olubdu fərz,
Dilduzdur xədəngi, neşün, cansitandur.

□□□

Yoqdur mürüvvəti, zibəs insafı qalmıyub,
Çaçi-kəman alubdur ələ,qəsdi-can edüb.

□□□

Əzm eyliyübdü ərsəni qan ilə rəng edə,

Köksü genə nişaneyi-tirü xədəng edə.

□□□

Atar bu sinəmə nuki-xədəngi-müjganı,
Yetər çü qəlbə, tökər ərsəyə cigər qanı.

□□□

Çıxub cidalə genə türki-məsti-xunaşam,
Çəkübdü qəsdi-dilə əbruvandən səmsam.

□□□

Qövsi-qüzeh çü halə alub mahi-ənvəri,
Xurşidi-arizi dutub əbri-xəti-üzar.

□□□

Mərdümi-çeşmim yüzün görməgə müştaqdürür,
Məxzəni-arizinə dil bəsi möhtacdürür.

□□□

Şəkkərşikən olub ləbi-qənnadi-şəhdbiz,
Tuti bəsan çü nitq qılub ləli-xoşgüvar.

□□□

Gülşəndə qönçə gül ləb açubdur təbəssümə,
Bəs ki, gəlüb şükuftə ləbi-qönçeyi- nigar.

## MƏSNƏVİ

Ey badi-şimali-ənbərindəm,
Vey peyki-şəhənşəhi-müəzzəm.
Qıl bir güzər Ərməninzəminə[93],
Seyr eylə diyari-nazəninə.
Kim, andədür ol bənim pənahım,
Şahim, şərəfim, ümidgahım.
Göz mərdüməki, süruri-canım,
Cism içrə nihan olan rəvanım.
Eyşi-dilü cani-biqərarım,
Sərmayeyi-izzü iftixarım.
Sultanə səna yetür gədadən,
Qil ərzə fəqirü binəvadən.
Razi-dili ol nigarə söylə,
Keyfiyyəti-hali yarə söylə.
Ərz eyləgilən ki, ey vəfadar,
Key xosrovi-adilü nikukar.
Əxlaqına etimad edərdüm,
Bu əzmlə könlü şad edərdüm.
Şayəd olasən bənimlə həmraz,
Pünhan ola aşikar olan raz.
Netdüm sana, qəsdi-canım etdün?
Zari-dili-natəvanım etdün.
Hicrində dilim kəbab olubdur,
Göz kəştisi qərqi-ab olubdur.
Seylabi-sirişk apardı canım,
Qərq etdi nəhali-dilsitanım.
Girdabi-qəmə düçar oldum,
Ol vərtədə dilfigar oldum.
Xunabeyi-didə qıldı tufan,
Oldum bu əlamətə hərasan.
Mövci-qəmü qüssə başdən ötdi,
Səbrim tükənüb, qərar getdi.
Rəhm eylə bəni-fəqirü zarə,
Lütf ilə bu dərdə eylə çarə
Ki, tərzi-vəfadə biqərinə,
Arami-dilü süruri-sinə.
Key munisi-canü türfə dilbər,
Vey türreyi-ənbərin səmənbər.
Ey qibleyi-əkrəmi-qəbail,
Məcmueyi-əzəmi-fəzail.
Ey zeybi-səriri-şəhriyari,
Şayəsteyi-təxti-tacidari.
Ey məzhəri-qüdrəti-İlahi,
Vey layiqi-mülki-padişahi.
Ey əxtəri-asimani-izzət,
Vey nəyyiri-məşriqi-səadət.
Seyr eylər idim fəzayi-hamun,

Gördüm biri müstəməndi-məhzun.
Zülfün kibi piçü tabə düşmüş,
Simabvəş iztirabə düşmüş.
Xunab rəvan olub yüzünə,
Nə cisimü nə can gəlür gözünə.
Daim işi nalə idi, əfğan,
Ağlardı, tökərdi didədən qan.
Ol zarü nəhifü aşiqanə,
Bu nəzmi yazub, çəküb bəyanə.
Olmuşdu dilində vird əş'ar,
Bu bir qəzəli elərdi təkrar:
Can zardu, dil nizar sənsiz,
Canü dil olub figar sənsiz.
Ey şahidi-məhvəşi-yeganə,
Dünyadu gözümdə xar sənsiz.
Səbrim tükənüb, gedübdü taqət,
Etməkmi olur qərar sənsiz?
Payanə yetişdi nameyi-ömr,
Əldən gedüb ixtiyar sənsiz.
Hicrində kəman olubdu qamət,
Çeşmim olub əşkbar sənsiz.
Xunab tökər gözüm həmişə,
Ey munisi-gülüzar, sənsiz.
Rövşən günüzüm olubdu yəlda,
Tar oldu bu ruzigar sənsiz.
Cövri-sitəmin nişatə yetdi,
Eyşim olub ahü zar sənsiz.
Sərmayeyi-ömrü sərf qıldum
Rahi-tələbində, yar, sənsiz.
Eşqin rəhini dutubdu Salik,
Daim çəkər intizar sənsiz.

## QƏSİDƏ Fİ MƏDHÜ ZƏMMİ-ÇAYİ-XƏTAİYE
## SƏRAPA XƏTA

*(Başdan başa müqəssir olan çayın tərif və*
*tənqidi haqqında qəsidə)*

Nəfsi-sərkeş könülə xahişi-qəlyan gətürər,
Tərki-adətlə bəsi hali-pərişan gətürər.
Şövqi-qəlyan çü düşüb başə, qılub zar dili,
Könülə hicri anin atəşi-suzan gətürər.
Genə bu türfəcə karə dili təhris qılub,
Gör fəribin, həmə dəm fikri-peşiman gətürər.
Bu füsun ilə ki, gərçi görünər andə zərər,
Leyk nəfi könülə rütbeyi-insan gətürər.
Qalib olduqda zəmirə sifəti-təb'i-səbo',
Şüğli-qəlyan ilə dil helmi-füruzan gətürər.
Atəşi-qüssədən ər tabi-şərər qəlbə yetə,
Məhfilə varid olur, şuri-nəvaxan gətürər.
Vər şəmatətlə ədu tiri-cəfa köksə ura,
Mərhəmi-zəxmvəş arami-dilü can gətürər.
Künci-üzlətdə ki, tənha olasən, munis olur,
Səbrü arami-sükun xatirə yeksan gətürər.
İstişarə elədüm əqli-süxəndanə, dedi:
Adəti xatiri-zarə bəsi nöqsan gətürər.
Həzər et kim, bu siyəh dil bəsi bədxahdürür,
Yetər azarı dilə, qəlbinə əhzan gətürər.
Neçə nöqsan yetürər xatirə mötadlıqı,
Biri ol miknətə gör kim, necə xüsran gətürər.
Birisi ziqi-nəfəsdür, elər əhvalını zar,
Sinəni təng elər, axir ki, xəfəqan gətürər.
Həyəcanə gətürər bəlğəmi köksündə müdam,
Türfə əfzun olu bəs, sinədən al qan gətürər.
Verü səfrayə zibəs qüvvə, alur hali-dili,
Möhriqi-qəlblə ruxsarə yərəqan gətürər.
Bu töhi məğzdə çoqdur sifəti-kibrü qürur,
Məhfilə qamətini gör nə xuraman gətürər.
Sərvi-azadə kimi rast qılub peykərini,
Qəd səhivəş, özüni bəzmə girancan gətürər.
Küreyi-atəş elər başini gündə neçə dəm,
Sərsəbükdur ki, başə dudi-pərişan gətürər.
Məgər aşiqdü, neçə qönçə ləbi busə qılar?
Leyk ləli-şəkərə hənzəlü qətran gətürər.
Bilmənəm hansı gözəl şövqini başinə salub,
Ürəgi dərdə gəlüb, şurişü əfğan gətürər.
Mail olduqda təbiətlə olur ünsi füzun,
Başı qovğayə salur kim, zərəri-can gətürər.
Arturər xərcini sərkarin əgər adət ola,
Meyli-tənbakuyi-Şiraz ilə Kaşan gətürər[94].

Düşməsə gər ələ tənbaku, olur qüssə füzun,
Qəmü ənduh bəsi xatiri-nalan gətürər.
Aparar dəxli, olur dəst töhi, mayə gedər,
Zimmənə bir neçə tuman genə tavan gətürər.
Göndərər qapusinə bir neçə nakəs kişinün,
Verməsə qərz, könül həsrət ilə qan gətürər.
Daş düşər başinə gər gəlməsə tənbaku ələ,
O qədər yəs dutar, dideyi-giryan gətürər.
Gər fəravan ola tənbaku, yetər qəlbə sürur,
Bəhcəti-xatir ilə arizi-xəndan gətürər.
Gəh bəyanə çəkər ovsafini kaşi sənəmin,
Gör necə mədhi-rüxi xatirə vəcdan gətürər.
Ərzə qılduqda o gül peykəri pürzövq dilə,
Dili-məftuni o gül çöhrəyə xahan gətürər.
Faruqi-ə’zəm tiryaqə qoyub ad hükəma,
Nöşün, əfyundu hamı dərdə, bu dərman gətürər.
Dutar aram günüz pərdeyi-ixfadə o şux,
Şamgəh xəlvətidən məhfilə cövlan gətürər.
Yetürər kami-dilə şəhdi-təmənna həmə dəm,
Hamı mail, vəli dövrü bərə yeksan gətürər.
Gəh çəkər pərdeyi-ixfayə özün türfə sənəm,
Dili-müştaqə qəmü qüssə fəravan gətürər.
İltifatin götürən dəm dili-məftunləri,
Filməsəl, məclisə bir qalibi-bican gətürər.
Aparur hicri zibəs xatirdən ruhi-həyat,
Mürdə tən çulqəməqə sövbi-Əmirkan gətürər[95].
Kişvəri-qəlbi xərab etməgə çün əzm qılar,
Genə təmirinə gör kim, necə əvan gətürər.
Üfüqi-tələtdən göstərü gəh mehri-rüxün,
Məhfili-tari-dilə məşəli-taban gətürər.
Çü məhəbbətdən urar dəm, səni xoşxatir edüb,
Bəhcəti-qəlbü sürurі-dili-nalan gətürər.
Pərdədən dişrə çıxub göstərü məhvəş yüzünü,
Şövqi-sər arturu, həm zovqi-dilü can gətürər.
Dəmi-İsa kibi ki, mürdə dili zində qılar[96],
Neçə pəjmürdə dilə ruhilə reyhan gətürər.
Mümkün olduqda vüsali gətürər fikrü həvas,
Bir neçə dəm könülə nəş’ə fəravan gətürər.
Gətürər çürti, xəyali dağıdar, fikr gedər,
Xarici-adətlə əcəb xabi-girancan gətürər.
Nəşə çün zail olur, qəlb nişatin aparır,
Dilə ənduh bəsi hali-pərişan gətürər.
Sərd olduqda həva, ünsi qilar gərm dili,
Şölə başdan çıqarar, dudi-nümayan gətürər.
Əl-ayağ dağlu kim, süst olu həm saidü saq,
Vəqti-adət çü keçər, qətlinə fərman gətürər.
Gəh çubuq halətini şərh qilar şəxsi-dilə,
O töhiməğzə könül meyli-fəravan gətürər.
Zəhməti arturubən möhnət olur təndə füzun,

Dil hərasə gəlübən hali-pərişan gətürər.
Bu xərab şəhrdə pakizə tütün gəlməz ələ,
Bəs ki, ol hərzə tütün sinəyə nöqsan gətürər.
Göndərər fikri gəhi Tiblisə, gəh Səlmasə[97],
Bu xəyal ilə ki, ol şəhrdən ərzan gətürər.
Gəh xəyali çəkər Urumiyü Kürdüstanə[98],
Başı qovğayə salur, qəlbi-hərasan gətürər.
Cəm elər başə neçə məğztöhi, sərsəbüki,
Gündə yüz löbət o hoqqəbazü nadan gətürər.
Razi olmub bu hamı möhnətü azari-dilə,
Bir də qəhvə çayını bəzmə sənaxan gətürər.
O siyəh çürdənin ovsafini çün nəzmə çəkər,
Mədhət olduğda o qəlbiqarə tüğyan gətürər.
Peykərin dağ qilar atəşi-xudbinlik ilə,
Ərməğan bəzmi-xəvasə dili-büryan gətürər.
Mütəarifdi ki, mötadi-çubuq mail olur,
Meyl oldukdə ona, ol dili-suzan gətürər.
Qəhvədan içrə özün məhfilə dilsuz aparar,
O siyəhçöhrə peyapey neçə fincan gətürər.
Qəhvə-qəlyan ilə gər kami-dili hasil ola,
Zövqi-dildən başinə şuri-nəvaxan gətürər.
Saz elər nəğmeyi-neyrəng zəban xamə ilə,
Səfheyi-xatirə sərməşqi-dəbiran gətürər.
Nəqş edər lövhi-xəyalə gəhi çay dəstgəhin,
Fikri-sərmənzilini nəqşi-nigaran gətürər.
Qurulur əncüməni-dildə simavarə büsat,
İstikan-zirləri cümlə zərəfşan gətürər.
Atəşi-eşq ilə dil şurə gəlür, nalə çəkər,
Tabi-dildən başə çoq dudi-pərişan gətürər.
Gərmsər olduğidə rast nəvadən dəm urar,
Şurə gəldikdə dili nəğmə əşiran gətürər.
Gah bir neçə zərif əhli-dili başə yıqub,
O neçə həmdəm ilə seyri-gülüstan gətürər.
Gəhi gülzarə olur meyli, gəhi bustanə,
Neçə rəna qədi həmrahi-xuraman gətürər.
Gəh yiqər dövrbərə cümlə furumayələri,
Mizbanə bəsi nöqsani-fəravan gətürər.
Cəm elər bəzmə neçə mərdi-qəbahət naşünas,
Əncümən içrə genə bir neçə kövdan gətürər.
Təməi-çay ilə bəhsü cədəl ortayə gəlür,
Hər kişi qübh sözün ayəti-bürhan gətürər.
Guş verməz süfəha qövlinə ərbabi-xirəd,
Leyk məfhum eləməz, süfləvü nadan gətürər.
Gah olur məclisi gərm etməgə ərbabi-hünər,
Çaqurur bəzmə neçə mərdi-süxəndan gətürər.
Açılır söhbəti-bazarı furumayələrin,
Müştərigunə xiridari-fəravan gətürər.
Rəh çayinin çü dutar ismətlə aqpərə çami,
Ərəqi-şərm ilə ariz dürü mərcan gətürər.

İstəkan-zir, qaşuq ğuteyi-gərmabə qılar,
Şüstüşu bəs ki olur, çöhrə firuzan gətürər.
Paki-pakizə olur yeksərə əndami-zuruf,
Pürsəfa, safi-dilü arizi-taban gətürər.
Zivəri-məhfil olur rövnəqi-bəzm ilə təmam,
Əmcümən əhli hayı xatiri-şadan gətürər.
Şahidi-Misr çıqar pirəhəni-sündüsdən
Kim, nişati-könülə türfəcə canan gətürər[99].
Qəd səhi, qamət sərv, həmə əndam lətif,
Sahəti-məhfilə qəd sərvi-xuraman gətürər.
Gör nə məhvəşdü bu dilkeş çoxu pabəst qılub,
Çöhrə göstərməgə aşiqləri yeksan gətürər.
Zeybü zivər verər əndaminə ol çöhrəqəmər,
Filməsəl, məhfilə bir şahidi-rizvan gətürər.
Əzmi-gərmabə qılubdur məgər ol simbədən,
Peykəri-nəğzi görən kim, neçə üryan gətürər.
Kam verməklə şəkərləblərə ol ləli-şəkər,
Ləli-peymanə bərayi-ləbi-ətşan gətürər.
Dövr elər əncüməni üç kərə ol şahidi-şux,
Zövqi-dil hasil olur, qəlbi-peşiman gətürər.
Gərçi şirin kam olur çay içən dəmdə hərif,
Təlx olur kami-dili andə ki, xüsran gətürər.
Əjdəhapeykər simavər olur adəmxar,
Səni kaminə çəkər, miknətə talan gətürər.
Çoq müzəvvirdü Xəta çayi, xətakardürür[100],
Bilmiyübsən sənə ol şux nə fərman gətürər.
Cəm elər başinə ovbaşi-əcamir sipəhin,
Əl açar ğarəti-malə, ürəgə qan gətürər.
İktifa eyləmiyüb bu qədər azari-dilə,
Türk-tatari yıqər, ozbəkü əfğan gətürər.
Verü yəğmayə, hamı miknəti-mali aparır,
Dövləti əldən alur, nemətə xüsran gətürər.
Tükədər kisə pulun, zeyb ilə zivər satulur,
Verü taracə hamı, axiri tufan gətürər.
Dərdi-iflasə giriftar elər axir ki, səni,
Fəqrinə şamü səhər nameyi-ünvan gətürər.
Pozulur dəstgəhin, bərhəm olur cümlə büsat,
Axiri gərdəninə qərzi-fərəvan gətürər.
Mihman varid olan dəm yügürərsən bucaqə,
Dəstgəh olmasa, dil payi-gürizan gətürər.
Mihman yaninə gər zillət ilə yüz qoyasan,
Bəs ki, azərm çəkərsən, ürəgin qan gətürər.
Şahidi-Çin əgər pərdeyi-ixfayə girə,
O nəjadi-həbəşi arizə kirşan gətürər.
Yəni sərkardə gər çayi-qəra bir buluna,
Təbi-ali ani mehmanə girancan gətürər.
Xah-naxah, əgər çayi-qəra birdən içə,
Əli qoltuqda qalur, xatiri əhzan gətürər.
Mərd naəhl ola gər, qaşqabaqı yer süpürər,

İç-içindən kəsülür, hali-pərişan gətürər.
Bir kinayə sözü hər dəm buraqur ortayə,
Təneyi-səxt kəmandən dilə peykan gətürər.
Peykəri-ruhə çəkər tə’n söz ilə qəvarə,
Verür azar dilə, qəlbi-pərişan gətürər.
Yüzünə gər demiyə acı sözü, şərm qıla,
Gər kənarə olasən, qeybətü böhtan gətürər.
Adına nisbəti-nakəs verür, insaf eləməz,
Bəs ki, sərsamə giriftar olu, həzyan gətürər.
Səni rüsvayi-xəlayiq elər ol biazərm,
Qədri-nemət tanımaz, axiri küfran gətürər.
Salika, bilmənəm axir bu nə mədhdü, nə zəmm,
Təbi-mövzuni gəhi çayə sənaxan gətürər.
Gəh gedər zəmminə ol şahidi-gülrüxsarun,
Heyf bu təbi-gözəl kim, neçə əfsan gətürər.

□□□

## MƏXLUQATIN VƏZİYYƏTİ BARƏDƏ QƏSİDƏ

Hiç idrak etməzəm kim, səfheyi-aləm nədür?
Ərseyi-aləm ara şüğli-bəniadəm nədür?
Şeş cəhət qovğa dutubdur ruyi-afaqi, cədəl,
Cəhlü bəhsi-filsufi-sifləvü əfhəm nədür?
Nöh rivaqi-sərbülənd, ali binayi-zərnigar,
Sün'i-nəqqaşi-əzəl, zəngarqamət xəm nədür?
Bisütun xərgah, ali mənzəri-minayi-çərx,
Sərbepa gülduz, dəsti-qüdrəti-əzəm nədür?
Ol müqərnəs taq kim, məviyi-ruhanidür,
Cümlə alişəni-valamənsəbi-mö'zəm nədür?
Kibriyayi-qüds dərbarinə yol bulmuş rəqib,
Ol hərimi-qüdsə bilmən rahi-naməhrəm nədür?
Nə ədavətdür ki, qılmış Bülbəşərlə Əhrimən,
Firqeyi-nəsnas ilə kini-bəniadəm nədür?[101]
Əqli-küll olduqda babi-mərifət, rahi-hüda,
Dəstgahi-cəhli-mütləq dəhr ara fərhəm nədür?
Puri-İmran rəhbəri-rahi-yəqin olmuşdürür,
Cibtü Tağutü Vəsən ayini bəs fərhəm nədür?[102]
Tinəti-ənvarə zülmət surətin qılmış qərin,
Çöhreyigüldə tirə gəllə, hikməti-mübhəm nədür?
Eyləmiş məzhər vücudə peykəri-mahiyyəti,
Şahidi-ziba yüzündə pərdeyi-müzləm nədür?
Zivəri-duş eyləmiş zülmət qəbasin tirə şəb,
Gün nihan olduqda bilmən sübhi-mişkin dəm nədür?
Gər behişti-cavidandur gülşəni-rüxsari-yar,
Hurieyni-rövzeyi-rizvani-ənbər dəm nədür?
Vər zülali-lə'li-şəkkərdür nişatəfzayi-dil,
Kövsərü Təsnimi-şəhdbiz, şəkkər tə'm nədür?[103]
Hicri-dildar isədir niyrani-üşşaqi-cünun,
Kol şərarərizi-zindani-bəla, pürğəm nədür?
İbtidavü intiha gər dəhrdür aləm ara,
Leyk bilmən dəhr içrə bu zəmani-kəm nədür?
Kim, qələtməşhurdur: Mülki-Süleymandur cahan,
Məsnədi-izzətlə təmkini-Bəni-Ədhəm nədür?[104]
Div bəndi-hirzi-əngüşti-Süleyman oldu vər,
Əhrimən əngüşti ilə cilveyi-xatəm nədür?[105]
Həbbəza, dərki-Sekəndər, mahiri-fənni-şərif,
Səfheyi-miratdə nəqşi-rüxi-aləm nədür?
Cami-Cəmşidi-cəhanbin müştəhərdür qərnü sal,
Bilməzəm Cəmşid kimdür, bəs bu cami-Cəm nədür?[106]
Səbti-dəftər eyləmiş Kəsra adın ədlilə dəhr,
Qutəvər olduğdə bəhri-rizişə, Hatəm nədür?[107]
Kəbə xürrəmdil gərək olduğda, qiblə am ara,
Dağıdari-qəlb ilə gözdən axan zəmzəm nədür?

Babi-tövhidliyədür rükni-Yəmani, bilməzəm
Kəsrəti-əhli-hərəmlə olduğu xürrəm nədür?[108]
Nə həcərdür təng basmış bağrına rükni-Əraq,
Əhd təcdid etdügi bu ərsədə hər dəm nədür?
Naseha, rindi-xərabat əhlinə çoq qılma tə’n,
Bilmədim ol firqədə sidqü səfa müdğəm nədür?
Xirqeyi-pəşmini-sufi, künci-üzlət, şeydü zərq,
Xaniqahü sovməə, misvak kim, xatəm nədür?
Məscidü minbər cəmaət vasili-qürb etməmiş,
Zahidi-xudbində təzvirü riya dərhəm nədür?
Xəlvəti-künci-küniştü rahibi-zünnardar,
İsəvi kiş ilə bilmən kim, şüuri-kəm nədür?
Deyrü naqusü səlibü surəti-büt, teyləsan,
Məsləki-rahi-səlisə vəhdətə münzəm nədür?
Rahi-təcridə qədəm qoymuşdürür tərsabeçə,
Nisbəti-ruhü əbü ibni-bini-Məryəm nədür?[109]
Bilməzəm dari-muğandə müğbeçə əşarini,
Rahi-azər dutduğu ol dəşt ara möhkəm nədür?
Eylə məstəm, saqiya, bilmən rəhi-meyxanəni,
Şahidi-dilkəş meyi-biğəşlə həmmü ğəm nədür?
Meykədə sirrini təhqiq etmədün, peymanəni,
Doxtəri-rizdə bu ismət, bu hamı çəm-xəm nədür?
Nayü ney, çəngü çəğanə, mütrübü sazü surud,
Rəqsü səmaü dəfü mizmarü zirü bəm nədür?
Cilvəgər qılmışdürür bu bikr ərusi bəzmi-dəhr,
Şahidi-bazardə xuddarlıq bilməm nədür?
Görgilən təzvirini bu hiyləgər məkkarənün,
Bu hamı şuhərlə bikri olmamaq, bərhəm nədür?
Salika, vər yoq şüurun, yeydürür qılmaq sükut,
Bu hamı əfsanədən hər dəm urarsan dəm, nədür?
Dərki-məsnuatdə övhamü fikr acizdürür,
Nişə mümkündür bulunməq sanei-aləm nədür?

□□□

## QƏSİDƏ Fİ MƏDHİ - VƏLİYYE KÜLL (Ə)

*(Sahibəzzəmanın tərifində qəsidə)*

Sənəma, günəş cəmalun ki, füruği-laməkandur,
Nə rəva ki, nisbət etmək ona mehri-asimandur?
Çü olubdu zati-pakin səbəbi-vücudi-aləm,
Həmegi mükəvvənatə genə rəhbəri-hesandur.
O sifati-bakəmalun ki, veribdü zeyb ərşə,
Hamı kainatə hadi səri-sərvəri-cəhandur.
Nə vücuddur yeganə ki, misali dəhrə gəlmüb
Ki, tüfeyli-kəmtərini həme kövn ilə məkandur.
İləli-vücudi-adəm, şərəfi-cəmii-aləm,
Hamı xəlq içrə əfxəm bu şəhənşəhi-zəmandur.
Səri-sərvərani-aləm ola davəri-mükərrəm,
Həsəbü nəsəblə əzəm bu şərifi-xanidandur.
Bu nə sərvdür dilara ki, qılub nişati-xatir,
Nə səza şəbih qılmaq ki, bu Tubiyi-cinandur.
Belə nəğzpeykər olmaz ola məzhəri-əvalim,
Bu cəhannümadə zahir süvəri-cəhaniyandur.
Olub andə cəm yeksər həmeyi-sifati-behtər,
Necə saf dildü məzhər ki, süvərnümayi-candur.
Nə zücaci-pürsəfadur, görünür o, saf dildə,
Süvəri-nigari-yekta məgər axərin zəmandur?
Nə sipehrdür məali, cəm edibdü mehrü mahi?
Budu rəstəxizə ayət, vəli xəlq bədgümandur.
Yetişüb kəmalə elmi ki, qüsuri-dərk qalmub,
Dəxi fəzlü daniş ilə hamı dildə tərcümandur.
Necə hüsndür dilara ki, salubdu şur dəhrə,
Dilü didədür müfəttən, bu nə şahidi-cinandur?
Nə üzari-mahvəşdür ki, qılub zəmini rövşən,
Hamı göz olubdu mail, nə əzizi-Misryandur[110].
Necə pürbəhadu tələt ki, qılubdu məhv mahi,
Bu nə zöhrəvəş cəbindür ki, füruğbəxşi-candur.
Bu nə çöhrədür, nə ariz ki, besani-bərgi-güldür
Ki, riyazi-tələt içrə gülnari-ərğəvandur.
Şəbi-qədr tək girami sənün, ey nigar, qaşın
Bu kəmani-qabi-qövseyn nə ki, qövsi-asimandur.
Ləbi-şəkkərin zühurə gətürübdü səlsəbili,
İçən ol zülali-nabi, görən ömri-cavidandur.
Bu nə dürci-pürgöhərdür, düri-şəhvarə məxzən
Ki, düzübdür əqdi-göhər, bu nə bəhrəxiz kandur?
Dutub ərseyi-cəmalun genə ol həbəş nəjadi,
Olan ərzi-Rumə qalib nə sipahi-zəngiyandur.
Genə türki-məst çeşmün nə çəküb kəmani-çaçi,
Göz edün bu şərhə, bağrım nə xədəngi-cansitandur.
Bu nə zülfi-pürşikəndür ki, düşübdü piçü tabə,
Bu cünun dilə səlasil nə kəməndi-giysuvandur.

Bu nə peykər idü nəğzin, necə qamət idü rəna?
Görən ol qədi-səhini bilü kim, nə dilsitandur.
Həmə sərbepa lətafət, hərəkati-nazənini,
Nə vəcahətü nəzakət bu, nə fitneyizəmandur?
Nə məqami-bərtərinə yetüb ol məhin xudavənd,
Bu mənasibi-əali, neşün, ol şəhə nişandur.
Nə şərafətü nəcabət, nə siyadətü nəqabət,
Nə xilafətü rəyasət, necə gör cəlilşandur.
Bu nə şəndür, nə şövkət, nə cəlaldur, nə hişmət?
Bu mələksifatə nisbət nə ətayi-bikərandur.
Nə fəsahətü bəlağət, nə kiyasətü zəkavət,
Nə fərasətü bəraət, nə şərifi-insü candur.
Nə həmidədür sifati, hədü həsrdən ziyadə,
Necə qədrdür girami ki, şəhi-Hicaziyandur.
Nə niyabətü vilayət, nə vəsayətü dərayət,
Nə şəhamətü fəxamət, nə mələksifati-candur.
Bu nə nəfsi-qüdsdür kim, həmə xəlqü xülqi-kamil,
Nə əcəb firiştəxudur ki, rəisi-qüdsiyandur.
Nə səxavətü şücaət, nə mənaətü səmahət,
Həqq edüb ona kəramət, neşun, ol şəhi-şəhandur.
Necə səltənətdür uzma ki, dutub nəfazi-əmri,
Nə ki, qütri-rüb'i-məskun, bərü bəhrə həm rəvandur.
Bu nigari-nazəninün gər ola könüldə mehri,
Nə mətin vəqayədür kim, sipəri-bəlayi-candur.
Bu gözəl sənəm sifatin nə hünərdür vəsf qılmaq,
Həmə məcməi-fəzail ola, bu gözəl cəvandur.
Necə səbti-dəftər eylər sifətini kilki-Salik,
Diyələ əgər qiyamət nə səzayi-qədrü şandur.
Dəxi dildə yoqdu yara, qıla mədh üzar vəsfin,
Tükənübdü nitqi-halət ki, süxənkəşi-zəbandur.

## QƏSİDƏ-MƏDHİYYƏ

Xosrova, məxzəni-dil ləli-ləbin kani olub,
Səbəb oldur ki, gözüm dürci-dürəfşani olub.
Key mələkmənzəri-sima, qəmərü zöhrəcəbin,
Şəkli mətbu'i sərapa həmə nurani olub.
Gün desəm tələtinə, hiç xəta etməmişəm,
Yüzünü gün görəli arizi-rəxşani olub.
Çöhrəni mahə şəbih eyləyənün ağzı sına
Ki, neşün, mahi-rüxün mehri-dirəxşani olub.
Seyrilə cirmi-qəmər gah hilalidü, məhaq,
Leyk bu bədri-münəvvər həmə tabani olub.
Əqlimi zail edüb sərvi-qədin rəftari,
Mərdümi-didə, neşün, valehü heyrani olub.
Gülşəni-tələt ara qaməti-mözuni görən,
Məhvi-rəftari-səhisərvi-xüramani olub.
Necə zibadu, nə dilkeş, qədi-rəssayi-səmən,
Hər görən didə bu rəna qədi, heyrani olub.
Canü dil fidyə ola bir belə şümşadi-qədə
Ki, cəhan səfhəsinün zeybi-gülüstani olub.
Nə dilaramdu, arami-dili yeksər alub,
Dili-rəncurə ğəza gör nə cigər qani olub.
Bu mübarək qədəmin dideyi-dil, bəhri-nisar,
Neçə yıl, qərn köçüb kim, göhərəfşani olub.
Göhəri-didəvü xunabi-cigər rahə səpüb,
Zivəri-məhfili-ali, düri-mərcani olub.
Nə səməndər ki, töküb gərdənə giysuyi-əbir,
Qeydi-məftuni-dilim türreyi-əfşani olub.
Cövri-müşkinə verüb tab, qılub həlqəkəmənd,
Seydi-xatir eləyən zülfi-pərişani olub.
Qələmi-nəsx çəküb səfheyi-xunabə xətin,
Bu nə mişkin xətdür, şiveyi-reyhani olub.
Çəküb ustadi-nəsəq riştəyə dəndani-dürün,
Dəhənün dürci-dürü göhəri-rəxşani olub.
Kişvəri-xublərə şur salub seyti-rüxün,
Biri aşiqlərinün Yusifi-Kənani olub.
Hüsni-kamil dedilər ol məhi-Kənani görən,
Bilmiyüb padşəhim kamili-insani olub.
Hüsni-Yusif ki, cahan səfhəsinün şöhrəsidür,
Budur övsafi-rüxi şahidi-Kənani olub.
Nə rəva Misr əzizinə verəm nisbətini,
Bu səna, bəs gözəlim, şahidi-rizvani olub.
Taqi-mehrabi-cəbin olalı qibleyi-dil,
Zairi-dərgəhi-ali həmə rindani olub.
Bilmənəm kim, nə qərəzdür, çəküb ol türk kəman,
Şərhə bağrım eləyən navəki-müjgani olub.
Bəs ki, dilduz xədəng ilə çıxıb rəzmgəhə,
Ərsə rəngin qılan gör ki, cigər qani olub.

Əlinə tirkeş alub, nukü sinan rast qılub,
Sinə pürtab eliyən tir ilə peykani olub.
Məsti-məstanə anun sağərü səhbasi ilə,
Didə heyran eliyən nərgisi-fəttani olub.
Səlsəbili gətürübdür ləbinə ləli-şəkər,
Şəhdbizi-ləbi-xəstə şəkəristani olub.
Gərçi məstanədü səhbayi-ləbin, xəstə diləm,
Saqiya, rənn gətür kim, ləbim ətşani olub.
Çəgəlü Çinü Xəta, Rum qoyub qol bu sözə,
Cümlə xubani-cəhanun bu gözəl xani olub.
Məsnədi-izzətə verdükdə təməkkün şəhi-türk,
Dəstgahi pozulan şövkəti-Qaani olub.
Səltənət təxtini zivər qılalı Asəfi-dəhr,
Hişməti bərhəm olan mülki-Süleymani olub[111].
Bəs ki, əklili-xilafətlə qılub zivəri-sər,
Xublər kişvərinün xosrovi-xaqani olub.
Seyti-ədli bu şəhin yeksərə afaqi dutub,
Ədli-Kəsra bu səbəb dəhrdə pünhani olub.
Bağlıyub dəsti-kərəm Hatəmi-Tai ki, neşün,
Dəhr ara xosrovi-xuban kərəmün kani olub.
Kuyi-eşqində, şəha, Saliki-sərgəştəni gör,
Rəhi-hamun dutubən Qeysi-biyabani olub.
Sirri-təhqiqi-cəmalində gər acizdü dilim,
Leyk gülzari-rüxün künd sənaxani olub.
Yoxdu yarayi-zəban xamə ki, göftarə gələ,
Neçə dəm zikr ola bu, piri-süxəndani olub.

## QƏSİDƏ Fİ MƏDHİ-ƏMİRƏLMÖMİNİN (Ə)

***(Həzrət Əli (ə)-ın mədhində qəsidə)***

Təqriri-xamə şərhi-qərəzdür bu babdən,
Surətdə nəqşi-məni bulunsun hesabdən.
Qılmışdurur məşiyyəti-xaliq vücudi kim,
Mahiyyət içrə nəqşi-büruz ehticabdən.
Rahi-fəna dutub çü zəman içrə kainat,
Yoxdur güzir qürbi-həqə kim, iyabdən.
Çün hövlnak badiyə olmuş mənazilin,
Fərz oldu ehtiraz eyləmək xeyli-xabdən.
Dutmuş kəmingəhi həmə ca rindi-nabikar,
Geçmək gərək bu bərri-həzərlə şitabdən.
Təyin olub bu rahə çü rəhdari-səxtgir,
Əldə bərat lazım olub bu turabdən.
Bəhri-bəla təməvvüc edübdür, dutub yolu,
Kəşti gərək nicat ola ta ğərqi-abdən.
Suqi-cəhanə əzm eylədüm etməgə xərid,
Nəqdi-mətai-ömrilə şəhri-turabdən.
Dürri-giranmayəni əldən ucuz verüb,
Bari-hərf gətürdüm ələ bu xərabdən.
Sud etmədüm bu beyü şəravü zəman ilə,
Oldu füzun çü möhnətim əşki-səhabdən.
Əxlaqi-nik xatirə təhsil bulmadı,
Təhzibi-nəfsi-şum ola xeyrü səvabdən.
Kəştiyyi-nəfsi ğərqə qılub bəhri-mə’siyət,
Cürmü xəta füzundur çü mövci-hübabdən.
Ləb talibi-zülal, biyaban dirazdür,
Mümkünmüdür kənar ola mövci-sərabdən?
Sərgəştəyəm, bu vadiyi-heyrətdə müztərib,
Ümmid, ənqərib çıxa rəhbər ğiyabdən.
Bəsdür bana məzəmməti-əqli-dürüstbin,
Azərm bəs ki, nəfsə yetüb iztirabdən.
Vaiz, zəbani-tə’n ilə incitmə, qıl həzər,
Salma həras qəlbə cəhimü iqabdən.
Qorxutma bən şikəstədili xovfi-nar ilə,
Yoxdur könüldə xovf o nari-əzabdən.
Xeyr əməl əgərçi yoxumdur, bu hüsni-zənn
Ruzi-cəza viqayədü qəhrü itabdən.
Hübbi-Əliyü ali-Əlidür şüari-dil,
Bu fəxr bəsdü xatirə lütfi-vəhabdən[112].
Gər həddən ziyadə olub cürm, naseha,
Azadəlük bəratı var “Ümmülkitab”dən[113].
Mənşuri-vüddi allam ələ ruzi-rəstəxiz,
Azadəyəm, yoxumdu ğəmim hiç babdən.
Gərçi-vidadi-Heydəri-Kərrarı dutmuşam,
Qəm çəkmənəm hərarəti-ruzi-hesabdən[114].
Təhti-livayi-Əhmədi-mürsəldü məskənim,

Yoxdu həras dildə təbi-afitabdən[115].
Gər məhşərə qədəm qoyasan mütməinni-dil,
Yetmiş nəbi cəzası ilə ehtisabdən.
Vər xatirində olmiyə hübbi-Əliyyü al,
Layiq bəha verülməz əməl iktisabdən[116].
Davərdü bəs ki, ruzi-cəza Şahi-"Lafəta",
Yoq dadgər siva şəhi-vala cənabdən[117].
Ruzi-hesab çarəgəri-əhli-mə'siyət,
Kimdür beğeyri-şahi-vilayətməabdən.
Şiri-xuda, vəsiyyi-nəbi, miri-"Həl əta",
Mərhəb biçən, o Xeybər açan fəthi-babdən[118].
Əmr öldürən, o taqi-hərəmdən büt endirən,
Dini-həqqi hərasət edən inqilabdən[119].
Əjdərdür, qəzənfər fər, leysi-mərəkə,
Mərdəfkənü süfufşikəni-şeyxü şabdən.
Püştü pənahi-millətı-islam, zilli-həqq,
Namusi-şər' hafizi, şərri-kilabdən.
Hamiyyi-din, nasiri-islam, rəhnüma,
Mahiyyi-şirki-ərz, nüfusi-nisabdən.
Zərratə yetdi seyheyi-"laseyfü lafəta",
Xəndəq güni pəyami-qüdslə xitabdən[120].
Yoqdur fəta cəhandə məgər namvər Əli,
Şahiddürür o zərbəti-Xəndəq bu babdən.
Bu mədhi bəs buyurdu Nəbi, zərbəti-Əli,
Əfzəldü taəti-səqəleynü səvabdən[121].
Şənində nazil ayeyi-"Bəlliğ"dür Əhmədə,
Təbliğ qıl, al əhdi-vilayət səhabdən[122].
Əhli-Ğədir tövənü kürhən qılub qəbul,
Bə'd əz rəsul münkir o qövmi-ğürabdən[123].
Məzmuni-"Innəma"ni sanub səhl o küfrkiş,
Sərdəftəri-zəlali-şəqavət nisabdən[124].
İnkar edübdü beyəti-fəzli inad ilə,
Etmüb həras duzəxi-pürtabi-tabdən.
Hər xatirə ki, zərreyi-büğzi-Əli yetə,
Azər yolun açub yüzə, hər yetdi babdən.
Hər kəs ki, məsti-badeyi-mehri-Əlidürür,
Sərgərm olur cinandə o, biğəş şərabdən.
Peymaneyi-məvəddət o şahiddən içmiyən,
Ru sürx həşrə baş götürərmi hicabdən?
Sərməsti-cami-saqiyi-meyxanə olmiyən,
Olmaz ki, cürənuş ola səhbayi-nabdən.
Ricət günündə yüz saralur bəs, olur xəcil,
Müşküldü fariğ olmağı səxt əzabdən.
Qıl etisam "Həbli-mətin"ə bu neş'ə sən,
Ol neş'ə faruğ et könülü piçü tabdən[125].
Məzmunun anla "Ləhmukə ləhmi" hədisinün,
Qürbi-rəsuli bil bu müsəddiq cəvabdən[126].
Təşxis qıl xilafəti-həqlə vəsayəti,
Fariği-dil et o cümlə müanid səhabdən.

“Nəssi-sərih”i-“əntə və minn”i-peyəmbəri
Təfhim qıl, xilasi-dil et irtiyabdən[127].
Gər bilməsən vəsiyyi-bilafəsli-Heydəri,
Xatir cəm etmə madəri biictinabdən[128].
İnkar qılma fəzli-Əli bihesabdur,
Əfzundu həddən, çü geçübdür hesabdən.
Bu əhli-beytə eylə təvəlli xülus ilə,
Dil fariğ et bəraətlə iztirabdən.
Gər cayizə əta ola hər beytə əlf beyt,
Şad olmam ol süradiqi-gərdun qibabdən.
Salik qulami-həlqəbequşi-ələstdür,
Bu fəxr bəs ki, çakərəm əhli-rikabdən.

## MÖVLAMIZ SAHİBƏZZƏMANIN ( Kİ, ALLAH ONUN ZÜHURUNU YAXIN ELƏSİN) MƏDHİNDƏ QƏSİDƏ

Ərseyi-dəhrə genə xosrovi-xuban gələcək,
Bəhri-təsxiri-məmalik, şəhi-şahan gələcək.
Pişrovdur o şəhə ləşkəri-fəth ilə zəfər,
Cündi-ğeybi, neşün, ol şahə nümayan gələcək.
Bəs ki, təyidi-əzəl qurşuyub ol şəh kəmərin,
Bəxti-firuz ilə şahənşəhi-imkan gələcək.
Tərəfi-meymənədə ceyşi-Sekəndər yeriyür,
Meysərə canibə Dara ilə Sasan gələcək[129].
Qılub arastə fəğfur tipü dəstələrin,
Bəs ki, orduyi-humayun ilə xaqan gələcək.
Rayəti-nüsrət əlində gəlüri Giv ilə Tus,
Ərseyi-rəzmə, neşün, Rüstəmi-dəstan gələcək[130].
Sistanə çü olub azim Turan–şəhi-türk,
Canibi-rəzmgəhə Zali-Nəriman gələcək[131].
Dəstbürd urmuşdu səfheyi-İranə çü Rum,
İntiqam almaqə ol Nadiri-dövran gələcək[132].
Nəbəvi şər’ səfahatını dutmuşdi yəvmut,
Bəhri-tədib, müəyyəd olan oğlan gələcək[133].
Cövri-əşrar ilə viranə idi xitteyi-fars,
Əzmi-təmirlə ol şəhrə Kərim xan gələcək[134].
Şövqi-İstəxr başə salmışdı çün şəhi-türk,
Bu səbəb qətlinə Keyxosrovi-sultan gələcək[135].
İddiayi-qələt etmişdi çü Şəddadi-şəqi,
Pozməgə dəstgəhin qüdrəti-Yəzdan gələcək[136].
Əzm edibdür genə Nəmrud Xəlil atəşinə,
Bilmiyübdür o şəhə nar gülüstan gələcək[137].
Bəs ki, Firon ilə Haman olub tağiyi-din,
Qərqi-Nil eyləməgə Musiyi-İmran gələcək[138].
Rübi-məskuni müsəxxər çü qılub küfri-sipəh,
Ol firəq qətlinə puri-Şəhi-Mərdan gələcək[139].
Həft iqlimi çü zəbt etmiş idi ceyşi-inad,
Əzmi-təsxir ilə Salari-əmiran gələcək[140].
Şər’ namusinə əl urmuş idi dəsti-xilaf,
O xətakarə muəddib yədi-Mənnan gələcək[141].
Sitəmi-cövri-həsud ilə gülüstani-miləl,
Bəs ki, solmuşdu, səfa verməgə bağban gələcək.
Kişi-islam görülmürdü dəxi millət ara,
Din tərvici içün natiqi-Quran gələcək[142].
Tərki-məslək çü olub şivəsi birahlərin,
Tariki-məzhəbi-həqq qətlinə fərman gələcək.
Bey’ət eylüb o şəhə Ruhi-Qüdüs, cümlə səma,
Cəm olub başə məlaik, hamı yeksan gələcək[143].
Əhrimən burnu gərək sürtülə toprağə bu gün,
Div təsxirinə Asəflə Süleyman gələcək[144].

Yer yüzündən əsəri-küfrü təbah eyləməgə,
Dəsti-qüdrət genə bu ərsəyə bürhan gələcək.
Sipəhi-kin dutubdur hamı afaq yüzün,
Cündi-əşrarə bu gün Nuh ilə tufan gələcək[145].
Kişvəri-dəhri ələ bəs ki, alub ceyşi-zəlal,
Məmləkət açmaqə ol xosrovi-zişan gələcək.
Yusifi-Misri salub sicnə çü zənn ilə Əziz,
Səltənət təxtinə bilmüb Məhi-Kən’an gələcək[146].
Ələ ayineyi-İsgəndər alub, zeyb qılub,
Zivəri-qamət ilə sərvi-xuraman gələcək[147].
Cami-Cəmşidi dutubdur genə ol saqiyi-dəhr[148],
Məhfili-eyşə neçə badeyi-məstan gələcək.
Şuri-Şirini salub başinə Fərhadsifət,
Bisütun tağinə kim, daş çapan oğlan gələcək[149].
Pərdədən tişrə çıxubdur genə ol şahidi-ğeyb,
Bəhcəti-xatir içün xürrəmü xəndan gələcək.
Salika, sidq ilə dut ol şəhi-vala rəhini,
Məsnədi-canı sal ol rahə ki, canan gələcək.

□□□

## DÖRDLÜKLƏR

Atəşi-həsrəti-ruyin dili-əfgarə düşüb,
Ol zəman kim, nəzərim ol məhi-rüxsarə düşüb.
Görgəc ol mahliqanı nəzər etdüm qəmərə,
Gui şəqqülqəmər olmuş, yerə məhparə düşüb.

□□□

Dideyi-xur, sənəma, hüsnünə nəzzarə düşüb,
Çü giriftari-rəhi-eşqdür, avarə düşüb.
Şövqi-didar ilə heyran dolanub bir neçə qərn,
Cüstücusilə yüzün hər dərü divarə düşüb.

□□□

Müsəvvir, yar təsvirin çəkərsən, çəkmə sən nazin,
Məhəlli-qəmzü nazində xəbər ver, mən çəküm nazin.
Müradi-hali-aşiqdir, çəkər nazini məşuqin,
Neşün biganələr çəksün nigari-nazənin nazin?

Əhd etmişdim gələ yar,
Canü dil qılam nisar.
Can ki, çığməz bədəndən,
Bilmən nə həsrəti var?

□□□

Aşiqəm gül rüxsarə,
Salma bürqə üzarə.
Hicrin məni öldürər,
Qilmasan dərdə çarə.

□□□

Peyğamım yetir yarə,
Bir çıxsın rəhgüzarə.
Niqabın yüzdən atsın,
Rəhm etsün dili-zarə.

□□□

Bəzmimə canan gəlür,
Oduma yanan gəlür.
Şərarə qəlbə tökən,
Canə od salan gəlür.

□□□

Dil hicrində qərhədür,
Bəs ki, cigər cərhədür.
Atma müjə peykanın,
Sinəm şərhə-şərhədür.

□□□

Cismü can sənə fəda,
Ey məhvəşi-qəmzüda.
Sanma məni biganə,
Can degül səndən cüda.

□□□

Ey sərvqəd, novnihal,
Başım üstə sayə sal.
Hicrin odunu söndür,
Tabi-dili dildən al.

□□□

Fidyəsidür dilü can,
Gər qəbul edə canan.
Çəkərəm rəhgüzarə,
Kəsərəm canı qurban.

□□□

Niqabı yüzə salma,
Çəkmə cəbinə çalma.
Taqəti-dil qalmıyub,
İxtiyarımı alma.

□□□

Mehman yoluna qurban,
Fidyəsidür dilü can.
Könül quşu pabəsti,
Gözüm yüzünə heyran.

□□□

Salik, bəsi zəmandur,
Gözlərim didəbandur.
Şəhənşəhim gər gələ,
Qurbanı dilü candur.

□□□

Yadə qıl dili-zari,
Yetür ləbə ənari.
Kəsmiş idim ümidi,
Görmənəm yar kənari.

□□□

Xatirə düşüb həras,
Canü dil dutubdur yas.
Gələ yar, almiyə can,
Dəxi qılmənəm sipas.

□□□

Soldu çün güli-suri,
Getdi könül süruri.
Gülbərgi-yüz həsrəti
Tükətdi gözüm nuri.

□□□

Eşqinə giriftarəm,
Yoxdur bu dərdə çarəm.
Təmənnayi-vəsl ilə
Hicr oduna yanərəm.

□□□

Ey qaşı qövsi-kəman,
Şəsti-zehə mən qurban.
Sinəmi qoy nişanə,
At xədəngi, ur sinan.

□□□

Aşiqəm mahi-ruyə,
O zülfi-mişkbuyə.

Neşün bağlıdı könlüm?
Təsəlsüli-giysuyə?

□□□

Göz qaməti-rənayə
Heyran, qəddi-rəsayə.
Tabi-dildən alışdım,
Bir də başə sal sayə.

□□□

Ey məhvəşi-bibədəl,
Taqətim aldun əzəl.
Aparmə dil aramın,
Getmə, qayıt, bir də gəl.

□□□

İtirdim sona başi,
Tökülür gözüm yaşi.
Qəzali-vəhşi kimi,
Gəzərəm taqü taşi.

□□□

Göz heyrandur nigarə,
Məhvəşi-gülüzarə.
Kəsmə pərvanə yolun,
Dövri-şəmi-ruxsarə.

□□□

Ürəkdə yaram çoqdur,
Bu dərdə dəva yoqdur.
Hicrün salub əyağdən,
Dəxi taqətim yoqdur.

□□□

Hicr odu düşüb canə,
Şərər yetüb zəbanə.
Cismim yanə, kül ola,
Qor yetmiyə cananə.

□□□

Sölə səmən üzarə,
Qıldun dili səd parə.
Nəzərdən dəxi salma,
Bir də çıq rəhgüzarə.

□□□

Eşqində çaram yoqdur,
Qəlbdə aram yoqdur.
Atma müjə peykanın,

Sinəmdə yaram çoqdur.

□□□

Gərçi yetüb qəlbə qəm,
Möhnətini qılma kəm.
Baş qovğalu gərəkdür,
Yar yolunda neçə dəm.

□□□

İtirmişəm cananı,
Cismimdə olan canı.
Yaralu ahu kimi,
Gəzərəm biyabanı.

□□□

Türrədəki dami gör,
Mürği-dili-xami gör.
Dövri-ləbdəki xalə
Məftuni-bədnami gör.

□□□

Hicr atəşi aluşdi,
Şərarə qəlbə düşdi.
Pürtab edüb xatiri,
Cismü canə yetüşdi.

□□□

Yetmədim gülüzarə,
Həsrət gülü gülzarə.
Gülündən ayru düşən
Bülbüləm, bəxti qarə.

□□□

Qapundə gədayə bax,
Bir əhdi-vəfayə bax.
Tərəhhüm et, lütfə gəl,
Mən bəxti-qərayə bax.

□□□

Ey məhrüxü gül buxaq,
Göz cəmalinə müştaq.
Səbrimi alub hicrün,
Taqətim eyləyüb taq.

□□□

Aşiqəm gül yüzünə,
Səmən sünbül yüzünə.
Salma türrə ənbəri,
Bürqə o gül yüzünə.

□□□

Şüarim novhəvü nal,
Qəlbi-qəmin, dil məlal.
Gülşənindən ayrılmış
Bülbüləm, əfsürdə hal.

□□□

Söylə qəmim nigarə,
Bir də de gülüzarə.
Canə çün şərər saldun,
Rəhm et bir dili-zarə.

□□□

Eşq odu canə düşdü,
Şərər qəlbə yetüşdü.
Cism yandı, kül oldu,
Şərarə başə düşdü.

□□□

Deyün o gülüzarə,
Rəhm etsün intizarə.
Salikiyəm bu yolun,
Yetürə şəhriyarə.

□□□

Yüzü gül, ləbi püstə,
Salma məni yüz üstə.
Kuyin saru sürünnəm,
Neçə ildür diz üstə.

## QEYD VƏ ŞƏRHLƏR

1.

Şöhrəti-hüsnün cahan bazarını pürşur edüb,
Hər görən aşiqdürür çün Yusifi-Kə'nan sana.

Yusifi-Kən'an – «Yusif və Züleyxa» dastanının qəhrəmanı Yusifə işarədir. Bu dastanda Misir hökmdarının arvadı Züleyxa Yusifin gözəlliyinə aşiq olmuş, lakin Yusif onun eşqinə biganə qaldığı üçün Züleyxa bu eşqin təsirindən həmişə ah-fəğan etmişdir. Yusifin gözəlliyi isə hər yerə yayılmışdır. Şair bu beytdə məşuqənin hüsnünün gözəlliyini Yusifin gözəlliyinə bənzətmişdir.

2.

Təjəlli eyləyən saət yüzün nuri, şəhənşahim,
Hamı mərdüm olur mail, gəlür imanə hər tərsa.

Bu beytdə şair ilahi gözəli – Allahı və onun mövcudatda hər şeydə təjəlli edən nurunu nəzərdə tutur. Şairin tərənnüm etdiyi sevgilisi ilahi gözəldir, yəni təsəvvüf qəhrəmanıdır. Təsəvvüf fəlsəfəsinə görə Allah «kün» (ol) əmri ilə bütün mövcudatı, canlı və cansızlar aləmini ilahi nurun zərrəsindən yaratmış və onun nuru hər şeydə təjəlli etmişdir. Şair bütün insanların ilahi nura mail olduğunu bildirmişdir.

3.

Bu dəlvi-xovfdə ki, xətərdür kənarəsi,
Xızri dəlil qıl ki, ola rəhnüma bana.

Bu beytdə Şərq folkloru və yazılı ədəbiyyatında verilən və at üstündə yaşıl geyimdə peyda olub qəhrəmanları dardan və ölümdən qurtaran, onlara yol göstərən Xızır peyğəmbərə işarə olunur. Şair bu beytdə dünyanı kənarları təhlükəli olan Dəlv (Dolça) bürcünə bənzədir və məşuqəyə deyir ki, bu dünyada xətərdən qurtarmaq üçün ona Xızır kimi yol göstərsin.

4.

Sübhgəh Zöhreyi-çəngi çü görüb arizini,
Xatiri rəqsə gəlib, gör nə əcəb karə düşüb.

Bu beytdə işlənən Zöhrə (Nahid – Venera) klassik Şərq astrologiyasında məhəbbət ilahəsi və ya səadət, xoşbəxtlik ulduzu kimi verilir. Şair məşuqəyə demək istəyir ki, səhər vaxtı sənin jəmalını görən səadət ulduzu bu gözəllik qarşısında əcəb işə düşüb.

5.

Səfheyi-jərxə yazıb vəsfini küttabi-qədər,
Oldürür kilki-Ütarid xəti-zəngarə düşüb.

Bu beytdə işlənən Ütarid günəşə çox yaxın olan ulduzun adıdır. Mifoloci təsəvvürə görə o, səmada katiblik işlərini ijra edir. Şair təsvir etdiyi gözələ deyir ki, Ütarid ulduzu (katib) sənin vəsfini çərxin səhifəsinə yazdığı üçün qələmi zəngar xəttinə düşüb.

6.

Kişvəri-hüsnünü fəth etməgə Bəhrami-səma,
Tiği-zərrin ilə gör kim, nə zəfərkarə düşüb.

Beytdə işlənən Bəhram klassik Şərq astrologiyasında Mərrix (Mars) ulduzunun adıdır. Mifoloci təsəvvürə görə müharibə allahıdır. Şair məşuqəyə demək istəyir ki, sən o qədər gözəlsən ki, hüsnünün (gözəlliyinin) qoşununu fəth etmək üçün müharibə Tanrısı olan Bəhram zərrin qılınjı ilə zəfərə başlayıb.

7.

Peykərin nəqşini Bərcus çəkib lövhi-dilə,

Əksi-rüxsarinə gör kim, Necə nəzzarə düşüb.

Bu beytdə işlənən Bərcus Şərq astrologiyasında Yupiter planetinin adıdır. Şair təsvir etdiyi gözələ deyir ki, sənin əndamının nəqşini mənim könlümün lövhəsinə Bərcus Necə çəkib ki, hamı ona və jəmalının əksinə tamaşa edir.

8.

Tanrı içün bu füsürdə cusmimə qıl iltifat,
Sən Məsihi-vəqtsən, ver ləblərindən bir həyat.

Beytdə işlənən Məsihi xristianların etiqad etdikləri İsa peyğəmbərdir. Dini rəvayətə görə İsa bir çox möcüzələr göstərib insanlara və quşlara həyat verərmiş. Şair təsvir etdiyi gözələ demək istəyir ki, sən zəmanənin İsasısan, iltifat göstərib mənə ləblərindən həyat ver.

9.

Aşiqin imanə gəlməz dərki-məşuq etməsə,
Gər ola məb'us Musa, göstərə yüz möcüzat,

Beytdə işlənən Musa dini tarixdə Musa peyğəmbərin adıdır. Dini rəvayətə görə Musa peyğəmbərin bir çox möcüzələri olmuşdur. Onun əlindəki əsası (ağacı) əcdahaya çevrilərək düşmənlərini udarmış. İnsanlar möcüzələrinə görə Musaya inanarmışlar. Şair təsvir etdiyi gözələ demək istəyir ki, Musa nə qədər möcüzələr göstərsə də, sənin aşiqin məşuq dərkini etməyincə imana gəlməz.

10.

Xəstə xatirlərə şərbət cü olub safi-zülal,
Axtarar abi-Xızır şərmilə rahi-zülümat.

Bu beytdə Xızırın zülmətdə dirilik suyunu axtarmasına işarə olunmuşdur. Dini rəvayətə görə Xızır İsgəndəri-Zülqərneyn ilə birlikdə dirilik suyu axtarmaq üçün zülmət səltənətinə getmiş, lakin dirilik suyunu İsgəndər yox, Xızır tapıb içmiş və əbədi ölməzlik qazanmışdır. Şair aşiqin məşuqəyə qovuşmasını xəstənin şərbətə, Xızırın dirilik suyuna qovuşmasına bənzətmişdir.

11.

Ənbərin türrələrün seydi-Xütən nafəsidir,
Nə səza gər eliyə sünbülü reyhan ilə bəhs.

Şair bu beytdə gözəlin saçlarının ətrini Xütəndə hazırlanmış ətrə bənzətmişdir. Keçmişdə gözəllər «müşki-ənbər» deyilən bir ətirdən istifadə edərmişlər. Xütəndə (Şərqi Türküstanda) xüsusi cuns ahular olurdu ki, bu ahuların göbəyinin vəzindən müşk – «müşki-ənbər» hazırlanırdı. Şair gözələ deyir ki, sənin müşki-ənbər qoxusu verən saçlarının müqabilində sünbül və reyhan qoxusu heç nədir.

12.

Mədəni-aləm əgər lə'li-Yəməndən ura dəm,
Ola bilməz eləsin lə'li-Bədəxşan ilə bəhs.

Bu beytdə Yəmən və Bədəxşan məmləkətlərinin qiymətliləlinə işarə olunur.

13.

Çahi-Kə’nan əgər müftəxiri-Yusif ola,
Necə mümkündü qıla çahi-zənəxdan ilə bəhs?

Beytdə işlənən çahi-Kənan ifadəsi Kənanın quyusu deməkdir, tarixdə məşhur olan «Yusif və Züleyxa» dastanının qəhrəmanı Yusifin quyuya salınmasına işarədir. Bu dastanda təsvir olunur ki, Yaqub peyğəmbər öz oğlanlarının içərisində ən çox gözəllikdə misli-bərabəri olmayan kiçik oğlu Yusifi sevərmiş. Odur ki, buna paxıllıq edən qardaşları Yusifi quyuya salıb atası Yaquba onun ölüm xəbərini gətirirlər. Yaqub isə oğlunun həsrətindən o qədər ağlayır ki, gözləri tutulur. Səhradan keçən tijarət karvanı quyudan su içərkən Yusifi tapır və özü ilə Misirə aparıb, onu Misir bazarında qul kimi satırlar. Misir hökmdarının arvadı

Züleyxa bazarda Yusifin gözəlliyinə aşiq olub onu alır. Lakin Yusif Züleyxanın eşqini rədd etdiyi üçün Züleyxa əl atıb öz köynəyini jırır və Yusifi ona xəyanətdə təqsirləndirib zindana saldırır. Dastanın sonunda Züleyxa Allahın hökmü ilə javanlaşdırılır və hər ikisi bir-birinə qovuşurlar, Yusif Misirdə taxta çıxıb hökmdar olur. Salik bu beytdə Yusifin Kənan məmləkətində öz qardaşları tərəfindən quyuya salınmasına işarə edərək deyir ki, Yusif özünün Kənanda salındığı quyu ilə lovğalanıb öyünməsin, çünki onun salındığı quyu gözəlin çahi-zənəxdanının (gözəlin gülərkən çənəsində və ya yanağında olan batıq) müqabilində heç nədir.

14.
Nə ziba hüsndür sün'i salub afaqə nik şöhrət,
Gülüstani-İrəm görmüb pəripeykər, şəmail qəd.

Bu beytdə verilən «Gülüstani-İrəm» behişt, cənnəti bağı mənasındadır. Şərq əsatirində Yəməndə olduğu rəvayət edilən əfsanəvi bağ kimi də işlədilir. Şair təsvir etdiyi gözəlin hüsnünü və qamətini cənnəti bağının pərilərinə bənzətmişdir.

15.
Həbəşi zülfünü gör, Rumə şəbxun gətürüb,
Tiği -xunrizi ilə navəki-pürtabinə bax.

Bu beytdə şair gözəlin qara saçlarını gejə vaxtı Rum (Türk) məmləkətinə, yəni ağ üzə basqın edən zəncuyə, həbəşə bənzətməklə təşbeh yaratmışdır. Çünki klassik poeziyada türk ifadəsi igid, cəngavər, həmçinin ağlıq və gözəllik mənalarında da işlədilir.

16.
Zəhi jəvahiri-ehsani-Xajətaş səid.

Bu misrada işlənən Xajətaş Səid sufi təriqətinin başçılarından olmuşdur. Salik şeirdə bu təriqət başçısının yolu ilə getməyi təbliğ etmişdir.

17.
Bəs əqanimi-səlasə oldu rəhbər vəhdətə,
Dərk qılməm Ruhü İbnü Əb nədür, İsa nədür?

Əqanimi-səlasə – Xristian dinində üçlüyü, yəni Atanı, Oğulu və Ruhu ifadə edir. Beytdə işlənən Ruh – Ruhül-qüdüs (müqəddəs ruh), İbn – Oğul (həzrəti-İsa), Əb – Ata (Allah) deməkdir. Xristian dinində Ruhül-qüdüs Məryəmə puflənmiş və Məryəm bakirə halda hamilə olmuş, həzrəti-İsa doğulmuşdur. İslam dinində Ruhül-qudüs baş mələk Jəbrayıldır. Şair beytdə bu anlayışları ifadə etmişdir.

18.
O şəhin vəsfi-kəmalində olub künd dilim,
«Qəlbi-Qur'an»də bəs ki, sifəti zikr olunur.

Şair bu beytdə «Qəlbi-Qur'an» (Qur'anın qəlbi, ürəyi) ifadəsi ilə Qur'anın «Yasin» surəsini nəzərdə tutmuş və demək istəmişdir ki, Allahın sifəti «Yasin» surəsində zikr olunub.

19.
Fürugi-mahi-üzarun dutubdur afaqi,
O mahi-mənzərə nuri-rüxi-Süha derlər.

Beytdə işlənən Süha göyün şimal tərəfində səhərə yaxın görünən işıqlı kiçik ulduz adıdır. Şair gözələ deyir ki, ay jəmalının işığı parlaq Süha ulduzunun işığı kimi bütün afaqı nura boyayıb.

20.
Yüzün məlahət ilə kişvəri-jəhani dutub,
Ziyabəxşdü bəs, nuri-«Vəzzüha» derlər.

«Vəzzüha» – «Qur'anda «Nəşşəms vəz züha» ilə başlayan bir surənin adından götürülmüşdür. Mənası çeşt vaxtına (səhərlə günorta arasındakı vaxta) and olsun deməkdir. Şair gözəlin üzünün məlahətini Qur'an surəsində verilən səhərlə günortanın nuruna bənzətmişdir.

21.

Piri-məhzunə deyün Yusifi-Kən'an gəlür,
Valiyi-Misri-məlahət, şəhi-xuban gəlür.

Bu beytdə «Yusif və Züleyxa» dastanının qəhrəmanları olan Yaqub peyğəmbər və onun oğlu Yusif nəzərdə tutulur. Şair gözəlin məclisə gəlişini Züleyxaya qovuşub Misirdə hökmdar olan kənanlı Yusifin Kənana öz atası Yaqubun yanına gəlməsinə bənzətmişdir. Bax: 13.

22.

Rəhi-Kən'anə müsəmməmdü məgər əzmi-bəşir,
Rövşənayi-gözə kim, pirəhəni-can gəlür.

Bax: 13. Şair Yusifin köynəyinin Yəquba gətirilməsinə işarə etmişdir. Yusifin köynəyini iyləyən Yəqub oğlunun sağ olduğunu bilmiş və gözləri açılmışdır. Şair bu əhvalata işarə edir.

23.

Şükrlillah, Qəmər Əqrəbdən tişrə çıxub,
Bədri-ənvər kimi ol arizi-taban gəlür.

Bu beytdə şair poetik mənanı qüvvətləndirmək üçün Qəmər (Ay) və Əqrəb (bürj) ifadələrini astronomik təsəvvürlə bağlayaraq məjazi məna yaratmışdır. Qədim Şərq mifologiyasında Ayın Əqrəb bürcündə olması nəsə bir fəlakət və ya bədbəxtlik baş verəjəyi kimi təsəvvür edilmişdir. Odur ki, Ay Əqrəb bürcündə olan vaxt Şərqdə heç kim səfərə çıxmazmış. Şair sevdiyi gözəli Qəmərə (Aya) bənzətməklə demək istəyir ki, Qəmərin Əqrəb bürcündə olması aşiqə fəlakət, bədbəxtlik gətirər. Allaha çox şükür ki, Qəmər (gözəl) Əqrəbdən tez çıxıb, yəni aşiqə fəlakət gətirməkdən uzaqlaşıb. Şair təsvir etdiyi gözəli Əqrəb bürcündən tez çıxan bədirlənmiş işıqlı Aya bənzətməklə qüvvətli təşbeh yaratmışdır.

24.

Lə'li-Yəmani jəm qılub qəhfi-laləyə

Ləli-Yəmani – Yəmən məmləkətinin qiymətli lə'li deməkdir.

Qəhfi-lalə – Rəmzi mənada sufi dərvişlərin gəzdirdikləri kəşkülə işarədir. Şair «Lə'li-Yəmani jəm qılub qəhfi-laləyə» ifadəsi ilə demək istəyir ki, süfi şairlərin qiymətli sözü müqabilində onun kəşkülünə də qiymətli ləl salarlar.

25.

Nəsim verdi məşamə nəvidi-nafeyi-Çin,
Çü qıldı seydi-Xütən suyi-bustanə güzər.

Beytdə işlənən nafeyi-Çin və Xütən ifadələri qədim Şərqdə işlənən «müşki-ənbər» ətrinə işarədir. Çin və Xütən Şərqi Türküstan ölkəsi deməkdir. Burada xüsusi cunsdən olan ahular yaşayır ki, onların göbəyindəki vəzlərdən insanı valeh edən qiymətli müşk (ətir) hazırlanır. Şair gözəlin gülşənə gəlişini Xütən ahusuna, onun ətrini isə ahunun göbəyinin vəzindən hazırlanan müşkə bənzətmişdir.

26.

Fidyeyi-canü dili cümlə çəkün rəhgüzərə
Ki neşün ol şəhi-Jəmjahi-jəhandar gəlür.

Beytdə işlənən Jəm ifadəsi İranın əfsanəvi padşahlarından olan Cəmşid padşahın adıdır. Jəmjah isə Cəmşid kimi ehtişamlı, əzəmətli deməkdir.

27.

Şər'i namusini zəbt etmiş idi əhli-inad,
Varisi-Əhmədi-Muxtar, tələbkar gəlür.

Əhmədi-Muxtar – Məhəmməd (s) peyğəmbərin ləqəblərindəndir. Şair İmam Mehdi Axirəzzəmanı Məhəmməd (s) peyğəmbərin varisi adlandırmışdır.

28.
Rüb'i-məskuni müsəxxər eyləmək əzmi ilə,
Naibi-Heydəri-Kərrar, mədədkar gəlür.

Heydəri-Kərrar – Həzrət Əlinin (ə) ləqəblərindəndir. Heydər ifadəsi şir, kərrar isə çox həmlə edən, güclü həmlə edən deməkdir.

29.
Daməni-dəştə çəküb xərgəhi-Daranı, neşün,
Bəhr təsxirinə ləşkər yəli-Nöman gətürər.

Dara – Tarixdə yaşamış İran padşahıdır.
Nöman – Qədim Hiyrə (Yəmən) padşahıdır.

30.
Qədəm bu rahə çün urdum, bəsi sərgəştələr gördüm
Ki, Fərhad ilə Şirin nəqşini kuhsarə yazmişlər.

Fərhad, Şirin – «Fərhad və Şirin» dastanının qəhrəmanlarıdır.

31.
Müsəvvir surəti-Əzra dili-Vamiqdə nəqş etmiş,
Həmi Yusif-Züleyxa surətin məhparə yazmişlər.

Vamiq, Əzra – Şərq ədəbiyyatında məşhur olan «Vamiq və Əzra» adlı klassik aşiqanə məhəbbət dastanının qəhrəmanlarıdır. Şərq folklorunda geniş yayılmış bu mövzu sonradan bir sıra sənətkarlar tərəfindən qələmə alınmış, X əsrdə Sultan Mahmud Qəznəvinin saray şairi Ünsiri eyni adlı poema yazmışdır. Beytdə işlənən Yusif, Züleyxa isə «Yusif və Züleyxa» dastanının qəhrəmanlarıdır.

32.
Simi-ğəbğəb, zənəxi-sib, şəfabəxş ləban,
Xəstə dil təqviyəti, şərbəti-dinar gəlür.

Şərbəti-dinar–Xəstə üçün hazırlanmış bitki şərbətidir. Ərəbjə bu şərbətə həşişətüddinar da deyilir.

33.
Aldı arami-dili nafeyi-ahuyi-Xütən,
Müşkbiz etdi məşami çü şəmmi-seydi-tətar.

Ahuyi-Xütən – Xütən ahusu deməkdir. Bax: 25.

34.
Günəş rüxsarinə üşşaq ruyin «Vəzzüha» derlər,
Nə rənadur qədi-mövzun ki, sərvi-dilrüba derlər.

«Vəzzüha». Bax: 20.

35.
Ya şimal ənbəri-saradan alub müşki-Xütən,
Ətri-nafə dili-canə nə firavan gətürər.

Müşki-Xütən – Bax: 25.
36.
Tiği-əbruni çəkub Rüstəmi-Dəstansifət,
Xuni-dil tökmək üçün ərseyi-Sistanə gedər.

Rüstəmi-Dəstan – Firdovsinin «Şahnamə» əsərinin qəhrəmanıdır. Dəstan ifadəsi hiyləgər deməkdir. Zal hiyləgər olduğu üçün Dəstan ləqəbi verilmişdir. Rüstəmi-Dəstansifət – Zalın oğlu mənasındadır.

Sistan–Rüstəm pəhləvanın anadan olduğu və hökmranlıq etdiyi yerdir.

Bu beytdə şair gözəlin qaşını Sistan meydanında qan tökməyə gedən Rüstəm pəhləvanın qılınjına bənzətmiş və bunu aşiqın qanını tökmək kimi mənalandıraraq qüvvətli təşbeh yaratmışdır.

37.
Əncümən saz qılun, zivəri-dərgah eyləyün,
Ki neşün, əncümənə sərvəri-Jəmjah gəlür.
Jəmjah – Bax: 26.
38.
Həbəşü Rum, Qumuq, Rusü, Xəta, Çinü, Firəng
Tabeyi-hökmdü, çün nüsrəti-Allah gəlür.

Həbəş – Afrika, Rum – Osmanlı (Anadolu), Qumuq – Dağıstanda yaşayan Kumık türkləri, Xəta – Türküstan, Çin və Turan arasında yerləşən şəhər, Çin – indiki Çin məmləkəti, Firəng – Fransa və ya ümumən Avropa deməkdir.

39.
Xatiri-əhli-miləl röbü həras ilə dolub,
Neşün, ardınja o şahın Əsədullah gəlür.

Əsədullah – Allahın şiri deməkdir. Həzrət Əli (ə)-ın ləqəbidir.
40.
Təkyeyi-nüsrət edüb kövkəbeyi-həşmət ilə,
Tiği-atəşdəm ilə dəsti-Yədullah gəlür.

Yədullah – Allahın əli deməkdir. Həmçinin həzrət Əli (ə)-ın ləqəblərindəndir.
41.
Firdovsi-sidrə, sayeyi-Tuba sənə nəsib,
Ruzi bəna o sayeyi-qüdsiyü mukəmər.

Sidr(ə)–Dini təsəvvürə görə behiştdə və ya ərşin sağ tərəfində olan ağacdır.
Tuba – Jənnətdə bitən uja qamətli, yaraşıqlı ağajdır. Klassik poeziyada gözəlin qaməti bu iki ağaja bənzədilir.
42.
Axan Təsnimü Kövsərdür dəmindən lə'li-meygunin,
Həyatbəxşi-ləbi-təşnə zülali- lə'li-şəkkərdür.

Təsnim və Kövsər – Jənnətdə olan iki bulağın adlarıdır. Şair gözəlin ləblərinin zülalını cənnətidəki bulaqların müqəddəs suyuna bənzətmişdir.

43.
Nigahbandur cü aşiqlər damocnuyi-vüsalində,
Mətai-kişvəri-hüsnün yaşursən, andə şişləllər.

Şair bu beytdə çox qüvvətli təşbeh yaradaraq aşiqləri gözəlin vüsalının tamocnasının (gömrükünün) gözətçisinə, gözəlin bütün gözəlliklərini isə gömrükdən keçirilən mallara bənzətmişdir. Şair gözələ demək istəyir ki, bütün aşiqlər sənin

vüsalının gömründə gözətçi dayanmışlar. Əgər hüsnündəki gözəllik mallarını gizlətsən, nigahbanlar (aşiqlər) şişləyib onu tapajaqlar. Bu bənzətmə XIX əsr Azərbaycan poeziyasında ilk dəfə rast gəlinən mükəmməl poetik mənalandırmadır.

44.

Yusifi-Kən’an kimi mehri-jəmalın aləmə
Qülqülə salmış əzəl kim, tələti-mahin hənuz.

Yusifi-Kənan – «Yusif və Züleyxa» dastanının qəhrəmanı Kənanlı Yusif nəzərdə tutulur. Şair təsvir etdiyi məşuqənin gözəlliyini Yusifin gözəlliyinə bənzətmişdir.

45.

Yüz Züleyxanı qılub məftun iki şəhla gözün,
Məstü mədhuş eyləyübdür lə'li-dilxunin hənuz.

Züleyxa – «Yusif və Züleyxa» dastanının qəhrəmanıdır. Şair gözələ xitabən deyir ki, sən o qədər gözəlsən ki, iki şəhla gözün yüz Züleyxanı belə məftun etmişdir.

46.

Zövqbəxşi-kami-dil olduqda lə'li-ləblərün,
Oldürür bais, könül lə'li-Bədəxşan istəməz.

Lə'li-Bədəxşan – Bədəxşanın (İndiki Əfqanıstanda) qiymətli ləli deməkdir. Şair təsvir etdiyi gözələ deyir ki, sənin qiymətli ləblərin müqabilində aşiq Bədəxşanın ləlini istəməz.

47.

Hüsnün əsəri arizi-Şirinə yetişdi,
Lə'l eylədi Fərhad ürəgin qandə mütləq.

Şirin, Fərhad – Klassik «Fərhad və Şirin» adlı məhəbbət dastanının qəhrəmanlarıdır. Şair təsvir etdiyi gözələ deyir ki, sənin hüsnünün gözəlliyi Şirinin jəmalına o qədər əsər eləyib ki, Fərhadın ürəyini qırmızı lə'l rəngində qana boyayıb.

48.

Eşqin şərərindən çü salub başinə sevda,
Məcnundu, deyər Leyli biyabandə mütləq.

Məcnun, Leyli – Klassik «Leyli və Məcnun» dastanının qəhrəmanlarıdır.

49.

Rəhbəri-arifdə istedadi-ilham olsa gər,
Şahrəhdə hər biri zərratdur, bir Jəbrəil.

Jəbrayil – Allahın elçisi, Jəbrayil adlı mələkdir. Allahın əmri ilə Məryəmə müqəddəs ruhu bu mələk püfləmişdir.

50.

Qaməti-rəna, səhiqəd, sərvi-dilara sənəm,
Mahtələt, Müştəritinət, Qəmərsima sənəm.

Müştəri – Yupiter səyarəsinin adıdır. Qədim Şərq astrologiyasında səadəti və mülayimliyi himayə edir. Şair təsvir etdyi gözələ Müştəritinət deyə xitab etməklə onun səadət və mülayimliyi himayə edən Müştəri səyyarəsinin zatından, əslindən olduğunu söyləyir.

51.

Bərbətü çəngü sürudü udü sazü nayü ney,
Qəmusi, mütrüb, sənin, mən birlə mizmar istərəm.

Bu beytdə işlənən bərbət, çəng, sürud, ud, saz, nay və ney qədim musiqi çalğı alətlərinin adlarıdır.

52.
O mələkmənzəri kim, Misri-məlahətdə genə,
Təxti-izzətdə bu gün Yusifi-Kən'an eylərəm.

Bax: 13. Bu beytdə kənanlı Yusifin Misirdə padşah olmasına işarə olunur. Şair təsvir etdiyi gözəli izzət taxtında Yusif kimi padşah edəjəyini söyləyir.

53.
Bənzəməz qamətinə sərvi-səhi, qəddi-səmən,
Peykəri-hur ola, ya Tubiyi-firdövsi-bərin.

Tuba – Bax: 41.

54.
Yaxşı saətdə çəkib surətini kilki-əzəl,
Oxşamaz peykərinə şahidi-xur, surəti-Çin.

Çin – İndiki Çin məmləkətidir. Bu yerin nəqqaşları tarixdə öz sənətkarlıqları ilə məşhur olmuşlar. Şair təsvir etdiyi gözələ deyir ki, Allahın qələmi səni elə çəkib ki, Çin nəqqaşlarının çəkdiyi gözəllərin surəti və günəş üzlülər sənin gözəlliyinə tay ola bilməz.

55.
Muyi-ruyin xətini xameyi-təqdir çəküb,
Türrə mişkini bəyazi-rüxə «vəlleyl» nişan.

«Vəlleyl» – Qurandakı surələrdən birinin adıdır. Mənası «gejəyə and olsun ki» deməkdir. Şair gözəlin ağ üzünə tökülən ətirli saçlarını Qur'anda and içilən müqəddəs gejənin qaranlığına bənzətmişdir.

56.
Lövhi-rüxsarə qızıl su ilə təhrir olunub,
«Vəzzüha»nun rəqəmi səfheyi-vəjhində əyan.

«Vəzzüha» - Bax: 20.

57.
Səlsəbili gətürübdür ləbinə lə'li-şəkər,
Abi-Xızrı çü rəvan eyliyüb ol təngdəhan.

Abi-Xızır – Xızırın zülmətdə içdiyi və əbədi ölməzlik qazandığı dirilik suyu nəzərdə tutulur. Şair gözəlin dodaqlarının şirinliyini Xızırın içdiyi dirilik çeşməsinə bənzətmişdir.

58.
Taqi-deyrə baş qoyəydim səjdə ayini içün,
Ərz edəydim mərdümi-çeşmə Məsihasa yüzün.

Məsih – Xristianların inandığı İsa peyğəmbərin ləqəbidir. Şair təsvir etdiyi gözələ demək istəyir ki, Məsihi kimi üzünü göz bəbəyimə göstərəydim.

59.
Bəsani-Qeys hamundə ənisi-vəhşü teyr olmuş,

Qeys – «Leyli və Məcnun» əsərinin qəhrəmanı Məcnun nəzərdə tutulur.

60.
Sual etdim: nədür dövri-rüxündə görsənən mərdüm?
Həbəş jeyşi, – dedi, – kəştilə seyri-bəhr edib hindu.

Bu beytdə şair təsvir etdiyi gözəlin gözlərini dəryaya, göz bəbəklərindən birinin qaralığını dəryada qayıqla dolanan hinduya, birini isə həbəşə bənzətmiş və təşbeh yaratmışdır.

61.
Müzafati-ləbi-lə'li alubdur ləşkəri-hindu,
Dutubdur çeşmeyi-nuşi sipahi-zəngiyi-bədxu.

Şair bu beytdə gözəlin dodaqlarının ətrafina sallanan zərif telləri qaralığına görə hindu və zəncu qoşunlarına bənzətmiş və qüvvətli təşbeh yaratmışdır.
62.
Dutubdur kişvəri-hüsnün sərasər Zəngibar əhli,
Müsəxxər olmuş ol jeyşə ləbi-lə'li-ruxun, hər su.

Şair bu beytdə gözəlin saçlarını onun hüsnünü zəbt edən Zəngibar vadisinin zəncu ordusuna bənzətmiş və bu ordunun gözəlin üzünün hər tərəfini və dodaqlarını tutduğunu bildirməklə qüvvətli təşbeh yaratmışdır.
63.
Xali-ləbinin sirrini təhqiq edə mərdüm,
Mühüm görər nöqtəni Qur'an arasında.

Bu beytdə şairin təsəvvüf görüşləri ifadə olunmuşdur. Təsəvvüf fəlsəfəsinə görə bütün mövcudat Allahın – ilahi nurun zərrəsindən yaranmışdır. Şair təsvir etdiyi gözəlin dodağının xalını zərrəyə (nöqtəyə) bənzədir və bunu Quran içindəki müqəddəs nöqtə (zərrə) kimi qiymətləndirir.
64.
Qılar möhkəm kəmanın, bəs dəyər peykani peykanə.

Bu misranı Salik haşiyədə bu şəkildə də yazmışdır:
Qılar möhkəm kəmanın, səxt elər peykanın peykanə.
65.
Çıxıb cudalə genə türki-məsti-məstanə,
Düzüb sipahi-həbəş ərseyi-gülüstanə.

Bu beytdə şair məjazi məna ifadə etmişdir. Klassik Şərq poeziyasında Rum, türk ifadələri çox zaman məjazi olaraq igidlik, cəngavərlik, ağlıq və gözəllik mənalarında, zəncu, zəngi və həbəş ifadələri isə oğurluq və qaralıq mənalarında işlənmişdir. Şair məşuqənin üzünün ağlığını gözəlliyi ilə məşhur olan məstanə türkə, onun kirpiklərini isə qara olduğu üçün həbəş qoşununa bənzətmiş və bu qoşunun gülüstan meydanına (gözəlin jəmalına) döyüşə çıxdığını söyləməklə qüvvətli təşbeh yaratmışdır.
66.
Nəcadi-zəngidən arəstə qılıb səfü səf,
Çəkübdür Rumə Firəngi-sipəh dəliranə.

Şair bu beytdə gözəlin səf-səf düzülən qara saçlarını zəncuyə və Firəngə (Avropaya) bənzətmiş, zəncu və Firəngin (saçların) Ruma (ağ üzə) qoşun çəkdiyini söyləməklə təşbeh yaratmışdır.
67.
Xitabi-«İnni ənəllah» yetər bu guşi-dilə,
Məgər ki, vadiyi-Əyməndü nəxli-Turi-İlah.

«İnni ənəllah» – Quranın «Taha» və «Əl-Qəsəs» surələrinə, həzrəti-Musanın Allahla görüşünə işarədir. Musa peyğəmbər ailəsi ilə birlikdə Misir tərəfə gedərkən Tur dağı tərəfdə bir od, atəş görmüş və ailəsinin qızınması üçün od gətirməyə getmişdir. Oda yaxınlaşan Musa atəşin bir ağajdan qalxdığını görmüş və huşunu itirmişdir. Ağajdan belə bir səda gəlmişdir: «Ya Musa! Aləmlərin rəbbi olan Allah mənəm!».

Vadiyi-Əymən – Əmniyyətli, xətərsiz yer mənasındadır. Musa peyğəmbər Allahla görüşən zaman Allah bu vadini əmniyyətli yer adlandırmışdır.

Şair bu beytdə həzrəti-Musanın Allahla görüşünə işarə etmişdir.

68.

Çəkibdü dəsti-qəza ya ki, darə Həllacu,
Gəlür sədayi-«Ənəlhəqq» qulağimə gəhü gah.

Həllaj – IX-X əsrlərdə yaşamış, sufi təriqətinin məşhur banilərindən olmuşdur. O, xalq içərisində «Həllaj» (yun darayan) ləqəbi qazanmış, Allahı insanın jəmalında, özündə axtararaq insanı Allah səviyyəsinə qaldırıb «ənəl-həqq» (Mənəm Allah, həqq mənim özümdədir) dediyi üçün hicri tarixinin 309-cu (milad-921) ilində islam ruhaniləri tərəfindən Bağdadda dara çəkilmişdir. Sufi təriqətinə görə bütün mövcudat, o cümlədən insan ilahi nurun zərrəsindən yaranmışdır. Allah insanın jəmalında təjəlli etmişdir. Odur ki, sufilər Allaha şərik çıxır, özlərini Allah – insan adlandırıb «ənəl-həqq» deyirdilər. Şair bu təriqət yolunda dara çəkilən Mənsur Həllaja işarə etmişdir.

69.

Gəz Əraq ilə Sifahan, Nişabur, Hijaz,
Suyi-Azərbaycanə elə pərvaz genə.

Bu beytdə işlənən Əraq (İraq), Sifahan (İsfahan), Nişabur (Xorasanda) və Hijaz (Səudiyyə Ərəbistanında) ölkə və şəhər adlarıdır.

70.

Dirəxti-vadiyi-Əymən salubdur canə şərər
Ki, fərzdür dilü cani yetirmək ol narə.

Dirəxti-vadiyi-Əymən – Əymən vadisinin ağacı. Musa peyğəmbərin Tur dağında gördüyü yanar ağaja işarədir. Bax: 67.

71.

Bu kuyi-eşqdə Musa kimi müjərrəd olub,
Şərarə jəm eyləmək məxzəni-dili-zarə.

Musa – Musa Kəlimullah peyğəmbərə işarədir. Həzrəti-Musa Tur dağında dəhşətli işıq və atəş görüb üç gün özündən getmişdir. Şair bu beytdə Musaya və onun Tur dağında Allahla görüşdüyü zaman gördüyü müqəddəs oda, atəşə işarə etmişdir.

72.

Taqi-əbruyinə etdikdə nəzər mərdümi-çeşm,
Tərk edib yeksərə tovfi-hərəmi-Beytullah.

Beytullah – Allahın evi, Kəbə deməkdir. Şair təsvir etdiyi gözələ deyir ki, sənin qaşlarının tağına nəzər salanlar Allahın müqəddəs evinin (Kəbənin) təvafını (Yeddi dəfə dolanıb ziyarət etmək) tərk edərlər.

73.

Məhrəmi-razi-hərimi-hərəmi- «Əv ədna»,
Hamili-çar kütub, ya əbərani, ərəbi.

«Əv ədna» – Məhəmməd (s) peyğəmbərin meracına işarədir. Meraj zamanı peyğəmbər (s) Allaha o qədər yaxın olur ki, bu yaxınlıq kamanın (yayın) qövs şəklində olan iki tərəfinin qədəri və ya ondan yaxın məsafə qədərincə olur ki, buna «Əv ədna» deyilir.

74.

Şərəfi-rütbət ilə sidrə məqaminə yetən,
Mədəni-fəzlü hünər, rahi-həqiqət tələbi.

Bu beytdə sufilərin sidrə məqamına yetməsinə işarə olunur. Sidrə göyün, ərşin sağ tərəfində olan ağajdır. Göyün 7-cu qatındadır. Şair tanrı yolunu gedib bu mərtəbəyə yüksələnləri hünər və fəzilət sahibi, haqq yolunun yolçüsu adlandırır.

75.
O xali- dürri-ləbin həsrəti mühacur edüb,
Həbəşnəcadi bilüb, bənzədüb Bilalə məni.

Bilal Həbəşi – Məhəmməd (s) peyğəmbərin zamanında məşhur əzan deyən, müəzzin olmuşdur.

76.
Çü bürcu-Əqrəbi mənzil qılub bu gün Qəmərə,
Rəvadu gər duta dil türreyi-şikən dami.

Əqrəb – Bax: 23.

77.
Çıqə gər Əqrəbdən mahi-ənvəri-ariz,
Qərari-dil alu yeksər rüxi-güləndami.

Əqrəb – Bax: 23. Şair gözəlin üzünü işıqlı Aya bənzətməklə demək istəmişdir ki, əgər Ay (gözəl) Əqrəb bürcündən çıxsa, güləndam üzü qəlbimin qərarın alajaq.

78.
Tələtün nəqşini görgəc kilki-Mani künd olub,
Şərmi-dildən gör midadun yeksərə qan eylədi.

Mani – 216-217-cu illər arasında yaşamış dini təriqət başçısıdır. Öz adı ilə əlaqədar yaratdığı dini təriqəti «Manilik» adlandırmışdır. O, bu təriqəti atəşpərəstliklə xristianlığın vəhdətindən yaratmışdı. Atəşpərəstlik dinini saxtalaşdırdığı üçün Zərdüşt ruhaniləri Maninin diri-diri dərisini soymuşlar. Rəvayətə görə Mani həmçinin mahir nəqqaş, rəssam və təbib də olmuşdur. Şair təsvir etdiyi gözələ deyir ki, sənin gözəlliyinin nəqşini görən kimi Maninin qələmi bu gözəllik qarşısında kortalıb.

79.
Görmiyüb dəhr gözü qaniçicu bir belə türk,
Qoymuri hiç kəmanın yerə, məstan gəlüri.

Türk – İgidlik, cəngavərlik və gözəllik mənasındadır. Bax: 65.

80.
Şayəstədür, bu peykərə sərvi-Ədən desəm,
Görmüb jəhan gözü cü belə sərvi-qaməti.

Ədən – Həmişəlik yer deməkdir. Sərvi-Ədəni – Behiştdə olan sərv ağacı mənasındadır.

81.
Peykəri-bütmehrdin xatir füruz itkan kişi,
Şeyx Sənantək rəhi-rəsmi-müsəlmandin keçər.

Şeyx Sən'an – Gürcü gözəli Xumara aşiq olub, öz eşqi yolunda dinindən dönən Şeyx Sənan nəzərdə tutulur. Klassik poeziyada sədaqət və vəfa rəmzi kimi təsvir olunur.

82.
Xatiri-Məhmudə dam olmuş şikəni-zülfi-Əyaz,
Oldürür eşq rüxündə jahü sultandin keçər.

Mahmud – Qəznəvilər sülaləsinin ən məşhur hökmdarlarından olan Sultan Mahmud Qəznəvi (998-1030) nəzərdə tutulur.

Əyaz – Sultan Mahmud Qəznəvinin sadiq qulu olmuşdur. O, Sultan Mahmudun sədaqətli qulu olduğu üçün hökmdarın böyük hörmətini qazanmışdır. Sultan Mahmudun bu sədaqətli və ağıllı qula olan istək və hörməti bütün Şərq ölkələrinə yayılmış, hətta bu haqda «Mahmud və Ayaz» adlı ayrıja dastan da yaradılmışdır.

Rəvayətə görə Sultan Mahmud öz qulu Ayazın saçlarının qırxılıb düzəldilməsi haqqında göstəriş vermiş, lakin Ayazın saçları qırxıldıqdan sonra Sultan Mahmud öz qulunun əvvəlki gözəlliyini görməyib çox məyus olmuş və qəmə batmışdır. Saray şairlərindən biri Sultan Mahmudun qəmini dağıtmaq üçün ona təskinlik vermiş və demişdir ki, qəm eləmə, Ayazın saçları onu gözəlləşdirmək üçün qırxılıb, Ayaz əvvəlkindən də gözəl olajaq. Şair «Xatiri-Məhmudə dam olmuş şikəni-zülfi-Əyaz» misrasında bu əhvalata işarə etmişdir.

83.

Fəzayi-məhşərə girsam sənün eşqində «hu» eylab,
Görə bilmən qiyamətdə bənqa bir dadxa barmu?

Hu – Dərvişlər toplaşıb məclisdə «hu», «ya hu», yəni ey o, ey o kəs deyərdilər. Şair Allaha xitabən demək istəyir ki, sənin eşqində «hu» desəm, qiyamətdə mənim dadıma yetən olarmı?

84.

Hekayət yoqdu Əzradən, keçübdür qisseyi-Vamiq,
Məninqdək eşq rahində dəxi bir binəva barmu?

Əzra, Vamiq – Bax: 31.

85.

Neta, bilmən hüzurində rüxümdək rusiya barmu?

Neta – cığatayja: nə edim deməkdir.

86.

Jür'əxari kimdü, Təsnimi-cunandin keçmədi?

Təsnim – Bax: 42.

87.

Ol ki, sübh uyqusidin çeşmi-dili bidar iməs.

Uyqusidin – yuxusundan deməkdir.

88.

Ol kişi kim, dustdari-Əhmədi-Muxtar iməs.

Əhmədii-Muxtar – Məhəmməd (s) peyğəmbərin ləqəbidir.

89.

Yeydürür kim, xublərdən türfə cananim məninq.

Yeydürür – Daha yaxşıdır deməkdir.

90.

Qanı İsgəndəri-dövran, qanı Turani- şəhi-tırkan?
Qamusi jahidin keçmiş, əgər ibrət nəzər qılsən.

İsgəndər – Tarixdə məşhur olan Makedoniyalı İsgəndər nəzərdə tutulur.

91.

Yetür məşamə şəmmi-türreyi-ənbərsara,

Nedüm, qəzali-Xütən didədən nihandur.

Qəzali- Xütən – Xütən ahusu. Bax: 11.
92.
Qılub məşami müəttər nəvidi-nafeyi-Çin,
Məgər səba güzər eylübdü vadiyi-Xütənə.

Çin, Xütən – Bax: 11.
93.
Qıl bir güzər Ərməninzəminə,

Ərməninzəmin – Azərbaycanın İrəvan mahalı nəzərdə tutulur.
94.
Arturər xərcuni sərkarin əgər adət ola,
Meyli-tənbakuyi-Şiraz ilə Kaşan gətürər.
Şiraz, Kaşan – Şəhər adlarıdır.
95.
Mürdə tən çulqəməqə sövbi-Əmirkan gətürər.

Əmirkan – Amerika deməkdir.
96.
Dəmi-İsa kibi ki, mürdə dili zində qılar.

İsa–Xristianların etiqad etdikləri İsa peyğəmbər nəzərdə tutulur. Dini rəvayətə görə İsanın nəfəsi ölüyə dəysəydi ölü dirilərmiş. Şair buna işarə edir.
97.
Göndərər fikri gəhi Tiblisə, gəh Səlmasə.

Tiblis – Gürcüstanın paytaxtı Tiflis.
Səlmas – Jənubi Azərbaycanda şəhərdir.

98.
Gəh xəyali çəkər Urumiyü Kürdüstanə.

Bu misrada şair tütün əldə etmək üçün xəyalın Jənubi Azərbaycan şəhəri Urmiyaya və Kürdüstana getdiyini söyləyir.
99.
Şahidi-Misr çıqar pirəhəni-sündüsdən
Kim, nişati-könülə türfəjə canan gətürər.

Şahidi-Misr – Misirin gözəli deməkdir. «Yusif və Züleyxa» dastanının qəhrəmanı Yusif nəzərdə tutulur. Şair süfrədə içilən çayın gözəlliyini Yusifin gözəlliyinə bənzətmişdir.
100.
Çoq müzəvvirdü Xəta çayi, xətakardürür,

Xəta – Müasir joğrafi ərazidə yerləşən Kitay, Çin ölkəsidir. Şair Xəta (Çin) məmləkətindən gələn süfrə çayını məzəmmət edir.
101.
Nə ədavətdür ki, qılmış Bülbəşərlə Əhrimən,

Firqeyi-nəsnas ilə kini-bəniadəm nədür?

Bülbəşər – Bəşərin atası deməkdir. Bəşəriyyətin ilk insanı Adəm peyğəmbər nəzərdə tutulur.

Əhrimən – Şər qüvvənin allahı Əhrimən (Anqramanyu) nəzərdə tutulur. Zərdüştilik dininə gbrə dünya iki qüvvə tərəfindən idarə olunur. Xeyir qüvvələri Ahuraməzda (Hürmüz), şər qüvvələri isə Əhrimən himayə edir. Mifoloci təsəvvürə görə Hürmüz və Əhrimən əkiz qardaşdırlar. Onlar tale tanrısı Zurvanın övladlarıdır. Zurvan işıqlı dünyanın, yer üzünün hökmranlığını Hürmüzə, yeraltı qaranlıqlar dünyasının hökmranlığını isə Əhrimənə vermişdir. Bundan qəzəblənən Əhrimən qardaşı Hürmüzə və onun yaratdığı insanlara düşmən olmuş və şər qüvvələr (divlər, əcdahalar) yaradıb ölümə, şərə rəhbərlik etmişdir. Şair bu beytdə bəşəriyyətin ilk insanı olan Adəmlə (Bülbəşərlə) Əhrimənin düşmənçiliyinə işarə etmişdir.

102.
Puri-İmran rəhbəri-rahi-yəqin olmuşdürür,
«Jibtü Tağutü Vəsən» ayini bəs fərhəm nədür?

Puri-İmran – İmranın oğlu, yəni həzrəti-Musa deməkdir.

«Jibtü Tağutü-Vəsən» – Qur'anın 4-cü «Ən-nisa» surəsinin 51-cu ayəsinə işarədir. Jibt, Tağut və Vəsən yəhudilərin sitayiş etdikləri büt adlarıdır. Bu ayədə Allah Məhəmməd (s) peyğəmbərə xitabən deyir ki, yəhudilər Jibt adlı bütə və Tağut adlı şeytana inanırlar. Şair demək istəyir ki, həzrəti-Musa Allah yolunun rəhbəri olduğu halda, Jibt, Tağut və Vəsənə inanmaq olmaz.

103.
Vər zülali-lə'li-şəkkərdür nişatəfzayi-dil,
Kövsərü Təsnimi-şəhdbiz, şəkkər tə'm nədür?

Kövsər, Təsnim – Bax: 42.

104.
Kim, qələtməşhurdur: Mülki-Süleymandur cahan,
Məsnədi-izzətlə təmkini-Bəni-Ədhəm nədür?

Süleyman– Qədim Qüds (Yerusəlim) şəhərinin hökmdarı, Davud peyğəmbərin oğludur. Eradan əvvəl 1016-jı ildə hakimiyyət başına gəlmiş, peyğəmbərlik etmişdir.

Bəni-Ədhəm – Hicri tarixinin 2-cu əsrində Bəlx şəhərində hökmdarlıq edən İbrahimi-Ədhəmə işarədir. Mənası Ədhəm oğlu İbrahim deməkdir. Rəvayətə görə İbrahim ova çıxıb ahu ovlarkən ahu dilə gəlib ona demişdir: «Allah səni yaradıb ki, ova çıxıb, bizi ovlayasan? Başqa bir işin yoxmu?» Ahunun bu sözündən sonra İbrahim öz əməlindən peşman olmuş və şahlıq libasını çıxarıb çöldəki çobana vermiş, özü isə şahlığı tərk edib sufilərə qoşulmuş və dövrünün ən böyük sufilərindən olmuşdur. Şair bu beytdə İbrahimin mənəvi sufi səltənətini Süleyman peyğəmbərin səltənətinə qarşı qoymuş və ondan üstün tutmuşdur.

105.
Div bəndi-hirzi-əngüşti-Süleyman oldu vər,
Əhrimən əngüşti ilə culveyi-xatəm nədür?

Bu beytdə şair Süleyman peyğəmbərlə Əhrimən arasındakı düşmənçiliyə işarə etmişdir. Rəvayətə görə Süleyman peyğəmbərin barmağında üzərində «Allah» kəlamı həkk olunmuş sehirli bir üzüyü var imiş. Süleyman həmin üzüyün sehri ilə heyvanlara, hətta şər qüvvələrin allahı Əhrimənin köməkçiləri olan divlərə belə hökm edərmiş. Divlər bu üzüyü oğurlamış, sonra Süleyman öz vəzirinin köməyilə yenidən üzüyü öz əlinə keçirmişdir.

106.
Jami-Cəmşidi-jəhanbin müştəhərdür qərnü sal,
Bilməzəm Cəmşid kimdür, bəs bu jami-Jəm nədür?

Cəmşid, jami-Jəm – Eradan əvvəl yaşamış əfsanəvi İran şahlarındandır. Jəm onun qıssaldılmış adıdır. Əfsanəyə görə Cəmşidin dünyanı əks etdirən sehirli jamı var imiş ki, o, bu jama baxıb dünyadan xəbər tutarmış. Şair bu beytdə Cəmşidə və onun sehirli jamına işarə etmişdir.

107.

Səbti-dəftər eyləmiş Kəsra adın ədlilə dəhr,
Qutəvər olduğdə bəhri-rizişə, Hatəm nədür?

Kəsra – Sasanilər sülaləsinin hökmdarı Ənuşirəvan padşaha işarədir. Farslar Ənuşirəvanı tarixdə ədalətli göstərmək üçün onun haqqında belə bir rəvayət düzəltmişlər ki, guya Ənuşirəvan o qədər ədalətli olmuşdur ki, şahlığın qapısından zəncur asıb şikayətə gələnləri qəbul edərmiş. Bu zəncurə «Ədalət zəncuri» deyərmişlər. Zəncuri tərpədənlər Ənuşirəvanın hüzuruna gəlib ədalətlə yola salınarmışlar. Ənuşirəvanın ədalətli olmasını əbədiləşdirmək üçün belə bir rəvayət də yaradılmışdır: Guya bir eşşək öz sahibinin onu çox işlədib isgəncə verməsindən bezmiş və Ənuşirəvanın sarayına gəlib onun ədalət zəncurini tərpətmiş və öz sahibindən şaha şikayət etmişdir. Ənuşirəvan isə eşşəyin sahibini cəzalandırmışdır.

Lakin Ənuşirəvanın zülmkarlığını bilənlər bu rəvayəti belə mənalandırmışlar ki, Ənuşirəvanın ədalətinə inananlar yalnız eşşəklər olar. Çünki tarixdən məlumdur ki, Ənuşirəvan Məzdəkiləri məhv etmək üçün yer qazdırmış və 12 min məzdəkini başları aşağı torpağa basdırıb ayaqlarını eşdə saxlamış və böyük peyğəmbər olan Məzdəki çağırıb bu səhnəni ona göstərmiş və bağ saldığını söyləmişdir. Buna görə də şair bu beytdə səxavətli Hatəmi Ənuşirəvana qarşı qoymuşdur.

Hatəm – Tarixdə öz səxavəti ilə şöhrət qazanmış dövlətli şəxsdir. Tayi (Tey) qəbiləsindən olduğu üçün Hatəmi-Tey adı ilə tanınmışdır. Klassik Şərq poeziyasında səxavət və ədalət rəmzi kimi təsvir olunur.

108.

Babi-tovhidliyədür rükni-Yəmani, bilməzəm
Kəsrəti-əhli-hərəmlə olduğu xürrəm nədir?

Babi-tovhid – Tovhid qapısı deməkdir. Allahın həqiqi vahidliyinə inanmaq mənasındadır. Şair demək istəyir ki, əgər tovhidin qapısı əsaslı inamdırsa, bir belə hərəm əhli ilə olan şadlıq nədir?

109.

Rahi-təjridə qədəm qoymuşdürür tərsa beçə,
Nisbəti-ruhü əbü ibni-bini-Məryəm nədür?

Bu beytdə xristianlıq dini ilə bağlı anlayışlara işarə olunmuşdur. Bax: 17.

110.

Nə üzari-mahvəşdür ki, qılub zəmini rövşən,
Hamı göz olubdu mail, nə əzizi-Misryandur.

Əzizi-Misryan – Misirlilərin əzizi deməkdir. «Yusif və Züleyxa» dastanının qəhrəmanı Yusifin gözəlliyinə işarədir.

111.

Səltənət təxtini zivər qılalı Asəfi-dəhr,
Hişməti bərhəm olan mülki-Süleymani olub.

Asəf – Süleyman peyğəmbərin vəziri olmuşdur.

112.

Hübbi-Əliyü ali-Əlidür şüari-dil,
Bu fəxr bəsdü xatirə lütfi-vəhabdən.

Ali-Əli – IV Xəlifə imam Əli əleyhissəlamın ailə üzvləri deməkdir, 11 imama işarədir. Şair deyir ki, Əli (ə)-a və övladlarına məhəbbət dilimizin şüarıdır.

113.

Gər həddən ziyadə olub cürm, naseha,

Azadəlik bəratı var «Ümmülkitab»dən.

Ümmülkitab – Üm – ana, kitab isə Quran deməkdir. Quranın «Əl-Fatihə» surəsinə işarədir.

114.
Gərçi vidadi-Heydəri-Kərrarı dutmuşam,
Qəm çəkmənəm hərarəti-ruzi-hesabdən.

Heydəri-Kərrar – Həzrət Əli (ə)- ın ləqəbidir.
115.
Təhti-livayi-Əhmədi-mürsəldü məskənim,
Yoxdu həras dildə təbi-afitabdən.

Əhmədi-mürsəl – Həzrəti Məhəmmədin (s) ləqəbidir.
116.
Vər xatirində olmiyə hübbi-Əliyyü al,
Layiq bəha verülməz əməl iktisabdən.

Hübbi-Əliyyü al – Əli (ə) və Əli (ə) övladının sevgisi deməkdir.
117.
Davərdü bəs ki, ruzi-cəza şahi-«La fəta»,
Yoq dadgər siva şəhi-vala jənabdən.

Şahi-«La fəta» – Həzrət Əli (ə)-ın «Xəndək» döyüşündə qəhrəmanlığına işarədir. Bu döyüşdə Allahdan səda gəlmişdir ki, «La Fəta illa Əli, La seyf illa Zülfüqar». Yəni Əlidən başqa javan, Zülfüqardan başqa qılınj yoxdur. Şair beytdə Allahın bu kəlamına işarə etmişdir.

118.
Şiri-Xuda, vəsiyyi-nəbi, miri-«Həl əta»,
Mərhəb biçən, o Xeybər açan fəthi-babdən.

Şiri-Xuda – Allahın şiri (Əsədullah) deməkdir, həzrət Əli (ə)-ın ləqəblərindəndir.

«Həl əta» – Quranın «Dəhr və ya İnsan» surəsinin 7, 8, 9-cu ayələrinə işarədir. Dini mənbələrdə deyilir ki, həzrət Əli (ə)-ın övladlarından Həsən və Hüseyn xəstələnmiş, Məhəmməd peyğəmbər (s) onların sağalması üçün nəzir vermələrini məsləhət görmüşdür. Bu məsləhətdən sonra üç gün oruj tutma nəziri deyilir. Sonra Əli (ə) bir yəhudidən üç kasa buğda borj alıb evə gətirir və iftar açmaq üçün üç çörək bişirirlər. Birincu günün iftar vaxtı bir yoxsul qapını döyüb çörək istəyir, həzrət Əli (ə) çörəyi yoxsula verib iftarını su ilə açır. İkincu günün iftarı zamanı bir yetim qapıya gəlib çörək istəyir, həzrət Əli (ə) ikincu çörəyi də yetimə verib iftarını su ilə açır. Üçüncü gün isə Əli (ə) çörəyini bir əsirə verib aj qalır və bu əhvalatı Məhəmməd (s) peyğəmbərə danışır. Bu zaman Allahdan «Həl əta» surəsi gəlir ki, bu da «Dəhr və ya İnsan» surəsinin 5-cudən 22-cuyə qədər olan hissəsidir.

Mərhəb – Yəhudilərin qəhrəmanıdır. Xeybər döyüşündə həzrət Əli (ə) tərəfindən öldürülmüşdür.

Xeybər – Yəhudilərin qalasıdır. Bu qala həzrət Əli (ə) tərəfindən alınıb, Mərhəb də bu döüşdə öldürülüb. Şair bu beytdə həzrət Əli (ə)-ın qəhrəmanlığına işarə etmişdir.
119.
Əmr öldürən, o taqi-hərəmdən büt endirən,
Dini-həqqi hərasət edən inqilabdən.

Əmr – Kafirlərin qəhrəmanı Əmr ibni-Əbdəvidə işarədir. Xəndək döyüşündə həzrət Əli (ə) tərəfindən öldürülmüşdür.

120.
Zərratə yetdi seyheyi-«Laseyfü lafəta»,
Xəndəq güni pəyami-qüdslə xitabdən.

«Laseyfü la fəta» – Bax: 117.

Xəndəq – Həzrət Əli (ə)-ın Xəndək döyüşü nəzərdə tutulur

121.
Bu mədhi bəs buyurdu Nəbi: «zərbəti-Əli
Əfzəldü taəti-səqəleynü səvabdən».

Şair bu beytdə Məhəmməd (s) peyğəmbərin həzrət Əli (ə) haqqında dediyi bu kəlamına işarə etmişdir: «Əlinin qılınjının zərbəsinin savabı insanların və cunlərin ibadətindən üstündür».

122.
Şənində nazil ayeyi-«Bəlliğ»dür Əhmədə,
Təbliğ qıl, al əhdi-vilayət səhabdən.

«Bəlliğ» – Quranın «Bəlliğ» ayəsinə işarədir. Bu ayədə Allah Məhəmməd (s) peyğəmbərin islamı təbliğə başlamasına ijazə vermişdir.

Əhməd – Məhəmməd (s) peyğəmbərin ləqəbidir.

123.
Əhli-Ğədir tövənü kürhən qılub qəbul,
Bə'd əz rəsul münkir o qövmi-ğürabdən.

Ğədir – Məhəmməd (s) peyğəmbərin Məkkədən qayıdandan sonra həzrət Əli (ə)-mı öz yerinə canişin təyin etdiyi yerin adıdır.

124.
Məzmuni-«İnnəma»ni sanub səhl küfrkiş,
Sərdəftəri-zəlali-şəqavət nisabdən.

«İnnəma» – Quranın «Dəhr və ya İnsan» surəsinin 9-cu ayəsinə, həzrət Əli (ə)-ın ajları yedizdirməsinə işarədir.

125.
Qıl etişam «Həbli-mətin»ə bu nəş'ə sən,
Ol nəş'ə faruğ et könülü piçü tabdən.

«Həbli-mətin» – Quran ayəsi nəzərdə tutulur. Allahın «Möhkəm ipdən (Qurandan) yapışın» kəlamına işarə olunur.

126.
Məzmunun anla «Ləhmukə ləhmi» hədisinün,
Qürbi-rəsuli bil bu müsəddiq jəvabdən.

«Ləhmukə ləhmi» – Məhəmməd (s) peyğəmbərin hədislərindəndir. Onun həzrət Əli (ə)-ma dediyi «Sənin ətin mənim ətimdəndir» kəlamına işarə olunur.

127.
«Nəssi-sərih»i - «əntə və minn»i-peyəmbəri
Təfhim qıl, xilasi-dil et irtiyabdən.

«Əntə və minn» – Məhəmməd (s) peyğəmbərin hədislərindəndir. Onun həzrət Əli (ə)-ma dediyi «»Sənnən mən bir nurdan xəlq olunmuşuq» kəlamına işarə olunur.

128.

Gər bilməsən vəsiyyi-bilafəsl Heydəri,
Xatir jəm etmə madəri-biijtinabdən.

Heydər – Həzrət Əli (ə)-ın ləqəblərindəndir.

129.

Tərəfi-meymənədə jeyşi-Sekəndər yeriyür,
Meysərə canibə Dara ilə Sasan gələjək.

Dara, Sasan – Dara qədim İran padşahı, Sasan isə rəvayətə görə Daranın oğludur. Şair İsgəndərlə Daranın döyüşünə işarə etmişdir.

130.

Rayəti-nüsrət əlində gəlüri Giv ilə Tus,
Ərseyi-rəzmə, neşün, Rüstəmi-Dəstan gələjək.

Giv – Firdovsinin «Şahnamə» əsərinin qəhrəmanlarındandır, yeddi pəhləvanlardan biridir. O, Turan hökmdarı Əfrasiyabın qız nəvəsi Keyxosrovu Turandan qaçırıb İrana gətirmiş və orada padşah etmişdir. Bundan sonra Əfrasiyab Keyxosrovun atasını öldürdüyü üçün Keyxosrov da Əfrasiyabı öldürmüşdür. Keyxosrov öz istəyi ilə şahlıqdan əl çəkib yeddi pəhləvanla birlikdə dağa çəkilmiş, Giv də yeddi pəhləvan və Keyxosrovla birlikdə dağda qar altında qalıb ölmüşdür.

Tus – Firdovsinin «Şahnamə» əsərinin qəhrəmanlarındandır. İran – Turan döyüşündə İran qoşununun ali baş komandanı (sərkərdəsi) olmuşdur.

Rustəmi-Dəstan – Bax: 36.

131.

Sistanə çü olub azim Turan – şəhi-türk,
Canibi-rəzmgəhə Zali-Nəriman gələjək.

Sistan – Bax: 36.

Zali-Nəriman – Firdovsinin «Şahnamə» əsərinin qəhrəmanlarındandır.

132.

Dəstbürd urmuşdu səfheyi-İranə çü Rum,
İntiqam almaqə ol Nadiri-dövran gələjək.

Rum – Osmanlı türklərinin vətənidir. İranlılar türklərin yaşadıqları əraziləri Rum adlandırmışlar.

Nadir – İran şahı Nadir şah Əfşar nəzərdə tutulur.

133.

Nəbəvi şər' səfahatını dutmuşdu yəvmut,
Bəhri-tədib, müəyyəd olan oğlan gələjək.

Nəbəvi şər' – Nəbi, peyğəmbər şəriəti deməkdir.

134.

Jovri-əşrar ilə viranə idi xitteyi-fars,
Əzmi-təmirlə ol şəhrə Kərim xan gələjək.

Kərim xan – Lorların Zənd tayfasından olan və İranda Nadir şahdan sonra hakimiyyətə gələn Kərim xan Zənd nəzərdə tutulur.

135.

Şovqi-İstəxr başə salmışdı çün şəhi-türk,
Bu səbəb qətlinə Keyxosrovi-sultan gələjək.

İştəxr – İranın qədim paytaxtı olmuşdur. Bu günkü Şiraz şəhəridir. Birincu misrada işlənən şəhi-türk ifadəsi Turan şahı Əfrasiyaba işarədir.

Keyxosrov – İran şahlarından olmuş, özünün ana babası Əfrasiyabı öldürmüşdür. Şair Firdovsinin «Şahnamə» əsərindəki əhvalata işarə edir.

136.
İddiayi-qələt etmişdi çü Şəddadi-şəqi,
Pozməgə dəstgəhin qüdrəti-Yəzdan gələjək.

Şəddad – Bir rəvayətə görə Hud peyğəmbərin, başqa bir rəvayətə görə isə Davud peyğəmbərin zamanında yaşamış zülmkar hökmdar olmuşdur. Adın oğlanlarındandır.

137.
Əzm edibdür genə Nəmrud Xəlil atəşinə,
Bilmiyübdür o şəhə nar cülüstan gələjək.

Nəmrud – Qədim Babildə Nibtilərin hökmdarı olmuşdur. Allahlıq iddiasında olub cənnəti yaratmaq istəmişdir.

Xəlil – Azər peyğəmbərin oğlu İbrahim Xəlilullah peyğəmbər nəzərdə tutulur. O, bütləri sındırıb insanları vahid Allaha inanmağa çağırdığı üçün Nəmrud qəzəblənib onu odda yandırmaq istəmiş, lakin Allah odu gülkarlığa çevirib Xəlilullahı yanmaqdan azad etmişdir. Şair bu əhvalata işarə edir.

138.
Bəs ki, Firon ilə Haman olub tağiyi-din,
Qərqi-Nil eyləməqə Musiyi-İmran gələjək.

Firon, Haman – Musa peyğəmbərin zamanında yaşayan əzazil hökmdarlar olmuşlar. Dini rəvayətə görə Fironun sarayında yaşayan münəjcumlər fala baxıb Firona bildirmişlər ki, bəni-İsraildə bir oğlan uşağı doğulajaq və səni öldürüb taxtına sahib olajaqdır. Buna inanan Firon bəni-İsrailin bütün doğulan oğlan uşaqlarının ölümünə fərman vermişdir. Musa peyğəmbəri isə anası gizli yerdə doğmuş və onu Fironun cəzasından qurtarmaq üçün qapalı sandığa qoyub Nil çayına axıtmışdır. Firon isə əzazil əməllərinə görə çaya atılıb öldürülmüşdür. Şair bu əhvalata işarə etmişdir.

Haman – Fironun vəziri olmuşdur.

Musiyi-İmran – İmran oğlu Musa deməkdir.

139.
Rübi-məskuni müsəxxər çü qılub küfri-sipəh,
Ol firəq qətlinə puri-Şəhi-Mərdan gələjək.

Puri-Şəhi-Mərdan – Həzrət Əli (ə)-in məjazi şəkildə oğlu deməkdir. Həzrət Əli (ə)-dan törəyən 12-cu imam Mehdi Axirəzzəmana işarədir.

140.
Həft iqlimi çü zəbt etmiş idi jeyşi-inad,
Əzmi-təsxir ilə Salari-əmiran gələjək.

Salari-əmiran – Əmirlərin əmiri deməkdir. 12-cu imam həzrəti Mehdi nəzərdə tutulur.

141.
Şər' namusinə əl urmuş idi dəsti-xilaf,
O xətakarə müəddib yədi-Mənnan gələjək.

Mənnan – Allahın adlarından biridir, mənası ruzi verən, yaxşılıq edən deməkdir.

Yədi-Mənnan – Yaxşılıq edən əl mənasındadır, 12-cu imam həzrəti Mehdiyə işarədir.

142.

Kişi-islam görülmürdü dəxi millət ara,
Din tərvicu içün natiqi-Qur'an gələjək.

Bu beytdə şair dini tarixdə məşhur olan Səffin davasına işarə edilmişdir. Bu döyüşdə Müaviyə həzrət Əli (ə)-ma məğlub olajağını görüb əmr verir ki, Quranları nizəyə vursunlar və desinlər ki, qoy bu Quran bizim aramızda hökm eləsin. Lakin həzrət Əli (ə) Müaviyənin bu hiyləsini başa düşüb qoşuna əmr verir ki, düşmən nizələrinə taxılmış Quranları vurub yerə salsınlar. Həzrət Əli (ə)-dan bunun səbəbini soruşduqda o, belə javab verir ki, onlar danışmayan Quranlardır, nitqləri yoxdur. Natiqi-Quran mənəm. Şair «Natiqi-Quran» ifadəsi ilə bu əhvalata işarə etmiş və imam Mehdini dinə rəvaj verən «Natiqi-Quran» adlandırmışdır.

143.

Bey'ət eylüb o şəhə Ruhi-Qüdüs, cümlə səma,
Jəm olub başə məlaik, hamı yeksan gələjək.

Ruhi-qüdüs – Müqəddəs və pak ruh deməkdir. Allahın elçisi baş mələk Jəbrayilə işarədir.

144.

Əhrimən burnu gərək sürtülə torpağə bu gün,
Div təsxirinə Asəflə Süleyman gələjək.

Bu beytdə şair Süleyman padşahın və onun vəziri Asəfin şər qüvvələrin Allahı Əhrimənə düşmən olmasına işarə etmişdir. Bax: 105.

145.

Sipəri-kin dutubdur hamı afaq yüzün,
Jündi-əşrarə bu gün Nuh ilə tufan gələjək.

Bu beytdə tarixdə məşhur olan Nuh peyğəmbər və onun zamanında baş verən dünya tufanına işarə olunur. Rəvayətə görə dünyanı bu tufanda su almış, Nuh peyğəmbər isə Allahın əmri ilə böyük bir gəmi düzəldib öz qövmünü ölümdən xilas etmişdir. Şair bu əhvalata işarə edir.

146.

Yusifi-Misri salub sijnə çü zənn ilə Əziz,
Səltənət təxtinə bilmüb Məhi-Kən'an gələjək.

Yusifi-Misr – Misirin Yusifi deməkdir.

Əziz – Yusifi zindana salan Misir hökmdarı nəzərdə tutulur.

Məhi-Kənan – Kənanın ayı, yəni Yusif. Şair bu beytdə «Yusif və Züleyxa» dastanının qəhrəmanlarına işarə etmişdir. Bax: 1 və 13.

147.

Ələ ayineyi-İsgəndər alub, zeyb qılub,
Zivəri-qamət ilə sərvi-xuraman gələjək.

Ayineyi-İsgəndəri – Tarixdə məşhur olan Makedoniyalı İsgəndərin aynasına işarədir. Rəvayətə görə İsgəndərin sarayında yaşayan alimlərdən Ərəstü bir güzgü ixtira etmişdi. Həmin güzgünü İsgəndəriyyə şəhərində ən uja bir qalada yerləşdirib onun vasitəsilə uzaq məsafədən gələn düşmən ordusunu görərmişlər. Bu güzgüyə «Ayineyi-İsgəndəri» (İsgəndərin güzgüsü) deyərmişlər.

148.

Jami-Cəmşidi dutubdur genə ol saqiyi-dəhr.

Jami-Cəmşid – Cəmşidin camı deməkdir. Bax: 107.

149.

Şuri-Şirini salub başinə Fərhadsifət,

